AZƏRBAYCAN RESPUBLİKASININ PREZİDENTİ YANINDA
ALİ ATTESTASİYA KOMİSSİYASI

https://doi.org/10.69682/arti.2024.91.3

https://zenodo.org/record/7714846#.ZCqgSnZBzIV — Zenodo
https://archive.org/details/20230309_20230309_1112 — Internet Archieve
https://journals.indexcopernicus.com/search/details?id=122986 — Index Copernicus
https://journalseeker.researchbib.com/view/issn/2409-8817 — Researchbib
https://www.slideshare.net/Humeyir/scientific-works-257022296?from_search=0 — SlideShare
https://www.calameo.com/books/0073359955276c2cd4d80 — Calameo
https://isindexing.com/isi/viewjournal.php — International Scientific Indexing
http://olddrji.lbp.world/Search.aspx?J=Scientific%20Works&S=0 — Directory of Research Journals Indexing

**ISSN 2409-8817**

**AZƏRBAYCAN RESPUBLİKASININ ELM VƏ TƏHSİL NAZİRLİYİ**
**AZƏRBAYCAN RESPUBLİKASININ TƏHSİL İNSTİTUTU**

# *ELMİ ƏSƏRLƏR*

**cild 91, № 3, 2024**

# *НАУЧНЫЕ ТРУДЫ*

**том 91, № 3, 2024**

# *SCIENTIFIC WORKS*

**volume 91, № 3, 2024**

**“Elmi əsərlər” 1934-cü ildən çıxır**
**İldə 6 nömrə nəşr olunur**
**Redaksiyanın ünvanı**:
Bakı şəhəri, Zərifə Əliyeva küçəsi, 96
Tel: 493-96-21, 493-30-06

*Azərbaycan Respublikasının Təhsil İnstitutu Elmi şurasının qərarı ilə nəşr edilir.*

*Təsisçi: Azərbaycan Respublikasının Təhsil İnstitutu*
*"Elmi əsərlər" məcmuəsi Azərbaycan Respublikası Ədliyyə Nazirliyinin*
*11 iyul 2002-ci il tarixli 23 №-li əmri ilə qeydə alınmışdır.*

*Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə*
*tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.*

**Baş redaktor**:
**Akif Abbasov** – *pedaqogika elmləri doktoru, professor*

**Baş redaktorun müavini**:
**Hümeyir Əhmədov** – *pedaqogika elmləri doktoru, professor*

**Baş redaktorun müavini**:
**İlham Cavadov** – *pedaqogika üzrə fəlsəfə doktoru, dosent*

**Məsul katib**:
**İradə Əmirəliyeva** – *pedaqogika üzrə fəlsəfə doktoru*

**Redaksiya heyəti**: **Emin Əmrullayev**, **Elnur Əliyev**, kimya ü.f.d., **Rüfət Əzizov**, siyasi.elm.ü.f.d. **Anar Nağıyev**, ped.ü.f.d., dos. **Ənvər Abbasov**, ped.e.d., prof. **Vidadi Xəlilov**, ped.e. d., prof. **Fərahim Sadıqov**, ped.e.d., prof. **Hikmət Əlizadə**, psixol.e.d., prof. **Ramiz Əliyev**, ped.e.d., prof. **İntiqam Cəbrayılov**, ped.e.d. **Piralı Əliyev**, ped.e.d., prof. **Şahin Tağıyev**, ped.e.d., prof. **Mübariz Əmirov**, ped.e.d., prof. **Novruz Musayev**

**Redaksiya şurası**:
**B.H. Əliyev** (AMEA-nın müxbir üzvü, psixol. e.d., prof., Azərbaycan)
**A.N. Rəhimov** (Bakı Qızlar Universitetinin təsisçisi, ped.e.d., prof., Azərbaycan)
**N.D. Nikandrov** (Rusiya Təhsil Akademiyasının akademiki, ped.e.d., prof., Moskva)
**A.K. Kusainov** (Kazaxıstan Pedaqoji Elmlər Akademiyasının prezidenti, ped.e.d., prof., Alma-Ata)
**O.M. Topuzov** (Ukrayna Milli Pedaqoji Elmlər Akademiyasının vitse-prezidenti, Pedaqogika İnstitutunun direktoru, ped.e.d., prof., Kiyev)
**İ.X. Karimova** (Tacikistan Təhsil Akademiyasının vitse-prezidenti, ped.e.d., prof., Düşənbə)
**V. Briller** (Kolumbiya Universitetinin Ali təhsilin sektor təhlili üzrə icraçı direktoru, Dr., prof. (Nyu-York)
**S.P. Lomov** (Moskva DPU-nun kafedra müdiri, RTA-nın akademiki, ped.elm.dok., prof., Moskva)
**Ə.Ə. Şahin** (Hacettepe Universitetinin professoru, Türkiyə)
**Y. Romanenko** (dövlət idarəetmə elmləri doktoru, professor, Ukrayna)
**A.S. Sidenko** (Sosial İdarəetmə Akademiyasının aparıcı elmi işçisi, ped.e.d., prof., Moskva)
**N.V. Naumova** (Samara Humanitar Akademiyasının kafedra müdiri, psixol. ü.f.d., dosent, Samara)
**Tran Mai Uos** (Banking Universitetinin baş müəllimi, fəlsəfə doktoru, dosent, Vyetnam)

**Redaksiya**: Lalə Məmmədli, Dinarə Əsədova, Günel Quluzadə, Oğuztoğrul Tahirli, Şükür Aslanov

© ARTİ, 2024

## *BAŞ REDAKTORDAN*
## *ОТ ГЛАВНОГО РЕДАКТОРА*
## *FROM THE EDITOR-IN-CHIEF*

*UOT 371*

***Akif Nurağa oğlu Abbasov***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmi katibi,*
*pedaqogika elmləri doktoru, professor, Əməkdar müəllim*
*https://orcid.org/0000-0002-9210-7141*
*https://doi.org/10.69682/azrt.2024.91(3).5-10*

# COP29: ÇOX DƏYƏRLİ TƏDBİR, ŞAGİRDLƏRDƏ VƏ TƏLƏBƏLƏRDƏ EKOLOJİ MƏDƏNİYYƏTİNİN FORMALAŞMASI VASİTƏSİ KİMİ

***Акиф Нурага оглы Аббасов***
*ученый секретарь Института Образования Азербайджанской Республики,*
*доктор педагогических наук, профессор, заслуженный учитель*

# COP29: ОЧЕНЬ ЦЕННОЕ МЕРОПРИЯТИЕ, СРЕДСТВО ФОРМИРОВАНИЯ ЭКОЛОГИЧЕСКОЙ КУЛЬТУРЫ У ШКОЛЬНИКОВ И СТУДЕНТОВ

***Akif Nuragha Abbasov***
*scientific secretary of the Institute of Education of the Republic of Azerbaijan.*
*doctor of pedagogical sciences, professor, Honored teacher*

# COP29: A VERY VALUABLE EVENT, A MEANS OF FORMING AN ENVIRONMENTAL CULTURE IN SCHOOLCHILDREN AND STUDENTS

**Xülasə.** Azərbaycanda ekoloji maariflənmə, ekoloji təhsil və tərbiyə üzrə daim sistemli, məqsədyönlü işlər aparılır. Ölkəmizdə ekoloji tarazlığın təmin olunması, ekoloji böhranın aradan qaldırılması, vətəndaşların ekoloji təhsili və tərbiyəsi, ekoloji maarifləndirilməsi istiqamətində məqsədyönlü fəaliyyət mövcuddur. Bu tədbirlər dövlət siyasətinin ətraf mühitin qorunması sahəsindəki çox önəmli işlərindəndir. COP29 dünyada çox mühüm beynəlxalq tədbirlərdəndir. COP29-la bağlı 10 minlərlə xarici nümayəndə ölkəmizə gələcək. COP29 beynəlxalq konfransının Azərbaycanda, Bakıda keçirilməsi qərarını bütün ölkələr qəbul edib. Azərbaycana böyük etimad və böyük hörmət göstərilib.

Məqalədə qeyd olunan məsələlərlə daha ətraflı tanış olmaq mümkündür.

***Açar sözlər:*** *COP29, ekologiya, ekoloji böhran, ekoloji tarazlıq, ətraf mühitin qorunması, yaşıl enerji, ekoloji maariflənmə, ekoloji təhsil, ekoloji tərbiyə*

**Аннотация.** В Азербайджане ведется системная и целенаправленная работа по экологическому просвещению, экологическому образованию и воспитанию. В нашей стране ведется целенаправленная работа в направлении обеспечения экологического баланса, ликвидации экологического кризиса, экологического образования и воспитания граждан, экологического просвещения. Данные меры являются одной из важнейших задач государственной политики в области охраны окружающей среды. COP29 – одно из важнейших международных мероприятий в мире. В нашу страну в связи с COP29 приедут 10 тысяч иностранных представителей. Все страны приняли решение о проведении международной конференции COP29 в Азербайджан. Азербайджану было оказано большое доверие и большое уважение.

С вопросами, затронутыми в статье, можно ознакомиться более подробно.

***Ключевые слова:*** *COP29, экология, экологический кризис, экологический баланс, охрана окружающей среды, зеленая энергетика, экологическое сознание, экологическое образование, экологическое воспитание*

**Abstract.** Systematic and purposeful work on environmental awareness, environmental education and upbringing is being carried out in Azerbaijan. In our country, targeted work is being carried out in the direction of ensuring environmental balance, eliminating the environmental crisis, environmental education and upbringing of citizens, environmental education. These measures are one of the most important tasks of state policy in the field of environmental protection. COP29 is one of the most important international events in the world. 10 thousand foreign representatives will come to our country in connection with COP29. In just two weeks, Baku will become the center of the world. All countries have decided to hold the international conference COP29 in Azerbaijan. Azerbaijan was given great trust and great respect.

The issues raised in the article can be found in more detail.

***Key words**: COP29, ecology, environmental crisis, ecological balance, environmental protection, green energy, environmental awareness, environmental education, environmental upbringing*

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 25 dekabr 2023-cü il tarixli Sərəncamına əsasən ölkəmizdə 2024-cü il "Yaşıl dünya naminə həmrəylik ili" elan olunmuşdur. Bundan savayı, respublikamızda həm də çox böyük tədbirin – Birləşmiş Millətlər Təşkilatının İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyası Tərəflər Konfransının 29-cu sessiyasının - COP29-nin keçirilməsi nəzərdə tutulmuş, bu tədbirlə bağlı son dərəcə mühüm hazırlıq işləri görülməkdədir.

Hələ 2023-cü il dekabrım 15-də Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin sədrliyi ilə BMT-nin İqlim Dəyişikliyi üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyasının – COP29-un ölkəmizdə keçirilməsi ilə əlaqədar müşavirə keçirilmişdi. Müşavirədə cənab Prezident çıxış etmiş, aşağıdakı məsələləri diqqətə çatdırmışdır: "COP29 beynəlxalq konfransın Azərbaycanda, Bakıda keçirilməsi qərarını bütün dünya ölkələri qəbul etmişdir. Azərbaycana növbəti dəfə böyük etimad və böyük hörmət göstərilmişdir. Biz apardığımız siyasət nəticəsində dünya miqyasında çox güclü mövqelərə sahib olmuşuq. Azərbaycana beynəlxalq aləmdə olan hörmət günbəgün artır və biz bu hörməti öz əməlimizlə, işimizlə, siyasətimizlə qazanmışıq. Bizim müstəqil siyasətimiz, prinsipial mövqeyimiz, beynəlxalq hüquqa bağlılığımız, sədaqətimiz və eyni zamanda, ölkə ərazisində suverenliyin bərpa edilməsi bizə olan hörməti daha da artırdı. COP29-da 10 minlərlə xarici nümayəndə ölkəmizə gələcək, iki həftə ərzində Bakı dünyanın mərkəzi olacaq. Müəyyən ehtimallara görə, təqribən 70-80 min xarici qonaq bu müddət ərzində ölkəmizdə olacaq. COP29 dünyada ən mötəbər beynəlxalq tədbirlərdən biridir. COP29 beynəlxalq konfransını yüksək səviyyədə keçirəcəyik, bu, ölkəmizin, xalqımızın növbəti böyük uğuru olacaq. Eyni zamanda, Azərbaycan neft-qaz ölkəsi kimi bu sahədə də özünü göstərəcəkdir və dünyada hər kəs bir daha görəcək ki, bizim gündəliyimiz yaşıl enerji ilə bağlıdır. Yaşıl enerji növlərinin yaradılması və yaşıl enerjinin dünya bazarlarına nəqli hazırda bizim enerji siyasətimizin prioritetidir. Bu, reallıqdır və bütün dünya bunu bir daha görəcək [1].

Cənab İlham Əliyev COP29-un Azərbaycanda keçirilməsi ilə əlaqədar Təşkilat Komitəsinin yaradılmasına dair sərəncam da imzalamışdır [2].

Qeyd edək ki, BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransı (COP) hər il təşkil olunur. Bu konfransa sədrlik BMT-nin beş regionu arasında rotasiya edilir. Tərəflər Konfransının 2024-cü il noyabr ayında Bakı şəhərində keçirilməsi nəzərdə tutulan 29-cu sessiyasına (COP29) sədrliyi Azərbaycan həyata keçirəcək. Beynəlxalq tədbirlərə sədrlik etmək istiqamətində ölkəmizin böyük təcrübəsi vardır.

Azərbaycanda ekoloji maariflənmə, ekoloji təhsil və tərbiyə üzrə daim sistemli, məqsədyönlü işlər görülür. Ekoloji tarazlığın təmin olunması, ekoloji böhranın aradan qaldırılması, ətraf mühitin mühafizəsi, vətəndaşların ekoloji təhsili və tərbiyəsi, ekoloji maarifləndirilməsi istiqamətində məqsədyönlü işlər həyata keçirilir. Bu tədbirlər dövlət siyasətinin ətraf mühitin qorunması sahəsindəki çox önəmli işlərindəndir.

Hələ 2002-ci ildə Ümummilli Lider Heydər Əliyev "Əhalinin ekoloji təhsili və maarifləndirilməsi haqqında Azərbaycan Respublikasınının Qanunu"nu imzalamışdır. Qanunda vətəndaşların ekoloji təhsili və maarifləndirilməsi sahəsində dövlət siyasətinin hüquqi, iqtisadi və təşkilati əsasları müəyyən edilmiş, həmin

yönümdə münasibətlər tənzimlənmişdir. Eyni zamanda "Əhalinin ekoloji təhsili və maarifləndirilməsi haqqında" Azərbaycan Respublikası Qanununun tətbiq edilməsi barədə" Azərbaycan Respublikası Prezidenti 2003-cü il 27 yanvar tarixli 847 nömrəli Fərman imzalamışdır. Fərmandan irəli gələn vəzifələrlə əlaqədar olaraq respublika Nazirlər Kabineti 2003-cü il iyunun 2-də "Ekoloji təhsil və maarifləndirmə üzrə dövlət proqramlarının tərtib edilməsi Qaydaları" və "Ekoloji təhsil və maarifləndirmə üzrə məsləhət şuraları haqqında Əsasnamə"nin təsdiq edilməsi ilə bağlı 75 nömrəli qərar vermişdir.

Belə bir məlumat da önəmlidir ki, ekoloji təhsilin səmərəli şəkildə təşkilinə və ekoloji mədəniyyətin formalaşdırılmasına nail olmaq üçün 2010-cu il ölkəmizdə "Ekologiya ili" elan edilmişdir.

Bu mənada COP29 kimi beynəlxalq tədbirin Azərbaycanda həyata keçirilməsi heç də təsadüfi deyildir. Bu tədbir ölkəmizin heç də ev sahibliyi edəcəyi ilk beynəlxalq ekotədbir sayılmır. Azərbaycan hələ həmin vaxta kimi bir çox beynəlxalq tədbirlərə ev sahibliyi etmişdir. Onlardan birini – 2016-cı il BMT-nin 7-ci Enerji Forumunu nümunə gətirmək mümkündür. 2016-cı il Forumu çərçivəsində iqlim dəyişikliklərinin zəruri seqmentləri - karbon emissiyalarının azaldılması, “yaşıl enerji”yə keçid, “yaşıl enerji”dən faydalanmanın mümkünlüyü və başqa problemlər nəzərdən keçirilmişdir.

Bu kimi tədbirlər bir çox hallarda təşkil olunmuş, dünyanın müxtəlif ölkələrinin nümayəndələri respublikamıza gələrək, həmrəy olaraq təbiətin mühafizəsi, ekoloji tarazlığın gözlənməsi, insanların, bəşəriyyətin, dünyamızın, təbiətin qorumnması ilə bağlı fikir mübadiləsi aparmışlar.

Deməli, respublikanız beynəlxalq ekoloji problemlərin müzakirə obyektinə çevrildiyi bir ölkə rolunu oynamaqdadır. Hazırda dünyada ətraf mühitin vəziyyəti, ekoloji tarazlığın pozulması hamını, bütün ölkələri ciddi surətdə narahat edir. Ekoloji tarazlığın hədsiz pozulması, ekologiyanın yaman günə qalması planetimizi, insanları məhvə aparar.

Ötən əsrin 90-cı illərdən etibarən xarici ölkələr iqlim dəyişikliklərinin qarşısını almaq məqsədilə bir sıra ideyaları diqqətə çatdırırdılar. Həmin istiqamətdə mühüm hadisə Paris İqlim Sazişidir (COP 21). Bu saziş 2015-ci ildə imzalanmışdır. Azərbaycan 2016-cı ildə sazişi ratifikasiya etmiş, öz üzərinə bir sıra öhdəliklər götürmüşdür. Həm ölkəmizdə ekoloji tarazlığın bərpası, həm də iqlim sazişinin tələblərini yerinə yetirmək üçün Azərbaycanda Milli Fəaliyyət Planı qəbul edildi.

Azərbaycan ekoloji problemlərlə bağlı və yeni çağırışlara cavab olaraq beynəlxalq əməkdaşlığı hər vaxt üstün tutub. Bu, bir həqiqətdir ki, ekoloji problemlərin həll edilməsi və aradan qaldırılması heç də yalnız Azərbaycanın deyil, bütün ölkələrin ümdə vəzifəsidir. Burada qəribə heç nə yozdur. Ekoloji problemlər ümumbəşəri problemlərdir.

*Ümummilli Liderimiz Heydər Əliyev demişdir: “Respublikamızda ekoloji problemlərin həll edilməsi dövlətin daim diqqət mərkəzində olmuş, ətraf mühitin mühafizəsi üzrə milli fəaliyyət proqramı qəbul edilmiş, beynəlxalq ekoloji proqramların həyata keçirilməsi, təbii sərvətlərin bərpasının təmin edilməsi və mühafizəsi, milli parkların təşkili və ekoloji şəbəkənin yaradılması istiqamətində bir sıra mühüm işlər görülmüşdür”. Deməli, bizdə ekoloji problemlər dövlət səviyyəsində diqqət mərkəzindədir.*

Azərbaycanın da müəyyən ekoloji problemləri mövcuddur. Həmin problemin bir qismi hələ SSRİ dövründən bizə miras qalıb. İmperiya sərvətlərimizi talayırdı. Neftimizin daşınıb aparılması bir yana qalsın, neft istehsalı zamanı çox böyük ərazilərimiz, torpaqlar neftlə çirklənir, neft gölməçələri meydana gəlirdi. Xəzər dənizində neft hasilatı zamanı neft tullantıları açıq dənizə axıdılırdı. Müstəqilliyimizi yenidən qazanandan sonra bu kimi məsələlərə diqqət yetirildi. Minlərlə hektar ərazi neftlə çirklənmişdi. Müasir texnologiyaların köməyilə həmin torpaqlar neft tullantılarından təmizləndi, yaşıllıq zolaqları salındı, ətraf mühitin mühafizəsi ilə bağlı mühüm işlər həyata keçirildi.

Ölkəmiz hələ müstəqilliyimizin ilk illərində - 1992-ci ildə BMT-nin İqlim Dəyişmələri haqqında Çərçivə Konvensiyasına qoşulmuşdu. Daha sonra - 20 sentyabr 1994-cü il tarixində “Əsrin müqaviləsi” imzalandı. Ulu Öndər Heydər Əliyevin təşəbbüsünə əsasən, həmin müqavilənin iştirakçısı olan dövlətlər öz üzərlərinə ekoloji tarazlığın pozulmamaması və qorunması ilə bağlı öhdəlik götürdülər.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin sərəncamı ilə 2010-cu il ölkəmizdə "Ekologiya ili" elan edildi. Ekoloji sahədə qlobal layihələrin icrasına başlandı.

Azərbaycan Respublikasının Ekologiya və Təbii Sərvətlər Nazirliyi bilavasitə ölkəmizin təbii sərvətlərimizin qorunması və ekologiyanın yaxşılaşdırılması məsələlərə cavabdeh olan nazirlikdir. Nazirlik Ümummilli Lider Heydər Əliyevin Prezidentliyi dövründə və onun 2001-ci il 23 may tarixli 485 nömrəli Fərmanı ilə yaradılmışdır. 2001-ci il 18 sentyabr tarixli, 583 nömrəli Fərmanla "Azərbaycan Respublikasının Ekologiya və Təbii Sərvətlər Nazirliyi haqqında Əsasnamə" təsdiq olunmuşdur.

Nazirlik ölkəmizin ərazisində, həmçinin Xəzər dənizinin (gölünün) respublikamıza aid bölməsində ətraf mühitin mühafizəsi, təbiətdən faydalanmanın təşkili, mineral xammal ehtiyatlarından, yeraltı sulardan və yerüstü təbii sərvətlərdən səmərəli istifadəsi, bərpası, hidrometeoroloji proseslərin müşahidəsi və proqnozlaşdırılması sahəsində dövlət siyasətini reallaşdıran mərkəzi icra hakimiyyəti orqanı hesab edilir.

Respublikamızda ekoloji problemlərin həlli istiqamətində səmərəli tədbirlər həyata keçirilir. Yaranmış ekoloji problemlərdən biri də plastik və polietilen qablardan səmərəsiz faydalanma məsələsidir.

Vaxtilə məişətdə, dükan-bazarda kağızdan istifadə edərdik. Məlum olduğu kimi, kağız istehsalı çoxsaylı odunlar, taxtalar hesabına başa gəlir. Kağız onlardan hazırlanır. Sular, şirələr, qatıq, kefir, xama, kəsmik, spirtli içkilər şüşə qablarda satılardı. Dünyanı qorumaq üçün kağızdan, şüşə qablardan imtina edildi. Başqa sözlə, ondan son dərəcə az istifadə olunmağa başlandı. Fəqət indi aydın olub ki, polietilen torbaların, plastik qabların ziyanı son dərəcə böyükdür. Hazırda çayların, dənizlərin və okeanların diblərində plastiklər özünə yer alıb. Bu isə, bütünlükdə ekosistemin zəhərlənməsinə imkan verir. Bunu nəzərə alaraq, Azərbaycanda polietilen qablardan istifadənin azaldılması ilə bağlı müəyyən tədbirlər həyata keçirilir.

Ətraf mühitin çirkləndirən vasitələrdən biri də plastik qablaşdırma tullantılarıdır. Əgər ötən əsrin 60-cı illərində bərk məişət tullantılarının tərkibində plastik tullantıların miqdarı 1 faizə qədər idisə, müasir günümüzdə həmin göstərici 12 faizdən artıqdır. Başlıcası, plastik tullantılar təbiətdə yüz illər boyu parçalanmır, miqdarı isə hər il artmaqda davam edir. Polietilen torbalar, plastik qablar hər il təxminən 120 milyon ton əlavə tullantını meydana gətirir.

Plastik və polietilen məhsulların parçalanaraq yox olmasından ötrü torpaqda 800, dənizdə isə 400 il vaxt lazımdır. Eyni zamanda yarım əsrdən sonra da plastik məhlul torpağa qarışıb onu çirkləndirəcəkdir. Okeanlara hər il haradasa 150 ton plastik qab-qacaq, polietilen torba tullanır.

Vəhşi heyvan və quşlar, balıqlar plastik tullantıların yeminə çevrilmişlər. Çoxlu heyvan və quş onların günahı ucbatından ölür. Milyonlarla dəniz canlısı plastik tullantılar səbəbindən tələf olur. Günəş isitməsi səbəbindən plastik qablar son dərəcə təhlükəlidir.

Plastik tullantılar insanların da qəniminə çevrilmişdir. Belə ki, zərərli maddələrin 80 faizi plastik tullantılar səbəbindən insan orqanizminə daxil olur.

Hazırda bütün dünyada olduğu kimi, respublikamızda da plastik qablardan, polietilen torbalardan istifadəyə "yox" deyilir, onların insan sağlamlığına ziyanı mətbuatda, reklamlarda səsləndirilir. Elə ölkələr var ki, plastik qablardan, polietilen torbalardan istifadə qadağan olunub, hətta bu qadağanı pozmaya görə xüsusi cərimələr və uzunmüddətli həbslər təyin edilib.

Azərbaycan Respublikasında müəyyən ekoloji durumun lazımi səviyyədə olması bəzən özümüzdən də asılı olmur. Düşmən qüvvələr bu istiqamətdə təxribatlar törədirlər. Ermənistanı nümunə göstərmək mümkündür.

1988-1993-cü illərdə Ermənistanın hərbi təcavüzü ilə bağlı ölkəmizin 20 faizi, başqa sözlə, 1.7 milyon hektar ərazisi tutulmuşdu. İşğalçı ölkə 30 ilə yaxın müddətdə həmin torpaqlarda misli görünməmiş vəhşiliklər törətmiş, ekoloji tarazlığı pozmuşdur. İşğalda qalmış torpaqlarımızda 460 növdən çox yabanı ağac və kol bitir. Onlardan 70-i endemik növdür və Yer üzünün heç yanında təbii halda bitmir. Məlum olmuşdur ki, Ayıfındığı, meşə üzümü, yalanqoz, adi nar, adi xurma Qaraçöhrə, Araz palıdı, şərq çinarı, şümşad, Eldar şamı, pirkal, söyüdyarpaq armud və s. bu kimi ağaclar erməni vəhşilərinin qəddarlığı nəticəsində məhv olmaqda idi.

Həmin ərazilərdə "Azərbaycan Respublikasının Qırmızı Kitabı"na daxil edilmiş məməli-

lərin 4, quşların 8, balıqların 1, amfibiya və reptililərin 3, həşəratların 8, bitkilərin isə 27 növü qorunurdu. Xüsusi şəkildə mühafizə olunan təbiət ərazilərinin sahəsi 890 min hektara çatdırılmışdı. Onun isə 42997 hektarı erməni işğalçılarının tapdağı altında idi. Arazboyu Dövlət Təbiət Yasaqlığı, Bəsitçay Dövlət Təbiət Qoruğu, Qaragöl Dövlət Təbiət Qoruğu, Laçın rayon Dövlət Təbiət Yasaqlığı, Qubadlı rayon Dövlət Təbiət Yasaqlığı və Daşaltı Dövlət Təbiət Yasaqlığının ərazisində olan qiymətli ağac və biomüxtəlifliyin digər növləri erməni vandalları tərəfindən talan olunurdu.

İşğal altındakı rayonlarda 247352 hektar meşə sahəsi, 152 ədəd təbiət abidəsi və 5 geoloji obyekt qalmışdı. İşğaldan sonra bizim torpaqlarda məskunlaşmış ermənilər mühüm əhəmiyyətli həmin təbiət abidələrinin böyük qisminin axırına çıxmışdılar. Əzəli Azərbaycan ərazisi olan qədim Kəlbəcər rayonunda “Qırmızı Kitab”a salınmış 968 hektar ərazini özündə birləşdirən ayıfındığı ağaclarını tamam-kamal kəsərək, xarici ölkələrə çox yaxşı qiymətə satmış, var-dövlət qazanmışlar. Bu rayonun müxtəlif kəndlərində 4 mindən çox müxtəlif növ bitki (o cümlədən 200-ə qədəri dərman bitkisi) mövcud idi. Onlar erməni vəhşiləri tərəfindən böyük məbləğdə pul hesabına xaricə ötürülürdü.

Düşmənlərimiz işğal etdikləri ərazilərimizdən keçən təbii su mənbələrimizi, o cümlədən Araz və Kür çaylarının qolları olan Oxçuçay və Ağstafaçayı hədsiz çirkləndirirməkdə idilər. Bütün bunlar isə çaylardakı canlı aləmin mövcudluğuna böyük təhlükə olurdu.

Mənbələrdən oxuyuruq: “Azərbaycanın işğal olunmuş ərazilərində ekoloji əhəmiyyətə malik bir çox göllər güclü antropogen təsirə məruz qalır. Bu ərazilərdə irili-xırdalı 7 relikt göl – Kəlbəcər və Laçın rayonlarının yaylaqlarında Böyük Alagöl, Kiçik Alagöl, Zalxagöl, Qaragöl, Canlıgöl, İşıqlı Qaragöl və Ağdərə rayon ərazisində (Tərtərin qolu olan Torağaçayda) Qaragöl kimi şirin su ehtiyatları bu gün işğal altındadır. Göllərın içərisində ən çox antropogen təsirə məruz qalanı Azərbaycanın Laçın rayonu ilə Ermənistanın Gorus rayonu arasında yerləşən İşıqlı Qaragöldür. Uzunluğu 1950 metr, maksimal eni 1250 metr, maksimal dərinliyi 7-8 metr, suyunun həcmi isə 10 milyon kubmetr olan İşıqlı Qaragölün şəffaflığı 4.6 metrdir. Gölün ətrafında ermənilərin məskunlaşması və suyundan suvarma məqsədi ilə istifadə olunması gölün suyunun qurumasına və çirklənməsinə səbəb olur” [3].

Erməni vəhşiliyinə daha bir nümunə: “İşğalçılar tərəfindən təmas xəttində yerləşən Ağdam, Füzuli, Cəbrayıl, Tərtər və Xocavənd rayonlarının əraziləri düşünülmüş şəkildə od vurularaq yandırılıb. Yanğınlar ətraf mühitə və canlı təbiətə çox ciddi ziyan vurub. Azərbaycanın işğal olunmuş ərazilərində Ermənistan ordusunun əsgərləri tərəfindən qəsdən törədilmiş yanğınlar nəticəsində 96 min hektar otlaq, biçənək və yaşıllıqlar, həmçinin meşə sahələri yanaraq məhv olmuş, torpağın üst münbit qatı yararsız hala düşüb. Yanğınlar zamanı ətraf mühitə 176 milyon manat məbləğində ziyan dəyib” [3].

Ali Baş Komandan cənab İlham Əliyevin rəhbərliyi altında Azərbaycan Ordusu erməni faşist işğalçılarını ölkəmizdən qovdu. İşğal olunmuş bütün ərazilərimiz özümüzə qayıtdı. İndi erməni vandallarının törətdikləri vəhşiliklər nəticəsində daşı daş üstə qalmayan rayonlar, kənd və qəsəbələr abadlaşır, yenidən tikilir. Baxdıqca adamın ürəyi açılır, fərəh, qürur hissi keçirirsən. Erməni işğaıçılarının yaratdıqları ekoloji fəlakətlər aradan qaldırılır.

Ölkəmizdə əhali öz şirin su ehtiyatlarını başlıca olaraq Kür və Araz çaylarının hesabına ödəyir. Həmin çaylar öz mənbələrini Türkiyədən götürür, Gürcüstan və Ermənistan əraziləri ilə gələrək Azərbaycanda Xəzər dənizinə tökülür. Həm Gürcüstanın və həm də Ermənistanın ərazilərində Kür və Araz çaylarının suları sənaye və məişət tullantıları ilə çirklənməkdədir. Xüsusən Ermənistan son dərəcə düşməncəsinə davranır, Kür və Araz çaylarının sahilyanı və dib çöküntüləri kimyəvi və radioaktiv tullantılarla çirkləndirməkdən əl çəkmir. Qaçaran, Meğri, Qafan və Dəstəkert dağ-mədən kombinatlarının 100 min tonlarla qatı turş suları, ağır metal duzları və başqa tullantıları Arazın qolu olan Oxçuçaya tökülür.

Azərbaycan Respublikası Prezidenti cənab İlham Əliyev bu düşməncəsinə davranma barədə Münhen Təhlükəsizlik Konfransı çərçivəsində “İqlim və enerji təhlükəsizliyi. İstiləşmə hələ də davam edirmi?” mövzusunda panel-müzakirə zamanı məlumat vermişdir. Oxuyuruq: “Bizim üçün əsas təhlükə ondan ibarətdir ki, bizi su ilə təchiz edən əsas çaylarımız mənbəyini qonşu

ölkələrdən götürür və xüsusilə Ermənistanda Araz çayının çox ciddi çirklənməsi müşahidə olunur. Bu da bizim hamımız üçün təhlükədir. Çayın çirklənməsinin dayandırılması ilə bağlı etdiyimiz bütün müraciətlərimizə baxmayaraq, əfsuslar olsun ki, Ermənistan bu siyasəti davam etdirir".

Fəqət Ermənistan öz murdar hərəkətlərini dayandırmır. Dünya ölkələri də buna dözür.

Mənbələrdə göstərildiyi kimi, "Erməni təcavüzü və işğalı nəticəsində Azərbaycanın ətraf mühitinə və təbii sərvətlərinə 265 milyard dollar ziyan dəyib" [4].

Azərbaycanımızda belə deyim var. Birini qarğıyanda deyirlər: "Zəlil olsun!" Xalqımıza qarşı düşmənçilik edən, sərvətlərimizi talayan, Araz və Kür çaylarına zəhərli maddələr axıdan, musiqimizi, mədəniyyətimizin ayrı-ayrı nümunələrini oğurlayıb öz adına çıxan, meşələrimizi, evlərimizi yandıran, azərbaycanlılara olmazın zülm edən, qəddar, qansız, xəyanətkar ermənilər zəlil olsunlar!!!

BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransı (COP29) ilə bağlı təhsilalanlarda ekoloji mədəniyyətin formalaşmasına, maariflənmələrinə, təhsili və tərbiyəsinə kömək göstərəcək tədbirlərin bütün təhsil müəssisələrində planlaşdırılması və keçirilməsi məqsədəuğundur.

**Problemin aktuallığı**. BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının (COP29) Azərbaycanda keçirilməsi təqdirəlayiqdir. COP29 və təhsilalanların ekoloji maariflənməsinin vacibliyi, ölkəmizdə ekologiyanın yaxşılaşdırılmasının zəruriliyi diqqət mərkəzinə gətirildiyi üçün məqalə aktuallığı ilə seçilir.

**Problemin yeniliyi**. COP29 barədə zəruri məlumat verildiyi, ekologiyanın problemləri, düşmənlərimizin ekologiyamıza vurduğu ziyanlar qeyd olunduğu və zəbt edilmiş torpaqlarımızı azad etmək nəticəsində həmin ərazilərdə ekoloji tarazlığın bərpa olunması barədə məlumatın öz əksini tapması məqalənin yeniliyi kimi dəyərləndirilə bilər.

**Problemin praktik əhəmiyyəti**. Məqalə gənc tədqiqatçılar, magistrantlar, magistrlər və doktorantlar üçün faydalı olacaqdır.

**Ədəbiyyat**

1. COP29-un gələn il ölkəmizdə keçirilməsi ilə əlaqədar Prezident İlham Əliyevin sədrliyi ilə müşavirə keçirilib https://president.az/az/articles/view/62562
2. COP29-la bağlı Təşkilat Komitəsi yaradılıb – SƏRƏNCAM https://report.az/cop29/ilham-eliyev-cop29-la-bagli-teskilat-komitesinin-yaradilmasi-ile-bagli-serencam-imzalayib/
3. Erməni işğalının vurduğu ekoloji ziyan https://novator.az/2017/02/27/erm-ni-isgalinin-vurdugu-ekoloji-ziya https://eco.gov.az/az/nazirlik/xeber?newsID=6574n/
4. S. Məmmədli, M. Fərəcov. Ermənistanın Araz çayı boyu yerləşən yaşayış məntəqələrində törətdiyi ekoloji fəlakət https://science.gov.az/az/news/open/15227

**E-mail: a.abbasov@arti.edu.az**
**Redaksiyaya daxil olub**: 11.02.2024

# *TƏHSİLİMİZİN HEYDƏR ƏLİYEV MƏRHƏLƏSİ*
# *ГЕЙДАР АЛИЕВСКИЙ ЭТАП НАШЕГО ОБРАЗОВАНИЯ*
# *HEYDAR ALIYEV'S STAGE OF OUR EDUCATION*

*UOT: 37.0*

***Fəridə Tofiq qızı Xudiyeva***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi,*
*pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0000-0003-1783-6392*
*https://doi.org/10.69682/azrt.2024.91(3).11-15*

## TƏLİM PROSESİNDƏ HEYDƏR ƏLİYEVİN İRSİNDƏN İSTİFADƏNİN ŞAGİRDLƏRİN HƏRTƏRƏFLİ İNKİŞAFINA TƏSİRİ

***Фарида Тофик гызы Худиева***
*старший преподаватель Азербайджанского Государственного Педагогического Университета,*
*доктор философии по педагогике*

## ВЛИЯНИЕ ИСПОЛЬЗОВАНИЯ НАСЛЕДИЯ ГЕЙДАРА АЛИЕВА В УЧЕБНОМ ПРОЦЕССЕ НА ВСЕСТОРОННЕЕ РАЗВИТИЕ УЧАЩИХСЯ

***Farida Tofig Khudiyeva***
*senior teacher at Azerbaijan State Pedagogical University,*
*doctor of philosophy in pedagogy*

## THE EFFECT OF USING HEYDAR ALIYEV'S HERITAGE IN THE TRAINING PROCESS ON THE COMPREHENSIVE DEVELOPMENT OF STUDENTS

**Xülasə**. Bu gün dövlətimizdə fəaliyyətlə məşğul məktəbəqədər, ümumi, peşə, orta-ixtisas və ali təhsil ocaqlarının geniş şəbəkəsi, qüdrətli elmi-pedaqoji kadr potensialı öz özəyini məhz keçən əsrin 70-ci illərində Heydər Əliyevin liderliyi altında təhsil üzrə aparılan məqsədli siyasətdən almış və aparılan geniş əhatəli təhsil yaradıcılığı gələcək tərəqqinin güclü bünövrəsini yaratmışdır. O dövrdə Azərbaycanda tam təhsil ocaqları öncəki illərlə müqayisədə müasir inkişaf pilləsinə qalxmış, bu istiqamətdə həyata keçirilən ardıcıl ölkə siyasəti təhsil, ümummədəni və intellektual dərəcənin yüksəldilməsində xüsusi rol oynamışdır. Heydər Əliyevin həyat və siyasi aktiv fəaliyyəti hər bir Azərbaycan vətəndaşında Azərbaycan millətinin çağdaş tarixinin banisi, azad Azərbaycan dövləti və dövlətçiliyinin yaradıcısı kimi fəxr hissi doğurur. Ümummilli Liderin mübarizələrlə dolu həyatı doğma millətinə həsr etdiyi xüsusi bir dövrün, epoxanın canlı salnaməsi olmaqdadır. Azərbaycan millətinin tarixində ilk dəfə Heydər Əliyev milli ideologiya məfhumunun yaradılması ideyasını irəli sürmüş, bu sahə üzrə görüləcək işlər, bu işlərin tətbiqi sahələri, vasitə və imkanları barədə tövsiyələr vermişdir. Lider, Azərbaycan dili və Azərbaycan tarixi fənlərini, dini nöqteyi-nəzərləri, adət-ənənələri və dövlətçilik görüşlərimizi təbliğ etməyə xüsusi məna verir, bu ideologiyanı yaratmaq, təşkil etmək və yerinə yetirmək işində xüsusi hörmət bəslədiyi peşə sahiblərinin – müəllimlərin zəhmətini və rolunu yüksək dəyərləndirirdi.
***Açar sözlər:*** *Azərbaycan dili, ideologiya, Heydər Əliyev, şəxsiyyət, dövlətçilik*

**Резюме.** Действующая на сегодняшний день в нашей стране широкая сеть дошкольных, общих, профессионально-технических, средних и высших учебных заведений, мощный научно-педагогический кадровый потенциал берет свое начало из целенаправленной политики в области образования, проводимой под руководством Гейдара Алиева в Азербайджане в 70-е годы прошлого века.

Именно начиная с того периода очные учебные заведения в Азербайджане поднялись на уровень современного развития по сравнению с предыдущими годами, и проводимая в этом направлении последовательная национальная политика сыграла особую роль в повышении образовательного,

общекультурного и интеллектуального уровня. Политическая активная деятельность Гейдара Алиева – основоположника современной истории азербайджанского народа, создателя свободного азербайджанского государства и государственности у каждого гражданина Азербайджана вызывает чувство гордости. Жизнь общенационального лидера, полная борьбы, представляет собой живую летопись особого периода, эпохи, которую он посвятил родному народу. Гейдар Алиев впервые в истории азербайджанского народа выдвинул идею создания концепции национальной идеологии, дал рекомендации по проводимой работе в этой области, сферам применения этих работ, средствам и возможностям. Лидер придает особое значение пропаганде азербайджанского языка и истории Азербайджана, религиозных взглядов, традиций, высоко ценит труд и роль учителей, которых он особенно уважал, в создании, организации и реализации этой идеологии.

***Ключевые слова:*** *азербайджанский язык, идеология, Гейдар Алиев, личность, государственность*

**Summary.** A wide network of pre-school, general, vocational, secondary and higher education institutions operating in our state today, and a powerful scientific and pedagogical staff potential have their core from the purposeful policy on education carried out under the leadership of Heydar Aliyev in the 70s of the last century, and the comprehensive educational creativity that will be carried out in the future has created a strong foundation of progress. At that time, full-time educational institutions in Azerbaijan rose to the level of modern development compared to previous years, and the consistent national policy implemented in this direction played a special role in raising the educational, general cultural and intellectual level. The life and political active activity of Heydar Aliyev is the founder of the modern history of the Azerbaijani nation, the creator of the free Azerbaijan state and statehood in every citizen of Azerbaijan. It evokes a sense of pride. The life of the national leader, full of struggles, is a living chronicle of a special period, an epoch, which he dedicated to his native nation. For the first time in the history of the Azerbaijani nation, Heydar Aliyev put forward the idea of creating the concept of national ideology, gave recommendations on the work to be done in this field, the areas of application of these works, means and opportunities. The leader attaches special importance to the promotion of the subjects of the Azerbaijani language and Azerbaijani history, religious viewpoints, traditions, and our statehood meetings, and highly valued the work and role of teachers, whom he especially respected, in creating, organizing, and implementing this ideology.

***Keywords:*** *Azerbaijani language, ideology, Heydar Aliyev, personality, statehood*

Gənc nəslin mənəvi tərbiyəsi, xüsusilə uşaqlıqdan şəxsiyyət kimi formalaşma, millimental dəyərlərə yiyələnmə Heydər Əliyevin dövlətçilik strategiyasında vacib istiqamətlərdən birini yaratmışdır. Lider, millətin milli dəyərlərinin, mənəvi sərvətinin milli ideologiya, milli dövlətçiliklə daxili əlaqədə, bağlı olduğunu qeyd edir, milli mənsubiyyəti olmayan və özünü bir xalq kimi dərk etməyən millətin milli dövlətə də ehtiyac duymadığını bildirirdi. "Mənəviyyat yoxdursa heç nə ola bilməz" düşüncəsini ulu lider bu istiqamətdə mühüm olan işləri, onun tərkibini, amal və vəzifələrin yerinə yetirilməsi yollarını ulu bir strateq olaraq müəyyən edirdi: *"...İnkişaf etməkdə olan nəslin ...tərbiyəsi, mənəviyyat üzrə zəngin, ideya üzrə mətin, yüksək əxlaqlı insan şəxsiyyətinin formalaşması bu gün cəmiyyət qarşısında dayanan çox zəruri vəzifədir. Bu vəzifə, kompleks problem olmaqdadır və onun həll edilməsində ...məktəb çox mühüm rol oynamaqdadır. Məktəbdə insan dünyagörüşünün təməli qoyulur, onun xarakteri formalaşdırılır, ideya dayaqları, mənəvi və əxlaqi dayaqlarının bünövrəsi qurulur. Məktəbin təsiri ilə ... insanın əqidəlilik ruhu, zəhmətə məhəbbət hissi, ali mənəviyyat və humanizm ruhu, vətənpərvərlik ruhu və beynəlmiləlçilik duyğusu kimi mühüm keyfiyyətlər tərbiyə olunur.*

*Tərəqqi etməkdə olan gənc nəslin cəmiyyətin rifahı uğruna zəhmətə, aktiv yaradıcılıq fəaliyyətinə hazırlanması, məktəb sisteminin tərbiyəvi çalışmasının əsas istiqamətlərindən biridir"*[2].

Azərbaycan təhsilinə diqqət və qayğı ulu öndərin həmişə diqqət mərkəzində olmuş, gənc nəslin təlim-tərbiyəsinə həssaslıqla yanaşmışdır. O bilirdi ki, məhz ibtidai siniflərdə müəllim əməyi sayəsində insanlar yetişir, vətənə və xalqa şərəflə xidmət edirlər.

Ümumtəhsil məktəblərində təhsilin əsas məqsədi şagirdlərə hərtərəfli biliklər vermək, onları vətənpərvərlik və azərbaycançılıq ruhun-

da, milli-mənəvi dəyərlərə və adət-ənənələrimizə layiq tərbiyə etməkdir. Heydər Əliyevin bu mənada hər bir fikri, fərman və sərəncamları ibtidai sinif müəllimlərinin nəzərində olmalıdır.

Böyüməkdə olan nəslin mənəvi tərbiyə məsələsi Heydər Əliyevin qüdrətli bilik sistemində vacib istiqamətlərdən birini təşkil etmişdir. Lider, millətin milli sərvətinin, mənəvi üstünlüklərinin milli ideologiya, milli dövlətçiliklə yaxın bir əlaqədə, bağlı olduqlarını qeyd edərək, milli müəyyənlik olmadan və özünü bir millət olaraq dərk etmədən millətin milli dövlətə də ehtiyacı olmamalıdır. Dövlətin azadlığı yalnızca bölgə və iqtisadi dəyərlərlə müəyyən edilmir, əsasən millətin maddi və mənəvi üstünlükləri əsas rol oynayır.

Heydər Əliyev o nadir şəxsiyyətlərdəndir ki, milli-mənəvi dəyərlərə, adət-ənənələrə qəlbən bağlı olur, daima soykökün təəssübünü çəkirdi. Xalqın milli dəyərlərini, mənəvi sərvətlərini o, yüksək qiymətləndirirdi. Xalq musiqisi, xalq rəqsləri, xalqın yaratdığı və malik olduğu hər bir sənət əsəri onun üçün əvəzsiz nemət idi. Ən zəngin milli-mənəvi dəyərlərdən biri olan muğamları ulu öndər çox sevir və qiymətləndirirdi. Qeyd edək ki, XII əsrdə dəyərli Azərbaycan şairi Nizami Gəncəvi "Xosrov və Şirin" əsərində Azərbaycan muğamlarının bütöv bir sistemini poetik dillə, fəlsəfi məzmunda şərh etmişdir. Nizami Gəncəvidən Mir Möhsün Nəvvaba qədər, Nəvvabdan Üzeyir Hacıbəyova qədər muğamlarımız inkişaf etmiş, formalaşmış və təkmilləşərək milli-mənəvi dəyərlər formasına düşmüşdür. Eləcə də, xalq rəqslərimiz, xalq mahnılarımız min illər boyu inkişaf edərək formalaşmış və milli-mənəvi dəyərlər şəklinə düşmüşdür. Təsviri sənət əsərlərimiz də bu gün bizim ən zəngin mənəvi-mədəniyyət nümunələri hesab olunur. Səttar Bəhlulzadənin, Mikayıl Abdullayevin, Maral Rəhmanzadənin, Ömər Eldarovun və başqalarının yaratdıqları tablolar, heykəllər milli-mənəvi mədəniyyətimizin nümunələri hesab olunur. Folklor nümunələri də bunlardan biridir. Ağılar, laylalar, atalar sözləri, məsəllər, xalq hikmətləri, xalq oyunları, mərasimlər, nağıllar, dastanlar, rəvayətlər, mifoloji personajlar mənəvi dəyərlər kimi formalaşaraq milli-mənəvi mədəniyyət nümunələri kimi dövrümüzə qədər gəlib çatmışdır. Klassiklərin yazdıqları əsərlərin hər birində təsvir olunan milli mədəniyyət nümunələri ən zəngin mənəvi dəyərlər kimi yetişən nəslin şəxsiyyətyönlülük səviyyəsinin yüksəldilməsinə daim xidmət edir. Elitar mədəniyyət nümunələri içərisində Azərbaycan xalqının görkəmli sənətkarları tərəfindən yaradılan caz musiqiləri, simfoniyalar, baletlər, operalar, kamera musiqiləri və s. milli-mənəvi mədəniyyətimizin layiqli nümunələri hesab olunur. Heydər Əliyev bütün bu sərvətləri ömrü boyu göz bəbəyi kimi qorumağa çalışmış, gənc nəslin formalaşmasında onlara əsas didaktik vasitə kimi baxmışdır.

Heydər Əliyev mənəvi tərbiyə, mənəvi mədəniyyət məsələlərində ümumdünya dəyərləri ilə yanaşı, Azərbaycan millətinin milli-mənəvi dəyərlərinin təbliğ edilib mənimsənilməsinə də ilkin dərəcəli yer vermişdir. Liderimiz söyləyirdi: *"Gənc nəslimiz milli ruh ilə tərbiyə edilməli, xalqımızın milli-mənəvi dəyərləri əsasında tərbiyə edilməlidir. Gənc nəslimiz xalqımızın tarixini yaxşı öyrənməlidir, keçmişimizi yaxşı dərk etməlidir, dilimizi yaxşı mənimsəməlidir, milli dəyərlərimizi yaxşı öyrənməlidir. Milli dəyərləri, milli adət və ənənələrimizi yaxşı öyrənməyən, tariximizi yaxşı mənimsəməyən gəncdən vətənpərvər çıxmaz. Gənc nəslin hər bir nümayəndəsi vətənpərvər olmalıdır. Vətənpərvərlik ruhu böyük bir anlayışdır. Vətənə sadiqlik, vətəni sevmə, torpağa bağlı olma: budur vətənpərvərlik ruhu"* [4].

Ümummilli lider həyatının mənasını xalqa, Vətənə sədaqətdə görürdü, azərbaycançılığı xalqı birləşdirəcək ən böyük ideologiya kimi qəbul edirdi və onun uğrunda yorulmadan çalışırdı. Xüsusilə uşaqlıqdan hər bir şəxsdə vətənpərvərlik hissinin artması üçün müqayisəyə gəlməz təsəvvürlər canlandırırdı.

Ulu öndərin bizə miras qoyduğu sərvətlər içərisində zəngin nəzəri irsi xüsusi yer tutmaqdadır. Bu irs bizim milli sərvətimizdir. Prof. Ə. Ağayev haqlı olaraq qeyd edirdi: *"...Heydər Əliyev cənablarının çıxışları, nitqləri və məruzələrində irəli sürülən tərbiyəvi baxımdan qiymətli fikirlər tərbiyə işinin həm məzmununu, həm də həyata keçirilmə yollarını müəyyənləşdirir, milli tərbiyə konsepsiyasının müddəalarını ortaya qoyur"* [2]. Ulu öndərin təhsil siyasətinin əsas məzmununu alim onun nəzəri irsinin məzmununda görərək yazırdı: *"Heydər Əliyev genində Vətən eşqi, xalq, millət eşqi, dil eşqi, din eşqi, milli ənənələr sevgisi mühüm yer tutmaq-*

də məqsədini müəyyənləşdirməyib. Ümumi iştirakçıların 17 nəfəri, yəni respondentlərin təxminən 16%-i isə ümumiyyətlə müəllim ixtisasına qəbul olmaq haqqında düşünməyənlər olub və onların 15-i (88.2%) müəllim olmaq haqqında düşünmür. Bu da bizə deməyə əsas verir ki, tələbələrin ixtisası öz istəyi ilə seçib-seçməməsindən asılı olaraq gələcək iş həyatına münasibəti dəyişə bilər.

**İxtisas əhəmiyyəti.** Təhsilalanların oxuduqları ixtisasın perspektivi ilə bağlı fikirləri toplanıb (Cədvəl 1):

| **İxtisasın əhəmiyyəti** | **Say** | **Faizlə** |
|---|---|---|
| 1 | 3 | 2.8% |
| 2 | 6 | 5.6% |
| 3 | 10 | 9.4% |
| 4 | 31 | 29.2% |
| 5 | 56 | 52.8% |

**Cədvəl 1.** İxtisasın gələcək üçün əhəmiyyətlilik səviyyəsi (ən yuxarı 5, ən aşağı 1)

Cədvəldən göründüyü kimi, tələbələrin ümumilikdə 82%-i müəllimlik ixtisası ilə bağlı müsbət fikirdədir və əhəmiyyətlilik səviyyəsini 4 və 5 balla qiymətləndirirlər. Respondentlərin 8.4%-i isə ən aşağı ballarla (1 və 2 bal) öz peşəsini dəyərləndirib. İxtisas haqqında mənfi fikirdə olan iştirakçılar texnologiya, süni intellektin getdikcə inkişafı ilə əlaqədar gələcəkdə müəllimlərə ehtiyac olmayacağı fikrindədirlər. Bu gənclərin müəllimlik haqqında qənaətbəxş olmamalarının səbəblərindən biri də onların müəllimləri sadəcə "bilik bazası" kimi görmələridir.

**Karyera.** Bu kateqoriyada olan suallar vasitəsilə biz tələbələrin gələcəkdə bu istiqamətdə nə qədər uğurlu olub-olmayacaqları ilə bağlı təhlillər aparmışıq. Belə ki, ixtisasında uğur qazanacağına əmin olan tələbələr üstünlük təşkil edir və onların sayı 86-dır (80%). İştirakçıların 20%-i isə bu fikirlə o qədər də razı deyil. Gələcəkdə özünü necə iş yerlərində görməyi planladıqlarını öyrənərək onları 4 kateqoriyaya ayırmışıq: *1)ixtisas üzrə işləmək istəməyənlər, 2) ixtisasa uyğun dövlət təhsil müəssisələrində işləmək istəyənlər, 3)ixtisasına uyğun özəl sektorda işləmək istəyənlər, 4)ümumiyyətlə işləmək istəməyənlər* (Cədvəl 2).

| ***iş istiqaməti*** | ***say*** | ***faiz*** |
|---|---|---|
| özəl sektor | 51 | 48.1% |
| dövlət müəssisəsi | 34 | 32% |
| öz ixtisası üzrə işləmək istəmir | 20 | 18.8% |
| işləmək istəmir | 1 | 0.9% |

**Cədvəl 2.** Tələbələrin planları

Cədvələ əsasən respondentlərin əksəriyyəti (48.1%) gələcəkdə özəl kurs, məktəb, tədris mərkəzlərində işləməyi planlaşdırır. Onların 60.7%-i (31 nəfər) bu ixtisası özü seçənlərdir, digər 20 nəfər(39.2%) isə ixtisasa təsadüfən və ya başqalarının təsiri ilə qəbul olanlardır. Dövlət təhsil müəssisələrində işləmək istəyənlərin sayı özəllə müqayisədə daha azdır (32%). Bu kateqoriyadan olan tələbələrin 73.5%-i (25 nəfər) oxuduğu ixtisası öz istəyi ilə seçib. Ümumilikdə iştirakçıların 18.8%-i (20 nəfər) öz ixtisası istiqamətində karyera qurmağı planlaşdırmır (Cədvəl 2). Maraqlı məqamlardan biri də budur ki, ixtisasını özü seçməyən tələbələr ya həmin sahə üzrə işləmək istəmir, ya da yalnız özəl sektorda karyera qurmağı düşünür (cəmi bir nəfər dövlət məktəbində işləmək istəyir).

Bununla bərabər sorğu iştirakçılarının işə qəbul imtahanlarına olan münasibətlərin öyrənilmiş və 66.9%-nin (71 nəfər) bu barədə müsbət fikirdə olduqları ortaya çıxmışdır. Respondentlərin yalnız 28.3%-i (30 nəfər) işə qəbul imtahanlarının əleyhinədir.

**Təhsilin keyfiyyəti.** Tələbələrin karyera xəyalları, ixtisasla bağlı motivasiyasına təsir edən amillərdən birinin məhz ali təhsilin keyfiyyəti və müəllimlərin səriştələri olduğunu düşünürük. Sorğuda bu fərziyyəmizin nə qədər doğru olduğunu anlamaq üçün əldə olunan müəyyən məlumatları əlaqəli təhlil etməyə çalışdıq.

İşə qəbul üçün universitetlərdə qazanılan biliklərin kifayət edib-etmədiyini müəyyən edərək tələbələrin 77.3%-nin mənfi fikirdə olduğunu öyrəndik. Respondentlərin 82-si bunun üçün əlavə material və hazırlıqlara ehtiyac olduğunu düşünür. Ümumi tələbələrin yalnız 9.4%-i (10 nəfər) universitetdə öyrədilənlərin kifayət olduğunu hesab edir və 13.2% (14 nəfər) isə bu mövzu ilə bağlı ümumiyyətlə məlumatlı deyil.

Tələbələrin 66%-i öyrəndikləri biliklərin tətbiqə yararlı olduğunu düşünsələr də, 33.9-i bununla həmfikir deyil. İşə qəbul və biliklərin yararlığı ilə bağlı verilən cavablar arasındakı ziddiyyətlər onu deməyə əsas verir ki, işə qəbul imtahanlarının tələbləri və ali təhsil müəssisələrinin tələbələrə öyrətdikləri biliklər arasında uyğunsuzluq mövcuddur. Bu da onu göstərir ki, universitet proqramları və imtahan tələblərinin qarşılıqlı araşdırılması gələcəkdə tədqiq edilməli əsas mövzulardandır.

Müəllimlərin dərs keyfiyyəti və tədris bacarıqlarının tələbə motivasiyasına təsiri də qaçılmazdır. Belə ki, respondentlərin 13.2% (14 nəfər) müəllimlərin müasir yanaşma və metodlardan istifadə etmədiyini düşünür. Onların 12-si (85.7%) buna görə də əldə edilən bilikləri tətbiqə ümumiyyətlə yararsız hesab edir. 42.4% tələbə isə müəllimlərin yeni metodlardan tam peşəkarlıqla istifadə etmədiyi qənaətindədir. 44.3% respondent isə müəllimlərin keyfiyyəti barəsində yüksək fikirdədirlər.

Müəllimlərin rəqəmsal bacarıqları ilə bağlı da fikir ayrılıqları mövcuddur. Burada təhsilverənlərin bacarıqları ilə bərabər təhsil müəssisələrinin imkanları ilə də tanış olmuş oluruq (Qrafik 2).




**Qrafik 2.** Müəllimlərin rəqəmsal bacarıqlarından məmnunluq səviyyəsi(faizlə)

Diqqət çəkən məqamlardan biri də ali təhsil müəssislərinin cari imkanları ilə bağlıdır. Belə ki, tələbələrin 37.7%-i (40 nəfər) universitetdə müasir rəqəmsal texnologiyaların olmadığı və ya işləmədiyi qənaətindədir. 18.8% (20 nəfər) respondent isə müəllimlərin mövcud avadanlıqlardan peşəkar istifadə etmədiyi fikrindədir. Qeyd edək ki, bu mövzuda narazı tələbələr müəllimləri metodik cəhətdən də peşəkar hesab etmir və ümumilikdə onların 85%-ni təşkil edir. 43.3 % (46 nəfər) bu fikrin əksinə müəllimlərin səriştə və bacarıqlarından razılığını bildirmişdir.

Dərs formatı ilə bağlı verdiyimiz sualdan aydın olur ki, müəllimlərin əksəriyyəti dərsləri interaktiv formada həyata keçirməyə çalışır və tələbələr mövcud problemlərlə bağlı sərbəst fikirlərini səsləndirə bilirlər (51 nəfər). Mühazirə və seminar formatında həyata keçən dərslər isə ikinci ən çox verilən cavablardandır (44 nəfər). 37 respondent müəllimlərin tələbələrin tədqiqat, araşdırmalara cəlb etdiyini və onlara real

nümunələr üzərindən problemlərə yanaşmağa çağırdığını deyir. Çox az tələbə (16 nəfər) müəllimlərin real konteksti müşahidə etməyə, simulyasiyalar təşkil edərək öz biliklərini tətbiq etməyə şərait yaratdığı fikrindədir.

**Problemlər.** Müəllim kimi formalaşmaqda respondentlərin qarşısında yaranan problemləri öyrənmək üçün onlara açıq sual ünvanlanmış və yaxın cavablar 6 kod üzrə toplanmışdır (Cədvəl 3):

| kodlar | n | nümunələr |
|---|---|---|
| **Tədris** | 26 | • Dərslərin ağırlığı bəzi fənlərin mənasızca keçirilməsi.<br>• Universitetdə pedaqogika dərslərinin sıxıcı keçirilməsi.<br>• Tam olaraq ixtisas fənlərinə yetəri önəmin verilməməsi<br>• Universitetimizdəki təchizatların azlığı deyərdim. Çünki biz də gələcəyin müəllimləri olacağıq və İKT bacarıqlarmızı genişləndirməyimiz vacibdir. |
| **Müəllim peşəsinə münasibət** | 7 | • Müəllim peşəsinə göstərilən hörmət və əmək haqqı.<br>• Maaşı azdı, yaxşı müəllim olmaq üçün sərf edilən əziyyət qarşılığında o qədər dəyər verilmir. |
| **Imkanlar/təcrübə** | 15 | • Universitetdə yetərincə təcrübələrin aparılmaması, bəzi cihazların, mikroskop və digər cihazların doğru-düzgün işləməməsi, preparatların lazımınca olmaması.<br>• Maddi problemlərlə qarşılaşıram, hansı ki əlavə kurslara gedib xarici dil öyrənmək və ya ixtisasıma uyğun elmi seminarlarda iştirak etmək istəyirəm. |
| **Şəxsi xüsusiyyətlər** | 6 | • Əsasən özümü ifadə edə bilməmək<br>• Nitqimin istədiyim qədər yaxşı olmaması |
| **İşə qəbul** | 7 | • Çox müəssisədə təcrübə tələb edirlər<br>• Tələbə olaraq işə qəbul olunmamağımız, hər yerdə təcrübə tələb edirlər. Lakin heç yerdə işləməyən biri necə təcrübəli ola bilər?<br>• İşə qəbulun çətinliyi |

**Cədvəl 3.** Müəllim kimi formalaşmaqda üzə çıxan problemlər

Cədvəldən göründüyü kimi tələbələrin motivasiyasının aşağı olmasının əsas səbəbi ali təhsil müəssisələrində aparılan tədris prosesində mövcud çatışmazlıqlardır. Tələbələrin əksəriyyəti ixtisas fənlərinin keyfiyyətindən narazıdır və qeyri-ixtisas fənlərin ağırlığından narazıdır. Eləcə də, universitetlərin müasir rəqəmsal texnologiyalarla təchiz edilməməsi dərs prosesinin keyfiyyətinə təsir edən amillərdəndir.

Tələbələrin həvəsdən düşməsinə təsir edən digər ən çox səsləndirilən səbəb isə təcrübə və universitetin digər imkanları ilə bağlıdır. Tələbələr pedaqoji təcrübə müddətinin kifayət etmədiyi və əldə olunan nəzəri biliklərin tətbiq etmək üçün uyğun şəraitin olmadığı fikrindədir.

Respondentlərin peşə motivasiyasını aşağı salan digər iki səbəb isə müəllimlik sənətinə olan mənfi münasibət, stereotiplər və işə qəbul prosesinin çətinliyidir. İştirakçılar müəllimlərin işinə dəyər verilmədiyini və əmək haqqının işin çətinliyi ilə müqayisədə aşağı olduğunu bildirir. Tələbələri narahat edən digər məqam isə işə qəbul prosesinin mürəkkəb və ağır olması, eləcə də işə götürənlərin qarşı tərəfə qoyduğu gözləntilərdir. Bir çox iş yerlərinin tələbələrdən təcrübə tələb etməsi onların həvəsdən düşməsinə səbəb olur.

Tələbələrin müəllimlik kimi formalaşmasında üzə çıxan problemlərdən ən sonuncusu onların çatışmayan şəxsi keyfiyyətləridir. Belə ki, tələbələrin bir qisminin özgüvənin aşağı olmasına səbəb onların səbirsiz olması, özünü və fikirlərini tam, dolğun şəkildə ifadə edə bilməməsidir.

**Nəticə.** 106 nəfər bakalavr tələbəsi ilə aparılan sorğuda respondentlərin pedaqoji ixtisaslara yönəlməsinin səbəbləri ilə bərabər müəllim kimi formalaşmaqda qarşılarına çıxacaq problemlər araşdırılıb. Bu maneələrin tələbələrin peşə motivasiyasına, eləcə də gələcək karyera ilə bağlı planlarına, proqnozlarına təsir etdiyini müəyyən etmiş olduq.

Müəllimlik ixtisasını istəksiz şəkildə oxumalı olan tələbələrin əksəriyyəti həmin ixtisaslar üzrə karyera qurmaq istəmir. Səhv ixtisas seçimlərinin edilməsində sosial amillərin və qəbul imtahanlarının nəticələrinin rolu var.

Respondentlər ixtisaslarının gələcək əhəmiyyətliliyi barəsində müsbət fikirdədirlər. İxtisasın sevməyərək seçilməsi müəllimliyin tələbələr tərəfindən perspektivsiz peşə kimi qəbul etməsinə səbəb deyil.

Pedaqoji istiqamətdə karyera qurmaq istəyənlərin böyük əksəriyyəti özəl sektorlarda iş qurmaq haqqında düşünürlər. Respondentlərin böyük qismi dövlət imtahanlarının lehinə olduğundan özəl sektorda iş qurmaq istəyən tələbələrin bu seçimi etmə səbəblərinin daha dərindən tədqiq edilməsini zəruri edir.

Tədrisin keyfiyyəti və ali təhsil müəssisəsinin infrastrukturu, müəllimlərin dərsə hazırlıq səviyyəsi, metodikası və rəqəmsal bacarıqları tələbələrin peşə motivasiyasına təsir edən əsas amillərdir. Həmçinin pedaqoji təcrübə imkanlarının qısa müddətli və məhdud imkanların olması respondentləri həvəsdən salan ikinci əsas səbəbdir. Mövcud stereotip, müəllim peşəsinə yanaşma, işə qəbul üçün qoyulan ağır və qeyri-mümkün tələblər də tələbləri gələcəkləri barədə qayğılandırır.

**Problemin aktuallığı.** Motivasiya mövzusu həyatımızın hər sahəsini əhatə etdiyi kimi təhsil sistemində də bu mövzuya geniş yer verilir. Tələbələrin müxtəlif problemlərlə və diqqəti yayındıran amillərlə üzləşdiyi bugünkü dinamik təhsil mənzərəsində motivasiyanın gücləndirilməsi və davam etdirilməsi həmişəkindən daha vacibdir. Şagird və ya tələbənin nailiyyət qazanmasında motivasiyanın önəmli yeri vardır. Tədqiqatlar motivasiya və nailiyyət arasında güclü müsbət əlaqə olduğunu göstərir. Bu baxımdan gələcəyin müəllim namizədlərinin motivasiya səviyyələrinin nədən asılı olduğunu və onlara nəyin təsir etdiyini araşdırmaq və bu istiqamətdə tədqiqatlar aparmaq təhsilin gələcəyi və keyfiyyəti üçün çox zəruridir.

**Problemin elmi yeniliyi.** Müəllim hazırlığı proqramları ənənəvi olaraq pedaqoji texnikalara və fənn üzrə təcrübəyə diqqət yetirsə də, bu kontekstdə motivasiyanın əhəmiyyəti çox vaxt lazımi səviyyədə qiymətləndirilmir. Ölkəmizdə də bu sahədə tədqiqatlar azlıq təşkil edir. Məqalədə ilk dəfə olaraq müəllim namizədlərinin motivasiyası bir neçə aspektdən araşdırılaraq tədqiq edilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə verilən məlumatlar, motivasiyanın tələbələrin ixtisas seçiminə, peşə həyatına, ümumilikdə təhsil sisteminə təsirini bir daha əsaslandıracaq, bu sahədə aparılan araşdırmalara töhfə verəcəkdir. Müəllimlik peşəsində təhsil alan tələbələrin motivasiyasını başa düşməyin vacibliyi fərdləri təhsildə karyera qurmağa sövq edən amilləri dərk etməkdən ibarətdir. Təhsil müəssisələri, siyasətçilər və bütövlükdə cəmiyyət bu motivlər haqqında fikir əldə etməklə, pedaqoq olmaq istəyənləri daha yaxşı dəstəkləyə və tədris və öyrənmə keyfiyyətini artıra bilər. Həmçinin məqalənin məzmunu və əsas nəticələrindən ali məktəbdə pedaqogikadan mühazirə və seminar məşğələlərində, kurs, buraxılış işləri, referat və müstəqil işlərin yazılmasında istifadə oluna bilər.

**Ədəbiyyat:**


1. ACAT, M. B., & Yenilmez, K. (2004). Eğitim fakültesi öğrencilerinin öğretmenlik mesleğine ilişkin motivasyon düzeyleri. *Manas Üniversitesi Sosyal Bilimler Dergisi*, *6* (12), 125-139.
2. Akbaba, S. (2006). Eğitimde motivasyon. *Atatürk Üniversitesi Kazım Karabekir Eğitim Fakültesi Dergisi*, (13),s. 343-361.
3. CEP- Center on Education Policy. (2017). What is motivation and why does it matter? New York: Center Education Polisy Publications
4. Dereli, E., & Acat, M. B. (2010). Okul öncesi eğitim öğretmenliği bölümü öğrencilerinin motivasyon kaynakları ve sorunları. *Selçuk Üniversitesi Sosyal Bilimler Enstitüsü Dergisi*, (24), s. 173-187.
5. Məmmədova, L. (2023) Tələbələrdə Təlim Motivasiyasının Formalaşmasında Layihə Əsaslı Tədrisin Əhəmiyyəti. //Akademik Tarih ve Düşünce Dergisi, 10 (2), - s. 498-507.
6. Sadıqova, F. (2021) Təhsildə Motivasiya və Özünəinamın Formalaşdırılması. // Azərbaycan məktəbi № 3, - s. 86-94
7. Stirling, D. (2013). Motivation in education. *Aichi Universities English Education Research Journal*, *29*(2013). -72.
8. Taimalu, M., Luik, P., Kantelinen, R., & Kukkonen, J. (2021). Why they choose a teaching career? Factors motivating career choice among estonian and finnish student teachers. *TRAMES: A Journal of the Humanities & Social Sciences*, *25*(1).


**E-mail:**nargizmukhtarli@gmail.com

**Redaksiyaya daxil olub:** 24.06.2024

*UOT: 37.0*

***Ramiz Calal oğlu Əliyev***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi,*
*pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0009-0000-2707-1018*
*https://doi.org/10.69682/azrt.2024.91(3).31-36*

# TƏHSİLDƏ XXI ƏSR BACARIQLARI: DÜNƏNİMİZ, BU GÜNÜMÜZ

***Рамиз Джалал оглы Алиев***
*преподаватель Азербайджанского Государственного Педагогического Университета,*
*доктор философии по педагогике*

# УМЕНИЯ XXI ВЕКА В ОБРАЗОВАНИИ: НАШ ВЧЕРАШНИЙ, СЕГОДНЯШНИЙ ДЕНЬ

***Ramiz Jalal Aliyev***
*the teacher at Azerbaijan State Pedagogical University, doctor of philosophy in pedagogy*

# 21st CENTURY SKILLS IN EDUCATION: OUR YESTERDAY, TODAY

**Xülasə.** “Təhsildə XXI əsr bacarıqları: dünənimiz, bu günümüz” adlı məqalədə öyrənənlərin gələcək dövrün tələblərinə cavab verməsi, qlobal rəqabətə daha yaxşı hazırlanması üçün bugünkü təhsil sisteminin transformasiyaya olan ehtiyacı müzakirə edilir. Məqalədə tənqidi düşünmə, yaradıcı düşünmə, analiz bacarığı, problem həll etmə, kommunikasiya bacarıqları, komanda ilə iş, əməkdaşlıq, çoxyönlü biliklərin idarə edilməsi və texnologiyadan istifadə kimi gərəkli olan XXI əsr bacarıqlarının əhəmiyyəti vurğulanır. Həmçinin qeyd olunur ki, təhsildəki bu dönüşüm sadəcə biliklərin ötürülməsi ilə deyil, öyrənənlərin təfəkkür və tətbiqetmə bacarıqlarının inkişafına önəm verən bir yanaşma təqdim etməlidir. Məqalədə öyrənənlərin karyera dünyasının dəyişən tələb və ehtiyaclarına cavab verən mütəxəssis olaraq yetişdirilməsi üçün təhsil sistemindəki yeniliklərə fokslanmaq hədəflənir. “Təhsilalanların XXI əsr bacarıqları: ənənə avə müasirlik” öyrənənləri gələcəyin liderləri kimi hazırlamaq üçün təhsildə paradiqma dəyişikliyini dəstəkləmək baxımından əlverişlidir.
***Açar sözlər:*** *XXI bacarıqları, öyrənən, öyrədən, inkişaf, yenilik, rəqabət, uyğunlaşma.*

**Резюме.** В статье «Умения XXI века в образовании: наш вчерашний, сегодняшний день» повествуется о необходимости преобразования современной системы образования, чтобы лучше подготовить студентов к требованиям будущей и глобальной конкуренции. В статье подчеркивается важность основных умений XXI века, таких как критическое мышление, творческое мышление, аналитические умения, решение проблем, коммуникативные навыки, работа в команде, сотрудничество, междисциплинарное управление знаниями и использование технологий. Также отмечается, что эти преобразования в образовании требуют появления подхода, который подчеркивает развитие мышления и прикладных умений обучающихся, а не просто передачу знаний. Цель статьи - сосредоточить внимание на инновациях в системе образования, чтобы подготовить студентов как специалистов, отвечающих меняющимся требованиям и потребностям мира карьеры. Программа «Навыки обучаемых XXI века века: традиции и современность» призвана поддержать смену парадигмы в образовании, чтобы подготовить обучающихся к роли лидеров будущего.
***Ключевые слова:*** *умения XXI века, обучающийся, обучающий, развитие, инновации, конкуренция, адаптация*

**Summary.** The article "21st century skills in education: our yesterday, our today" discusses the need to transform today's education system to better prepare students to meet the demands of the future and compete globally. The article emphasises the importance of essential XXI century skills such as critical thinking,

creative thinking, analytical skills, problem solving, communication skills, teamwork, collaboration, multidisciplinary knowledge management and use of technology. It is also stated that this transformation in education requires the emergence of an approach that emphasises the development of learners' thinking and application skills, rather than merely transferring knowledge. The article aims to focus on innovations in the education system in order to train students as specialists who meet the changing demands and needs of the career world. XXI century skills of learners: tradition and modernity.

***Keywords:*** *XXI century skills, learning, teaching, development, innovation, competition, adaptation.*

Hazırda Azərbaycan xalqı öz dövlət müstəqilliyini qazandıqdan, onu əbədi və dönməz etdikdən sonra iqtisadi, sosial, siyasi, elmi və təhsil kimi kateqoriyaların hamısına münasibətdə dünya, Avropa-Amerika sisteminə, onların standartlarına yaxınlaşmağa, onlara inteqrasiya etməyə başlamışdır. Unutmayaq ki, Azərbaycan xalqı öz ulu öndərinin bacarığı və çevik siyasəti ilə öz kökündən, əsasından ayrılmadan, analoji və təkamül yolu ilə yeniləşmiş və inkişaf etmişdir. Bu yeniləşmə təhsil sistemində də aşkar şəkildə özünü göstərməkdədir. Ümumilli liderimiz Heydər Əliyev təhsilin inkişafından bəhs edərkən demişdir: Təhsil sistemimiz xalqımızın gələcək inkişafın təmin etməlidir. Buna görə də Avropayönlü inkişaf yolu tutmuş respublikamız köhnə ənənələrin üzərindən qələm çəkmədən inteqrasiyaya üstünlük verməkdədir.

Reallıq ondan ibarətdir ki, hazırda təhsil islahatı üzrə dövlət proqramının həyata keçirilməsi təhsil sisteminin təkmilləşdirilməsi, idarəetmə, təlim-tərbiyə işi keyfiyyətinin artırılması, ənənəvi milli-mənəvi dəyərlərlə yanaşı qabaqcıl dünya təcrübəsinin öyrənilərək uyğun gələnlərin təhsil sferasında tətbiqi istiqamətindən mütərəqqi xarakterli tədbirlər həyata keçirilməkdir.

Sirr deyil ki, keyfiyyətli təhsil cəmiyyətin inkişafına təkan verən aparıcı qüvvədir.

Elm və texnikanın, o cümlədən, informasiya texnologiyasının sürətlə inkişaf etdiyi bir dövrdə rəqəmsal təhsilin əhəmiyyətli amil kimi önə çəkilməsi, distant təhsilin təşkili və tətbiqinin vacib faktora çevrilməsi diqqəti cəlb etməkdədir.

Unutmayaq ki, elmi-texniki nailiyyətləri, yüksək intellektuallığı ilə səciyələnən müasir dövr səriştəyə əsaslanan çağdaş təhsil sistemi qarşısında çox yüksək tələblər qoymuşdur: yeni dövrün məktəblisi özünü sürətli inkişafın gətirdiyi yenilikləri qavramağa, anlamağa hazırlaya bilməlidir. Bunun üçün o, məntiqi, tənqidi, yaradıcı təfəkkürə və yeniləşən texnologiyalardan istifadə bacarığına malik olmalıdır.

Respublikamızda aparılan təhsil islahatının əsas qayəsini, müstəqil, yaradıcı düşünən şəxsiyyət və vətəndaş yetişdirmək təşkil edir. Bəli, müstəqil və yaradıcı düşünmənin təməli təlim prosesində qoyulur, inkişaf etdirilir. Məhz bu baxımdan ümumtəhsil məktəblərində uğurla tətbiq edilən yeni təhsil proqramlarının (kurikulumların) əsas səciyyəvi cəhətlərindən biri də onun şəxsiyyətyönlü olmasıdır. Fənnin məzmununu təşkil edən məzmun standartlarının bilik, bacarıq və vərdişlərdən ibarət olması, fəaliyyətin növlərinin idraki, psixomotor, emosional, tətbiqi təhsilalanlarda məntiqi, tənqidi və yaradıcı təfəkkürün, ünsiyyət və hərəki bacarıqların inkişafına təkan verir .Zənnimizcə, fəaliyyətin növlərinin taksonomik quruluşa malik olması təlim prosesinin səmərəli təşkilinə imkan yaradır. Məhz XXI əsrin öyrənmə bacarıqları çərçivəsində problem həll etmə bacarıqlarının inkişafında paralel olaraq təhsil taksonomiyalarından istifadə məqsədəuyğun nəticələrin əldə edilməsinə real zəmin yarada bilər.

Müasir dövrdə bütün sahələrdə baş verən dəyişikliklər sürətli inkişaf prosesləri fərdlərin bu dəyişikliklərə uyğunlaşmasını tələb edir. Fərdlərin bir şəxsiyyət kimi formalaşdıqları təhsil sahəsi də bu dəyişimlərdən müəyyən mənada təsirlənir. XXI əsr öyrənənlərinin dünyəvi rəqabətlə ayaqlaşa bilməsi üçün sahib olması gərəkən bacarıqlar mövzusunda bir çox araşdırmalar aparılmışdır. XXI əsrdə dəyişən və yenilənən mühit şərtlərinə uyğunlaşa bilmək və hətta bu dəyişikliklərə yön vermək, rəhbərlik etmək üçün yaşadıqları çağı dərk edə bilən, cəmiyyətin ehtiyaclarını düzgün təhlil etməyi bacaran, yenilikçi düşüncəyə malik, məlumatları asanlıqla və tez əldə edə bilən, ən əsası isə ömürboyu öyrənməni həyat tərzinə çevirə bilən öyrənənlər - şəxsiyyətlər yetişdirilməlidir. Bu məqamda, şübhəsiz ki, təhsil sistemi də XXI əsr bacarıqlarının inkişaf etdirilməsinə istiqamətlənməlidir [6].

Müasir dövrdə işəgötürənlərin bir işçidə daha çox axtardığı bacarıq növü yumşaq bacarıq-

lardır. Financial Times tərəfindən həyata keçirilən sorğu nəticələrinə əsasən, onları aşağıdakı keyfiyyətlər maraqlandırır: strateji düşünə bilmək, başqalarına təsir göstərməyi bacarmaq, komanda ilə işləmək, kompleks problemlərin öhdəsindən gələ bilmək, işləri nizama sala bilmək, prioritetləri müəyyənləşdirmək, öyrənərkən başqalarını da öyrətmək, tabeçilikdə olan fərdlər üçün kouç ola bilmək, hadisələri analiz etmək, vaxtı və emosional davranışları idarə etmək bacarıqları (2).

XXI bacarıqları özündə fərdlərin sahib olduqları biliyin məzmunundan daha çox həmin bilikdən necə istifadə edə biləcəyi ilə bağlıdır. Başqa sözlə, sözügedən bacarıqlar mahiyyətcə öyrənənlərin tədris prosesi zamanı öyrəndikləri əsas sahələrdə (məsələn, riyaziyyat, humanitar elmlər, təbiət elmləri, ictimai elmlər və s.) fənlər üzrə funksionallıq qazanmaq üçün istifadə etdikləri bacarıqların məcmusudur. Bu baxımdan XXI əsr bacarıqlarının bir sıra əsas xüsusiyyətlərə sahib olduğunu deyə bilərik. Bu bacarıqlar birbaşa konkret mövzu, səciyyəvi sahə ilə birbaşa əlaqəli deyil, bir çox sahələrlə bağlıdır. Bilik, bacarıq və davranışlar da daxil olmaqla mürəkkəb struktur nümayiş etdirir və kompleks problemləri vaxtında görməyə, öhdəsindən gəlməyə şərait yaradan yüksək səviyyəli bacarıqlarla bağlıdır. XXI əsr bacarıqları hal-hazırkı dövrdə biliyə əsaslanan iqtisadiyyatların ortaya çıxardığı tələblər səbəbindən zəruriliyi və əhəmiyyəti yenidən vurğulanan bacarıqlardır. Daha aydın şəkildə desək, sözügedən bacarıqların bir çoxu meydana yeni çıxan bacarıqlar deyil, təkrarən vacib hala gələn bacarıqlardır. Məsələn, tənqidi düşünmə və problem həll etmə kimi həyati önəmə sahib bacarıqlardan hər zaman – ibtidai alətlərin, vasitələrin hazırlanmasından tutmuş iqtisadi, siyasi, mədəni təkmilləşməyə qədər hər şeydə istifadə edilmişdir. Hal-hazırda önəmli sayılan bacarıqlar vaksinlərin kəşfindən tutmuş dənizlərin kəşfinə qədər yaşam boyu bəşəriyyətin tərəqqisində hər zaman çox mühüm olmuşdur. Əslində, öyrənmə və innovativlik bacarıqlarına olan bu ehtiyaclar Sokrat və Sofistlərə qədər gedib çıxır. Amma bunu da qəbul etmək lazımdır ki, indiki informasiya dövrünə məxsus bəzi bacarıqlar var. Məsələn, öyrənənlərin texnologiyanın təkamülü ilə ayaqlaşmaq məqsədilə ömürboyu öyrənən olma ehtiyacını qəbul etmələri son dərəcə vacibdir.

XXI əsr bacarıqlarının inkişaf etdirilməsinin önəmini aşağıdakı başlıqlarla ifadə etmək mümkündür:

Dəyişən iş dünyası və tələblər: XXI əsr texnoloji inkişafın sürətləndiyi və qlobal əlaqələrin artdığı bir dövrdür. İş dünyası tədricən mürəkkəbləşir və bu baxımdan işi nəzəri cəhətdən bilməklə yanaşı, çeviklik, ünsiyyət, yaradıcılıq, adaptasiya, tənqidi düşünmə, problem həll etmə, təhlil və analiz kimi bacarıqlara ehtiyac yaranır.

Sosial və mədəni müxtəliflik: Qloballaşma vasitəsilə müxtəlif mədəniyyətlərlə qarşılıqlı əlaqə və mədəniyyətlərarası kommunikasiya bacarıqları getdikcə daha da önəm kəsb edir. Bu bacarıqların inkişafı öyrənənlərə qlobal dünyada səmərəli fəaliyyət göstərməyə imkan verir.

Fərdi və sosial rifah: XXI əsr bacarıqlarının inkişafı öyrənənlərin karyera sahəsində qazandıqları uğurlarla yanaşı, ümumi rifahına da təsir göstərir. Bu bacarıqlar öyrənənlərə şəxsi məqsədlərə nail olmaq və daha anlamlı həyat tərzi üçün dəstək olur.

Texnoloji inkişaflar: Rəqəmsal transformasiya, proseslərin avtomatlaşdırılması, süni intellekt kimi texnoloji kəşflər öyrənənlərdən texnologiya ilə qarşılıqlı əlaqə qurma bilmək bacarığını və səmərəli istifadəni tələb edir.

Ömürboyu öyrənmə: XXI əsrin bacarıqlarına öyrənməyi öyrənmək bacarığı da daxildir. Sürətlə dəyişən informasiya və texnologiya mühitində öyrənənlərin öyrənmə ehtiyacının hər bir sahədə, hər bir zaman mövcud ola biləcəyini anlamaq, öncəki biliklərlə yetinməmək, öyrənməni davamlı olaraq həyata keçirmək və özlərini təkmilləşdirmək qabiliyyəti vacibdir.

Bütün bunlarla yanaşı qeyd etmək olar ki, qlobal dəyişikliyin mövcud olduğu bir zamanda bu gün digər ölkələrdən geri qalmamaq, dayanıqlı rəqabətə uyğunlaşa bilmək üçün öyrədənlərin yenidən formalaşan və dəyişən ehtiyaclara uyğun olaraq özlərini yeniləyə bilmələri, sonra isə bu şərtlərə müvafiq formada öyrənənlərin yetişdirilməsi zəruridir. Bu prosesdə öyrənənlərin planlı təhsilə daxil edilmələri də əsas şərtlərdəndir [1].

Öyrənənlərin məlumatları düzgün əldə bilməsi deyil, düzgün məlumatları əldə etməsi, biliyi formalaşdırması və ondan yeni biliklər inşa etmək üçün istifadə etməsi önəmlidir. XXI əsrin öyrənmə bacarıqları beynəlxalq arealda rəqabətə davamlı olmaq üçün mühüm funksiyaya malikdir.

İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatı (OECD) da XXI əsrin tədrisinə və bacarıqlarına böyük diqqət yetirir. Bu kontekstdə XXI əsr öyrənənlərinin xüsusiyyətlərinin araşdırılması zamanı müəyyənləşdirilmiş nüansları qeyd etmək olar. Bu xüsusiyyətlər mədəni və sosial dəyərlərdəki mövcud dəyişikliklər, koqnitiv xüsusiyyətlər, tədris və öyrənmə gözləntiləri kimi sıralanır. İƏİT informasiya cəmiyyətində meydana çıxan koqnitiv xüsusiyyətlərin əvvəlki nəsillərdən fərqli olaraq dəyişik ehtiyac və keyfiyyətlərə malik olduğunu bildirir. Yeni nəslin (və ya XXI əsr öyrənəninin) öyrənmə prosesindəki alternativ idraki xüsusiyyətləri sırasında çap oluna bilməyən rəqəmsal qaynaqlardan məlumat əldə etmək, vizuallığa, səsə və hərəkətə üstünlük vermək, çoxsaylı tapşırıqları yerinə yetirmək bacarığı qeyd oluna bilər [4]. Bir sözlə, XXI əsrdə öyrənənlərdə görünməsi istənilən – yaşadıqları dövrün mövcud problemlərinə həllyönlü yanaşa bilmələri, daha keyfiyyətli bir həyat yaşaya bilmələri üçün lazım olan bütün bacarıqları özündə ehtiva edə bilməsidir.

Müasir dövrün ən əhəmiyyətli və başlıca bacarıqlarına aşağıdakıları aid etmək olar:

Yaradıcı düşüncə: Yaradıcılıq stereotiplərə qarşı çıxa bilmək və sınaqdan keçirilmiş təcrübələrə meydan oxumaqdır. Qəliblərdən çıxmaq üçün mövcud boşluqları görə bilmək, onlar haqqında məhsuldar düşünmək, yaradıcı fərziyyələr qurmaq və lazım gəldikdə sınamaq, dəyişdirməkdir [3]. Yaradıcı düşüncəyə sahib olan öyrənənlər problemlərə digərlərinin görə bilmədiyi tərəfdən yanaşa bilənlərdir. Bu öyrənənlərin kəşf etdikləri çözümlər standartlardan fərqlidir və bu öyrənənlər təkmil özgüvənə sahib, risk ala bilən, dəyişiklikləri sevən şəxslərdir.

Tənqidi düşüncə: Tənqidi düşünə bilən öyrənən aldığı informasiyadakı ziddiyyətləri aradan qaldıraraq ardıcıl yanaşmanı mənimsəyə bilir. Çıxardığı nəticələri öz təcrübələrindən faydalanaraq başqa duruma transfer edə bilir [7].

Tənqidi düşünmə bacarığı həmçinin mediadan, insanlardan və internetdən gələn mesajları düzgün başa düşməyə imkan verir. Beləliklə, fərd özünü informasiya yanlışlığından və mənfi istiqamətləndirmədən qoruyur [5].

Problem həll etmə bacarığı: Bu bacarıq hər zaman aktual olsa da, XXI əsrdə fərdin – öyrənənin mövqeyinə münasibətdə problem həll etmə bacarığı ilk növbədə şəxsiyyətin rifahını və dincliyini təmin etməyə yönəlib. Bundan əlavə, qloballaşma vasitəsilə dünyanın istənilən nöqtəsində yaranan problemlər daha tez universal ölçülərə çata bilir. Dar bir mühitdə baş verən problemlər qısa bir zamanda bir çox mühitə təsir edə bilər [5].

Ünsiyyət: Təhsil sistemində öyrənmə və öyrətmə məqsədilə həyata keçirilən, demək olar ki, bütün fəaliyyətlər ünsiyyətlə bağlıdır. Fərdlərin qarşılıqlı təsirindən yaranan ünsiyyət bütün koqnitiv, affektiv, psixomotor davranışları özündə ehtiva edir [1]. Ünsiyyət qura bilən öyrənənlər özünə inamı yüksək, komanda işində uğur qazanan, paylaşıma açıq, problemlərə həssasdırlar.

Adaptasiya bacarığı: Uyğunlaşma bacarığı, çeviklik öyrənənlərə sürətli dəyişikliklərlə ayaqlaşmaq imkanı tanıyır. Dəyişiklikləri başa düşmək və onlardan səmərəli istifadə etməyə, yalnız öz uğurlarına deyil, həm də yaşayıb-çalışdıqları icmalar üçün daha effektiv lider olmağa və qatqı təmin etməyə şərait yaradır.

Stress və çətinliklərlə başa çıxma: Bu bacarıqlar öyrənənlərə təkcə akademik sahədə deyil, həm də həyatın müxtəlif sahələrində qarşılaşılan çətinliklərin öhdəsindən gəlmək üçün gərəkli inam və möhkəmlik verir [6]. Stressin öhdəsindən gəlmək və çətinliklərlə üzləşmək bacarığı öyrənənlərin gələcək həyatlarında daha dözümlü fərdlər olmasına şərait yaradır.

"XXI əsr bacarıqları" termini günümüzdə tez-tez səslənsə də, əslində bu bacarıqların əksəriyyəti yeni olaraq meydana çıxmayıb, sadəcə dörd əsas səbəbə görə günümüzdə yenidən əhəmiyyət və dəyər qazanıb.

1. PISA, PIRLS, ICILS, TIMSS kimi beynəlxalq şagird qiymətləndirmə tədqiqatlarında fənn bilimləri, riyaziyyat, yaradıcı düşüncə, kompüter savadlılığı, oxu bacarıqları üzrə göstərilən zəif nəticələr öyrənənlərin məktəblərdə dərs zamanı əldə etdiyi əsaslı bilikləri real həyati situasiyada tətbiq edə bilməmələrinin nəticəsidir. Bu, onların adaptasiya prosesində çətinlik çəkdiyini bildirir [2]. Vəziyyət onu göstərir ki, heç də bütün fərdlər təlim-tədris prosesi boyunca XXI əsrdəki sürətlə dəyişən dünyaya hazır olmaq üçün gərəkli hesab olunan əsas bacarıq və vərdişləri əldə edə bilmirlər. Buna görə də, bilik və nəzəriyyədən daha çox bacarıq və səriştələrin dəyərləndirilməsinə əsaslanan beynəlxalq

qiymətləndirmələrin strukturu dünya ölkələri üçün həm təhsil siyasətlərinin növbəti addımlarını, prioritetlərini müəyyən etmək, həm də təhsil proqramlarını XXI əsrin bacarıqlarını ehtiva edəcək şəkildə tranformasiya etmək üçün vacibdir.

2. İnformasiya cəmiyyətinin tələb etdiyi iş növlərindəki sürətli dəyişiklik və yeniliklər iş yerlərində mürəkkəb problemləri həll etmək üçün effektiv ünsiyyət qurmaq, biliyi istehsal etmək, istifadə etmək və paylaşmaq, yeni çağırışlara uyğunlaşmaq kimi bacarıqların önə çıxmasına səbəb olmuşdur. Bunlarla yanaşı, qlobal bazarda tələb və təkliflər fərdlərdən gələcəyin hələ mövcud olmayan peşələrinə hazırlanmaq üçün müəyyən bacarıqlara yiyələnmələrini vacib hala gətirir [3]. Bu bacarıqlar daha çox əməkdaşlıq tələb edən biznes sahələrində komanda işi, ahəngdar iş, çeviklik, adaptasiya və məhsuldarlıq kimi XXI əsr bacarıqlarını özündə ehtiva edir.

3. XXI əsr bacarıqları bir dünya vətəndaşı kimi fərdlərin öz hüquq və vəzifələrini dərk edən, cəmiyyətə sağlam şəkildə təkcə lokal səviyyədə deyil, həmçinin qlobal arealda töhfə verə bilən, onların dayanıqlılığı və davamlılığını təmin edə bilən, mülahizələrini ictimaiyyətlə paylaşa bilən şəxsiyyətlərə çevrilməkdə kömək edir [7]. Bunlarla yanaşı, şəxslərin tənqidi və yaradıcı düşünə bilən vətəndaş kimi yetişdirilməsi onlara sosial problemləri şərh edə bilmək, həll yolları təklif etmək, xəbərləri təhlil etmək, qərəzsiz, obyektiv və şəffaf qiymətləndirmələr aparmaq və daha səmərəli seçimlər etmək imkanı verəcəkdir.

4. Nəhayət, qloballaşmış miqrasiya, beynəlxalq münasibətlər, iqlim dəyişiklikləri, texnoloji inkişaflar ölkələr və fərdlərin qlobal müstəvidə bir-biri ilə əlaqəli iqtisadiyyat, siyasi şəbəkə və ekosistemin bir parçası olduğunu göstərir. Bu qloballaşma siyasəti bütün dünyadakı insanlara lokal çərçivələrdən kənarda insanlarla əməkdaşlıq etməyi, ünsiyyət qurmağı və problemləri həll etməyi öyrənməyə yardım etmək üçün XXI əsr bacarıqlarının gərəkliliyini və əhəmiyyətini bir daha ortaya qoyur. Bu baxımdan deyə bilərik ki, kreativlik, əzmkarlıq və problem həlli ilə harmonlanmış əməkdaşlıq bacarıqları getdikcə daha çox vacib hala gəlir. Bu səbəblərdən XXI əsr bacarıqları anlayışını möhkəmləndirmək üçün beynəlxalq təşkilatlar, qurumlar, hökumətlərin və şirkətlərinin dəstəyi ilə bir çox çərçivələr (ATC21S, P21-21st Century Skills Partnership və s.) hazırlamışdır. Eynilə, son illərdə bütün dünya ölkələrində təhsil sistemləri (məsələn, Hon-Konq, Çin, Sinqapur, Yaponiya, Finlandiya, ABŞ) XXI əsrdə nailiyyət qazanmaq üçün əhəmiyyətli olan bilik, bacarıq və münasibətləri inkişaf etdirmək üçün səylər göstərməyə, islahat həyata keçirməyə başlamışdır.

Ümumilikdə, təhsil sistemində transformasiya təhsilalanları XXI əsrin sürətlə dəyişən inkişaf prosesinə hazırlamaqda təməl rolu oynayır, XXI əsrin ənənə və müasirliyi özündə ehtiva edən bacarıqlara söykənən yanaşması təhsilalanları təkcə nəzəri biliklərlə deyil, həm də tənqidi və yaradıcı düşünməyə, əməkdaşlıq kimi bacarıqlarla da təmin edərək daha məlumatlı, effektiv, uğurlu şəxslər olmağa imkan verir.

**Problemin aktuallığı**. Hazırda sürətlə dəyişən və günbəgün yenilənən dünyada nəyisə bilməyin artıq üstünlük yaratmadığını da bilirik. Bu əsrdə, üstünlük yaradacaq amillərin nəzəri biliklərdən çox bacarıqlar olduğu artıq mütəxəssislər tərəfindən də təsdiqlənir. Biz bu amilləri nəzərə alaraq təhsilalanların bacarıqlarını, xüsusilə "XXI əsr bacarıqları" adlandırılan bacarıqlarını inkişaf etdirməklə, onları gələcək rəqabətə hazırlayırıq. Bu bacarıqlar XXI əsrdə insanların ömür boyu uğur qazanmaları üçün əsas hesab edilir. Məqalədə məqsədimiz bu bacarıqları məktəb illərindən təhsilalanlara aşılamaq və onlara uğurlu fərdlər olmalarına kömək olacaq mühüm bilik və bacarıqları qazandırmaqdır.

**Problemin elmi yeniliyi.** Məqalədə davamlı və sürətli dəyişiklərlərin baş verdiyi bu əsrdə milli inkişafda təməl prinsiplərini mühafizə etməklə yeni bilik və bacarıqlara yiyələnmə məsələləri ardıcıl olaraq şərh edilir, təhlil və ümumiləşdirmələr aparılır, bu amillərin təsir gücü əsaslandırılır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə əksini tapmış mütərəqqi xarakterli ideyalar, əldə edilmiş nəticələr sürətlə dəyişən və günbəgün yenilənən dünyanın inkişaf qanunlarına uyğun zəruri bilik və bacarıqlara yiyələnmiş şəxsiyyət və vətəndaş hazırlı\ına istiqamətlənmiş amillərin öyrənilməsi üçün əhəmiyyətlidir. Elmi nəticələrdən müvafiq tədqiqat işlərində, elmi-metodik vəsaitlərin hazırlanmasında, elmi-pedaqoji tədbirlərin keçirilməsində istifadə etmək faydalı olar.

**Ədəbiyyat:**

1. Azərbaycanda təhsil siyasəti, I kitab. -Bakı: Təhsil , -2005.
2. Ağayev Ə.Ə. Təlim prosesi: ənənə və müasirlik. – Bakı, -2006.
3. Cansoy, R. (2018). Uluslararası çerçevelere göre 21.yüzyıl becerileri ve eğitim sisteminde kazandırılması. İnsan ve Toplum Bilimleri Araştırmaları Dergisi, 7(4), 3112-3134.
4. Daşsalahlı, R. (2022). XXI əsr bacarıqları necə aşılanmalıdır? Azərbaycan qəzeti.
5. Rafayılqızı, G. (2023). Yaxşı işçi və peşəkar kimi dəyərimizi artıran bacarıqlar. Ülfət qəzeti. Azərbaycan Həmkarlar İttifaqı.
6. OECD (2005). The future of education and skills: Education 2030. https://www.oecd.org/education/2030/E2030%20Position%20Paper%20
7. Partnership for 21st Century Skills-P21. (2015). P21 framework definitions. http://www.p21.org/storage/documents/docs/P21.
8. Uçak, S. & Erdem, H.H. (2020). Eğitimde yeni bir yön arayışı bağlamında "21. yüzyıl becerileri ve eğitim felsefesi". Uşak Üniversitesi Eğitim Araştırmaları Dergisi, 6 (1), 76-93.
9. Yalçın, S. (2018). 21. Yüzyıl becerileri ve bu becerilerin ölçülmesinde kullanılan araçlar ve yaklaşımlar. Ankara Üniversitesi Eğitim Bilimleri Fakültesi Dergisi

**E-mail:** ramizeliyev905@gmail.com
**Redaksiyaya daxil olub:**29.05.2024

*UOT 37.0*

***Aytən Vidadi qızı Süleymanova***
*Azərbaycan Diplomatik Akademiyası*
*məktəbinin ingilis dili müəllimi,*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*https://orcid.org/0009-0003-9064-6859*
*https://doi.org/10.69682/azrt.2024.91(3).37-41*

# İNTERAKTİV TƏLİM ÜSULLARI TƏHSİLİN OPTİMALLAŞDIRILMASINA TƏSİR EDƏN AMİL KİMİ

***Айтен Видади гызы Сулейманова***
*преподаватель английского языка школы*
*Азербайджанской Дипломатической Академии,*
*докторант по программе доктора философии*
*Азербайджанского Государственного Педагогического Университета*

# ИНТЕРАКТИВНЫЕ МЕТОДЫ ОБУЧЕНИЯ КАК ФАКТОР, ВЛИЯЮЩИЙ НА ОПТИМИЗАЦИЮ ОБРАЗОВАНИЯ

***Aytan Vidadi Suleymanova***
*English teacher at ADA School at Azerbaijan Diplomatic Academy,*
*doctoral student in the program of doctor of philosophy of*
*Azerbaijan State Pedagogical University*

# INTERACTIVE METHODS AS AN INFLUENCING FACTOR TO THE OPTIMIZATION OF EDUCATION

**Xülasə.** Məqalədə təhsilin optimallaşdırılması yolunda istifadə olunan yeni təlim texnologiyalarının, xüsusilə interaktiv təlim üsullarının vacibliyi vurğulanmışdır. İnteraktiv metodların təhsilin keyfiyyətinin, səmərəliliyinin, tələbələrin yaradıcı düşüncələrinin, dünya görüşlərinin və əməkdaşlıq bacarıqlarının inkişafında olan rolu və əhəmiyyəti izah olunmuşdur.
***Açar sözlər:*** *interaktiv təlim, təhsil keyfiyyəti, yaradıcı düşüncə, tələbə, müəllim*

**Резюме**. В статье подчеркивается важность использования новых технологий обучения и методов интерактивного обучения для оптимизации образования. Объяснены роль и значение интерактивных методов в развитии качества и эффективности образования, творческого мышления, мировоззрения и навыков сотрудничества студентов.
***Ключевые слова***: *интерактивное обучение, качество образования, творческое мышление, студент, преподаватель.*

**Summary**. The article emphasizes the importance of using new learning technologies and interactive learning methods to optimize education. The role and importance of interactive methods in the development of the quality and effectiveness of education, creative thinking, worldview, and cooperation skills of students have been explained.
***Keywords***: *interactive learning, educational quality, creative thinking, student, teacher*

Müasir təlim prosesinin səmərəliliyini və keyfiyyətini yüksəldən əsas prinsiplərdən biri yeni təlim texnologiyalarının tətbiqidir. Qlobal təhsil proseslərinin gedişində istifadə olunan pedaqoji innovasiyalar yeni təlim texnologiyalarının tədrisdə istifadəsinə geniş imkanlar yaradır.

Professional təhsilin beynəlxalq standartlarla tam uyğunlaşmasının və innovativ fəaliyyətlərin həyata keçirilməsinin təlim prosesindəki təkmilləşməyə yardım edəcəyi daima ön planda göstərilmişdir. Yeni pedaqoji texnologiyaların tətbiqi ilə beynəlxalq pedaqoji təcrübə əsasında innovativ fəaliyyətlər üçün təhsil alan müəllimlərin şəxsi və professional keyfiyyətlərinin inkişaf etdirilməsi başlıca tələb olunur [2, s. 45]. Əldə olunan bacarıqlar kritik analiz və innovativ düşüncənin, optimal qərarlar vermənin, daim yeni ideyalar axtarışının və onların tətbiqinin formalaşdırılması təhsil texnologiyalarının tətbiqində istifadə olunur. Yeni texnoloji tədris üsullarının təqdimatı müasir təhsil müəssisələrində tələbələrin təliminin yaxşılaşdırılması üçün ən vacib sahələrdən biridir. Əsas metodoloji inkişaflar hazırda interaktiv tədris metodlarının istifadəsi ilə əlaqələndirilir. "Interaktiv" sözü konsept olaraq İngilis dilindən: "inter" - “arasında”, “akt” - "hərəkət", "söz" mənasına tərcümə olunur [3, s. 12]. İnteraktiv öyrənmə kognitiv fəaliyyətin xüsusi təşkilatının bir növüdür. Burada nəzərdə tutulan əsas məqsədlərdən biri də rahat öyrənmə mühitinin yaradılmasıdır. İnteraktiv pedaqogika təhsil prosesinin özəlliklərindən biri olub, əsas məzmunu tələbələrin təhsil materialını daha yaxşı qavramasının, əldə edilən biliklərin, fikirlərin, müxtəlif fəaliyyət yolları mübadiləsinin birgə fəaliyyətidir [6, s.11772]. Eyni zamanda dərslərdə interaktiv fəaliyyət dialoq əlaqələrinin təşkil və inkişafı, şəxsiyyətin inkişafı və debatlarda iştirak edərək öz mövqeyini müdafiə etmək bacarığının formalaşmasına da xidmət edir. Dürdanə Hüseynovanın etdiyi tədqiqata əsasən interaktiv öyrənmənin əsas məqsədlərini bu cür sadalamaq olar:

- ✓ Təhsil və koqnitiv motivasiyanın stimulyasiyası;
- ✓ Analitik və kritik düşüncənin şəkilləndirilməsi;
- ✓ Kommunikasiya bacarıqlarının formalaşdırılması;
- ✓ Tələbələrin öz inkişafı;
- ✓ Aktiv irəliləmə və fəaliyyətin inkişafı [3, s. 15].

Təhsil prosesi interaktiv tədris metodlarının istifadəsi əsasında təşkil edilir və bu, qrupdakı bütün tələbələrin fərdi xüsusiyyətlərinə əsaslanır. İnteraktiv metodlar interaksiya, tələbə fəaliyyəti və qrup təcrübəsinə əsaslanma prinsipləri əsasında qurulmuşdur. Müxtəlif materiallarla fərdi, cüt və qrup işləri təşkil edilir, layihə işləri, rollu oyunlar, təqdimatlar istifadə olunur. İnteraktiv pedaqogikada müəllim (təlimçi) tələbələri yeni bilikləri müstəqil şəkildə əldə etməyə yönləndirir. Bu prosesdə müəllimin fəaliyyəti tələbə fəaliyyətini genişləndirərək onların inkişafına şərait yaradır. Eyni zamanda müəllim köməkçi rolunda iştirak edərək məlumat mənbələrindən birinə çevrilir.

İnteraktiv pedaqogika tələbələrə öz təhsil proseslərinə nəzarət etmək imkanı verərək materialların qavranmasını dərinləşdirir. Eyni zamanda, interaktiv üsullarla zehni fəaliyyətin aktivləşdirilməsi, özünə inamın inkişafı, yaradıcılıq bacarıqlarının formalaşdırılması gerçəkləşir. Təhsilin müasir istiqamətlərindən biri şagirdin fəaliyyətə və ünsiyyətə hazırlıq qabiliyyətini şərtləndirir. Bu təlim prosesində tələbənin təkcə intellektual və idrak fəaliyyəti deyil, eyni zamanda sosial mövqeyi, fərdiliyi, özünü kəşf edərək dərk etməsi şəxsi təzahürünün əsas subyekti kimi önə çıxır. Uzun müddət alimlər tələbələrdə təhsilə maraq oyatmağa, biliyə həvəssizliyi və laqeydliyi aradan qaldırmaq yolları düşünmüşdürlər. Bu üsullar hər bir tələbənin maraq dairəsini nəzərə alaraq dərs planının hazır olunmasını nəzərdə tutduğu üçün öyrənənlərdə elm öyrənməyə motiv və maraq yaratmaqda təhsil işçilərinə kömək olur. İnteraktiv metodlar aşağıda sadalanan fəaliyyətlər zamanı istifadə oluna bilər:

- ✓ Tematik dərslərin təşkil olunması;
- ✓ Təlim layihələrinin təşkili;
- ✓ Tələbə portfelinin formalaşdırılması;
- ✓ Qrupda yaranan mübahisəli məsələlərin müzakirəsi və debatların təşkil olunması;
- ✓ Təhsil resurslarının yaradılması [5, s. 36].

İnteraktiv metodların üstünlükləri tələbələrin müəllimlə və bir-birlərilə əhatəli interaksiyası və tələbələrin öyrənmə prosesində fəaliyyətinin genişlənməsidir. Tələbələr aktiv şəkildə təhsil fəaliyyətində iştirak edir, yaradıcı və tədqiqat tapşırıqlarını yerinə yetirir, müzakirələrə qoşulur, öz fikirlərini sübutlar gətirərək ifadə etməyi öyrənirlər [1, s.13-15]. İnteraktiv təlim prosesində müxtəlif təcrübələrə əsaslanaraq, dərslərin keyfiyyətini və səmərəliliyini göstərən bir neçə amil vardır (şəkil 1).




***Şəkil 1. İnteraktiv təlim prosesinin əsas amilləri***

Qeyd etmək lazımdır ki, interaktiv təlimin ən əsas xüsusiyyətlərindən biri də davranış bacarıqlarının formalaşmasında tələbələrə yardım etməsidir. Belə ki, interaktiv təlimin tətbiqi tədris prosesində ünsiyyət keyfiyyətinin artırılmasına da yönəlib. İnteraktiv metod tədris prosesində məqsədyönlü ünsiyyətin uğurla həyata keçirilməsinə əhəmiyyətli dərəcədə kömək edir. Tədris prosesində effektiv ünsiyyət, qarşılıqlı hörmət, bütün iştirakçıların bərabərliyi, dürüstlük və düzlük, həm müəllimlərin, həm də tələbələrin ehtiyaclarının ifadə olunması nəzərdə tutur. İnteraktiv öyrənmənin təsirləri daha yüksək səviyyədə ünsiyyət azadlığı və aktiv dinləmə vasitəsilə ifadə olunmuşdur. Ümumilikdə bu təlim növü dərs prosesində həm müəllim, həm də tələbələr arasında müsbət stimul və çağırışlarla zəngin bir atmosfer yaradır. Müasir pedaqogika təlim keyfiyyətinin optimallaşdırılması yolunda bir çox interaktiv üsullardan istifadəni zəruri edir:

- ✓ Kiçik qruplarla işləmək;
- ✓ Təhsil oyunları;
- ✓ İctimai resursların istifadəsi (mütəxəssis dəvət etmək, səfərlər);
- ✓ Sosial layihələr və dərsə əlavə olunmuş təlim metodları (yarışmalar, müsahibələr, filmlər, çıxışlar, sərgilər);
- ✓ Yeni materialın öyrənilməsi (interaktiv leksiya, video və səs materialları ilə iş, "hər kəs hər kəsə öyrədir", mozaik (açıq işləmə testi), sualın istifadəsi, Sokrat dialoqu);
- ✓ Testlər;
- ✓ Uzaqdan təhsil;
- ✓ Çətin və mübahisəli məsələlərin və problemlərin müzakirəsi;
- ✓ Problemlərin həll edilməsi ("qərar ağacı", "fırtınanın təsirindən qorunma", "məsələ analizi");
- ✓ Öyrədici təlimlər [4, s. 5-6].

Bu gün təhsil sahəsində müəllimlərin əsas vəzifələrindən biri tələbələrin yaradıcı düşüncələrini inkişaf etdirmək, onların dünya görüşünü formalaşdırmaq, cəmiyyətimizin inkişafına və xalqımızın rifahına xidmət edə biləcək bir şəxsiyyəti təmin etməkdir. Tələbələrə yaradıcı düşünməyi öyrətmək onların inkişafında çox önəmli rol oynayır. Buna görə də, tələbənin yaradıcı düşünməsini təmin etmək, vətəninə və xalqına bağlı, savadlı, dünya görüşlü, müstəqil, yaradıcı, vicdanlı və iradəli insanlara dönüşmə-

lərində interaktiv metodların çox böyük rolu vardır. Beləliklə, tələbələrə yaradıcı düşünməyi öyrətməkdə interaktiv metodların tətbiqinin təhsil prosesindəki əhəmiyyəti ölçülməzdir [3, s. 13]. İnteraktiv tədris metodları hər bir müəllim tərəfindən mövcud imkanlar daxilində həyata keçirilməlidir. Qısaca, interaktiv öyrənmə bir neçə məsələni eyni anda həll edə bilər. Bunların ən vacibi, tələbələrin kommunikasiya bacarıqlarının inkişafını təmin etmək, tələbələr arasında emosional əlaqələri gücləndirmək, onlara komanda işində çalışmağı və dostlarını dinləməyi öyrətməkdir. Təlimdə təhsil müəssisəsinin, müəllimin, ailənin və cəmiyyətin inkişaf etmiş şəxsiyyətlər yetişdirməsi interaktiv metodların əsas məsələlərindən biri kimi vurğulanır. Ölkəmiz müstəqilliyini qazandıqdan sonra xalqımızın böyük bir dövlət inşa etmək, azad və mədəni bir cəmiyyət yaratma arzusu bizə harmoniya içində inkişaf etmiş insanları təlim verərək tərbiyə etməkdir. Təhsildə interaktiv metodların istifadəsi tələbələrdə yaradıcı düşüncənin formalaşmasına, təlim və tərbiyənin birləşməsinə, təhsil prosesində maraqların və məsuliyyətin inkişafına, kognitiv fəaliyyətin artırılması ilə müstəqil öyrənmə ehtiyacının formalaşmasına, başqalarına hörmət etməsinə, müxtəlifliklərin qəbul edilməsinə, ümumilikdə moral keyfiyyətlərin formalaşmasına xidmət edir [2, s. 52]. Bu, təhsilin effektivliyini, keyfiyyətini, səmərəliliyini daha da artırmaq üçün geniş imkanlar açır. Bu üsullar vasitəsilə müəllim şagirdlərin şüurunda dəqiq və aydın elmi təsəvvürlər formalaşdırmalı, onların həyatda öz yerini tapmasına kömək etməli, onlarda mənəvi-əxlaqi keyfiyyətlərə dair müsbət hisslər formalaşdırmalıdır (şəkil 2).




***Şəkil 2. İnteraktiv təlim üsullarının əsas məsələləri***

**Problemin aktuallığı.** Cəmiyyətin inkişafında ən əhəmiyyətli faktorlardan biri təhsildir. İnteraktiv təlim təhsil prosesinin keyfiyyətinin artmasında və optimallaşdırılmasında əhəmiyyətli rol oynayır. Müasir dövrdə tələbənin dərsə marağının artması, materialları daha yaxşı qavraması və dərslərdə interaktivliyin yüksəldilməsi interaktiv pedaqogikanın əsasında durur.

**Problemin yeniliyi.** Təhsilin optimallaşdırılması yolunda istifadə olunan interaktiv təlim üsullarının əsas komponentləri araşdırılaraq, tədris zamanı izah olunan faktorları nəzər almağa çağırış olunur.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən "Pedaqogika" ixtisası ilə əlaqədar olan fənləri tədris edən təhsil işçiləri, eyni zamanda bu ixtisas üzrə təhsil alan gənc tədqiqatçılar faydalana bilər.

**Ədəbiyyat:**

1. Əliyeva A. İnteraktiv metodlardan istifadə təlim Rus dilində olan məktəblərdə Azərbaycan dili tədrisinin səmərəliliyini artırmağın vasitəsi kimi. Dissertasiya. − Bakı, 2011. − s.10-42.
2. Əlizadə X. İbtidai siniflərin riyaziyyat tədrisində interaktiv təlim metodlarından istifadə (Riyaziyyat tədrisində interaktiv təlim metodlarından istifadə). Dissertasiya. − Bakı, 2009. − s. 42-54.

göstərə bilməz. Əsərlərinin birində fikrini belə ifadə edir: "Günəş çevrədəki hər şeyə eyni təsirləri göndərir. Qızıl günəşin altında parlayır, söyüd ağacı isə parlaya bilmir, ancaq qızıldan fərqli olaraq yaşıllaşır." İnsanın bir sahədə istedadı yoxdursa, istəsə belə, kamilləşə bilməz. O, buna ancaq istedadla nail ola bilər, istedad isə kökdən, soydan gəlir, yəni insanla birlikdə yaranır.

Böyümə və yetkinləşmə ilk növbədə ehtiyacları fərqləndirir. Ehtiyacların fərqləndirilməsi düşüncələri, xəyalları, maraqları dəyişir. Köhnə hisslərin, düşüncələrin artıq mənası olmur. Yetkinlik çağında insanlar daha çox təsdiqlənmiş məlumatlara, məlumatlardan inanclara çatırlar, inanclardan isə rəylərə, tənqidi mülahizələrə başlayırlar. Bu arada tez-tez bilik və inancların fərziyyələrlə qarışdırıldığı da müşahidə olunur.

Böyümə və yetkinləşmə anlayışları bütün yaşlar üçün fərqli biliklər və ideyalar verir. Başqa sözlə, uşaqlıq və yeniyetməlik dövründəki inkişaf mərhələləri tamamilə fərqlidir, ancaq uşaqlıqdakı inkişaf mərhələsi yeniyetməlik üçün əsas təşkil edir.

Yeniyetməlik fizioloji inkişaf və dəyişikliklərlə yanaşı psixoloji dəyişikliklərin, emosional eniş-yoxuşların da baş verdiyi bir dövrdür. Maddi rifahın hər şeydən üstün tutulduğu bir dövrdə yaşayan şagirdlər öz dəyərlərindən xəbərsiz, məqsədsiz bir kütlə kimi mənəvi-fəlsəfi boşluğa sürüklənirlər. İnsanlar sosial varlıq olduğundan fiziki və mənəvi xüsusiyyətlərinə görə birlikdə yaşamaq məcburiyyətindədirlər. Lakin daxili və xarici aləmində müxtəlif səbəblərdən həm özündən, həm də cəmiyyətdən uzaqlaşanlar da var. Yaşadıqları şəraitə görə cəmiyyətdən təcrid olunmuş həyat tərzi keçirən indiki insanlar başqa insanlar haqqında sağlam məlumata malik ola bilmirlər. Problemlərin həllinin insanları tanımaqla tapıla biləcəyini nəzərə alsaq, insanların bir-birini tanıması və anlamasının əhəmiyyətini asanlıqla başa düşmək olar.

İnsanın həyatı xoş qarşıladığı uşaqlıq dövründə (5-12 yaş arası) böyüdüyü ailə mühiti çox önəmlidir. Bu yaşlarda özünə model axtaran hər bir uşaq özünü tanımaq istəyir və ata-anaya ehtiyac duyur. Valideynlər yoxdursa, onların yerini yaxın qohumlar və müəllimlər tutur. Uşaqlar sevildiyini və qorunduğunu öncə ailədə, sonra məktəbdə öyrənir. Bundan məhrum olmaq və ya əksinə, həddindən artıq sevgi və qorunmaq gələcəkdə bəzi psixoloji pozğunluqlar, mənəvi böhranlar, və əsəbilik yaradır. Bu baxımdan uşağın ən mühüm mənəvi ehtiyacı yetərli qədər göstərilən sevgidir və onların bu ehtiyaclarını ailə və məktəb qarşılamalıdır.

Mövlanə Cəlaləddin Rumi "Mənəviyyat Məsnəviləri" (I kitab. Tərcümə: Şirinov Səfər Hökməli oğlu) əsərinin "Ömərin Rum qeysərinin elçisi ilə dialoqa girməsi" bölümündə qəmgin insanın könlünü şad etməyin yaxşı əməl olduğunu nəsihət edir.

O qorxuya düşənin, qəlbini şad eylədi,
Qəlbi bərbad olanın, könlün abad eylədi.
Sonra ona söylədi, şirin sözlər, kəlamlar,
Haqqın pak sifətindən, yaxşılıqlar, inamlar,
Allah adamı kimi, onu nəvaziş etdi,
O, bunları dərk edib, dərin xəyala getdi.

(3, s.125)

Mövlanə uşaqların qulaqlarının valideynlərinin, xüsusilə analarının və müəllimlərinin sözləri ilə dolduğunu, böyüdükdə isə bu söz və üslubla danışdıqlarını bildirərək bu müqəddəs varlıqların uşaqların üzərindəki təsirini vurğulayır (Məsnəvi, IV/3037). Təbii ki, bu təqdirdə həm ata-anaların, həm də müəllimlərin üzərinə böyük məsuliyyət düşür. Ümumilikdə təhsilin uşaqlar üçün zəruri olmasını, uşaqlara həssas və pozitiv münasibətin göstərilməsini diqqətə çatdıran Mövlanə uşaqlara qışqıran anaları və müəllimləri tənqid edir. Amma buna rəğmən yenə də onlara rəğbət bəsləyir və uşaqlara xitabən deyir ki, "anan sənə öl desə, bu sözlə sənin içindəki pis xasiyyətin ölməsini istəyir" (Məsnəvi, III/4017).

İlk təhsilini anasından alan uşağın ikinci tərbiyəçisi məktəbdə müəllimidir. Mövlanəyə görə, uşaq məktəbə gedəndə onun təhsilinə cavabdeh olan müəllim kimi atası da məsuliyyət daşıyır. (4, s. 140)

Mövlanənin rübailərində mənəvi dəyərlərin tərbiyəsi önəmli yer tutur. Son illərdə ədəbi əsərlərdə dəyərlərin tərbiyəsi ilə bağlı aparılan araşdırmalar bu mövzuda bizə ümumi məlumat versə də, həmin dəyərlərin öyrədilməsi üçün istifadə olunan tədris metod və üsullarını aşkara çıxaran heç bir araşdırma aparılmamışdır. Cəmiyyətin problemlərini görən, cəmiyyətə inteqrasiyanı təmin etmək və xalqı oyandırmaq üçün nəsihətlər edən, yaşadığı dövrdən bu günə qədər

fikir və düşüncələri ümumbəşəri xarakter alan, cəmiyyətləri maarifləndirən Mövlanənin “Fihi Mafih”, “Məcalis-i Səba” və “Məktubat” adlı əsərləri keyfiyyətli tədqiqat modelləri üzərində mənbə və məzmun təhlilləri aparılması məqsədəuyğundur.

Mövlanə davranış qaydalarını insanın ailədə, cəmiyyətdə və kollektivdə bir-birinə münasibəti baxışında, davranış qaydalarını tənzim etdiyi münasibətlərin xarakterində görür. Prinsipdə bəşərin ilk vəziyyətini, əsas köklərini və ən çox nəzəriyyələr sistemini əks etdirir. Əxlaq kateqoriyalarında isə ümumi şəkildə insanlar arasında, insanla cəmiyyət arasında mənəvi əlaqələri təhlil obyektinə çevirir. Yaxşılıq, ədalət, borc, şərəf, ləyaqət, vicdan, xoşbəxtlik və s. kimi əxlaq kateqoriyalarını yaradıcılığı boyu ifadə edir. (1, s.11)

Əsərlərində həqiqət, doğruluq, yaxşılıq, insaf, zəka, sevgi, dözümlülük və s. müsbət dəyərlərin mənimsənilməsini istəyərkən, yalan, pis xasiyyət, ikiüzlülük, şöhrətpərəstlik, kin, qəzəb, cəhalət kimi mənfi dəyərlərdən uzaq olmağı tövsiyə edən filosof şair bildirmişdir ki, insanlığın nicatı ağıl işığında elm və hikmətlə böyüdülmüş düşünən gənclərdədir.

İnformasiya əsrində nəsillərini yalnız gözəl tərbiyə ilə böyüdən, özünəinam hissi qazanan xalqlar öz gələcəyinə inamla baxa bilirlər. Çünki bugünkü gənclik sabah cəmiyyəti idarə edəcək dəyərlərdir.

“İnsanla heyvan arasındakı fərq ədəbdir.” – deyir Mövlanə. (2)

İnsan öz varlığını davam etdirməsi və cəmiyyətdə hörmətli yerə - yüksək məqama çatması üçün “ədəb” anlayışına çox diqqət yetirməlidir ki, Mövlanə yaradıcılığında ədəb məsələsinə xüsusilə toxunmuş, insanlar arasında hörmətin, sevginin, qardaşlığın əsasında lazım olan vacib məqamları göstərmişdir.

Araşdırmalardan bu nəticəyə gəlmək olar ki, Mövlanənin əsas məqsədi şeir yazmaq, hekayət danışmaq deyil. O, xalqı onların hazırlıq səviyyələrinə uyğun öyrətməyi qarşısına məqsəd qoymuşdur. Əsərlərində hər yaşda oxucunu cəlb edən fikirlər vardır.

**Problemin aktuallığı.** Mövlanənin əsərlərində xüsusilə uşaqlıq, yeniyetməlik və gənclik dövrü üçün mühüm tövsiyələr var və bu tövsiyələr sabahın idarəçilərini bu gün yetişdirməkdə mühüm rol oynayır.

**Problemin elmi yeniliyi.** Mövlanə mücərrəd məsələləri konkret ifadələrlə ifadə etməklə cəmiyyətin hər yaşda fərdlərinin başa düşməsini asanlaşdırmışdır. Təlimini əsasən sual-cavab üsulu ilə icra etmişdir. Nəticə etibarı ilə XIII əsrin məşhur şairi və maarifçisi Mövlanənin təlim-tədris üsulu bugünkü müasir tədris üsul və metodları ilə üst-üstə düşür.

**Problemin praktik əhəmiyyəti.** Mövlanənin əsərlərindəki ictimai məsələlər, mənəvi dəyərlər, ədəb və tərbiyə məsələləri geniş araşdırmalar tələb edir. Fikrimizcə, bu dəyərlərin və onların öyrədilməsində istifadə olunan tədris metod və üsullarının müəyyənləşdirilməsi, bugünkü təhsil anlayışı ilə əlaqələndirilməsinə diqqət yetirilməsi gənc tədqiqatçılar və məktəb müəllimləri üçün faydalı olar.

**Ədəbiyyat:**

1. Əliyeva, X.M. Mövlanə Cəlaləddin Rumi yaradıcılığında tərbiyə problemləri: Pedaqogika üzrə fəlsəfə doktoru dissertasiyasının avtoreferatı) / -Naxçıvan, 2022. -25 s.; s.11
2. Gülben Tekin. Mevlana’nın Eğitimle İlgili Görüşleri, sayı 33- İnsan hakları eğitimi (ocak 2012) https://www.egitisim.gen.tr/mevlana-nin-egitimle-ilgili-gorusleri/
3. Mövlanə Cəlaləddin Rumi. Mənəviyyat Məsnəviləri. I kitab. -Bakı, 2007. -346 s.
4. Şimşekler, Nuri. 2003. “Hz. Mevlânâ’da Evlilik, Aile Hayatı ve Çocuk Eğitimi”, Konya Kitabı VI. (Ed. Caner Arabacı) Konya: İpek Yolu Konya Ticaret Odası Dergisi. Özel Sayı.

**E-mail:** adile1970@mail.ru
**Redaksiyaya daxil olub:** 04.06.2024

***MƏKTƏBDƏNKƏNAR İŞ***
***ВНЕШКОЛЬНАЯ РАБОТА***
***EXTRACURRICULAR ACTIVITY***

*UOT 37.01*

***Əsmət İdris qızı İsmayılxanova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetin*
*Ümumi pedaqogika kafedrasının dosenti*
*https://orcid.org/0000-0002-1151-4440*
*https://doi.org/10.69682/azrt.2024.91(3).71-74*

# MƏKTƏBDƏNKƏNAR TƏRBİYƏ MÜƏSSİSƏLƏRİNDƏ ŞAGİRDLƏRİN EKOLOJİ TƏHSİL TƏRBİYƏSİNİN SİSTEMİ

***Асмет Идрис гызы Исмаилханова***
*доцент кафедры общей педагогики*
*Азербайджанского Государственного Педагогического Университета*

# СИСТЕМА ВОСПИТАНИЯ ЭКОЛОГИЧЕСКОГО ОБРАЗОВАНИЯ ОБУЧАЮЩИХСЯ НА ВНЕШКОЛЬНЫХ ВОСПИТАТЕЛЬНЫХ УЧРЕЖДЕНИЯХ

***Asmet Idris Ismayilkhanova***
*associate professor of the department of General pedagogy at*
*Azerbaijan State Pedagogical University*

# THE SYSTEM OF ENVIRONMENTAL EDUCATION AND UPBRINGING FOR THE STUDENTS IN THE EXTRACURRICULAR UPBRINGING INSTITUTIONS

**Xülasə.** Müəllif yazmış olduğu məqalədə hal-hazırda bütün bəşəriyyəti narahat edən ən qlobal problemlə bağlı məktəbdənkənar tərbiyə müəssisələrində şagirdlərin ekoloji təhsili üzrə aparılan işlərin sistemini ətraflı işləmişdir. Müəllif qeyd edir ki, ətraf mühitdə istər təbii amillər, istərsə də insanların müdaxiləsi müxtəlif dəyişikliklərə səbəb olur ki, bu da həmin regionun həyat fəaliyyətinə əsaslı şəkildə təsir edir. Bildiyimiz kimi ətraf mühit, iqtisadiyyat, mədəniyyət və insan fəaliyyəti daima bir-biri ilə qarşılıqlı əlaqədə olduğu üçün bu həlqənin birində baş verən dəyişikliklər eyni dərəcədə digərlərinə də təsir göstərir. Bunun üçün ekoloji təhsilin verilməsi zərurəti aktuallıq kəsb edir. Ekoloji təhsil insanlardan ətraf mühiti qorumaqla bağlı özünü formalaşdırmaq və mühüm qərarlar qəbul etmək təcrübəsini qarşıya qoyur və bunu onlardan tələb edir.
***Açar sözlər.*** *Ekoloji təhsil, iqtisadiyyat, mədəniyyət, texnologiya, kommunikativ, təbiətşünaslıq, məktəbdənkənar tərbiyə, zoopark, ekskursiya*

**Резюме.** Учитывая глобальный масштаб самой волнующей для человечества проблемы – состояния окружающей среды, в данной статье автор подробно разбирает систему комплекса работ по экологическому образованию учащихся внешкольных образовательных учреждений. Отмечается, что как природные факторы, так и антропогенное вмешательство вызывают различные изменения в окружающей среде, которые коренным образом влияют на жизнедеятельность того или иного региона. Как известно, окружающая среда, экономика, культура и человеческая деятельность постоянно взаимодействуют друг с другом, в результате чего изменения в одном из звеньев этой цепи в равной степени влияют и на другие. В этой связи становится актуальной необходимость экологического образования. Экологическое образование основывается на опыт личностного формирования и принятия важных решений по защите окружающей среды.
***Ключевые слова:*** *экологическое образование, экономика, культура, технология, коммуникативный, естествознание, внешкольное воспитание, зоопарк, экскурсия*

**Summary.** Considering the global scale of the most worrying problem for mankind the state of the environment, the author describes in detail the system of works required to provide environmental education to the students of extracurricular educational institutions. It is noted that both natural and anthropogenic factors cause various changes in the environment, which radically affect the life of a region. As a result of the constant interaction between the environment, economy, culture, and human activity, changes in one of the links of this chain equally affect the others. Hence, there is an urgent need for environmental education, which is based on the experience of personal development and making important decisions to protect the environment.

***Keywords:*** *environmental education, economy, culture, technology, communicativeness, natural sciences, extracurricular education, zoo, excursion*

Ətraf mühitdə istər təbii amillər, istərsə də insanların müdaxiləsi müxtəlif dəyişikliklərə səbəb olur ki, bu da həmin regionun həyat fəaliyyətinə əsaslı şəkildə təsir edir. Bildiyimiz kimi ətraf mühit, iqtisadiyyat, mədəniyyət və insan fəaliyyəti daima bir-biri ilə qarşılıqlı əlaqədə olduğu üçün bu həlqənin birində baş verən dəyişikliklər eyni dərəcədə digərlərinə də təsir göstərir. Onu da qeyd etmək lazımdır ki, dünya əhalisinin sürətli artımı, elmin, texnologiyanın inkişafı insanlarda bir çox ehtiyacların yaranmasına səbəb olur. Bu cür ehtiyacların ödənilməsi üçün yaradılan texnologiyanın nəzarətsiz qalması nəticəsində təbii ehtiyatlar zərər görür ki, bu da ətraf mühitə güclü dərəcədə ziyan verir. Bunun üçün ekoloji təhsilin verilməsi zərurəti aktuallıq kəsb edir. Ekoloji təhsil insanlardan ətraf mühiti qorumaqla bağlı özünü formalaşdırmaq və mühüm qərarlar qəbul etmək təcrübəsini qarşıya qoyur və bunu onlardan tələb edir.

Ümumtəhsil müəssisələrində aşılanan ekoloji tərbiyə ilə yanaşı, eyni zamanda ekoloji təhsillə məşğul olan müxtəlif növ qurumlar və bölmələr də fəaliyyət göstərir. Bunlara düşərgə məktəblərini, ətraf mühit mərkəzlərini, muzeyləri, zooparkları, gənclər məktəblərini misal göstərə bilərik.

Ekoloji təhsilin əhəmiyyətindən danışarkən qeyd etməliyik ki, ekoloji təhsil təbiət, ətraf mühit haqqında insanların ətraf mühitə qarşı davranışının müsbət dərəcədə dəyişilməsi ilə müəyyən edilir. İnsanlar arasında ekoloji maarifləndirmə işini hərtərəfli araşdırdıqda dərk edirik ki, ekoloji cəhətdən həssas, qalıcı və müsbət davranış münasibətləri əldə etmək, ekoloji şüurun inkişaf etdirilməsində əsaslı rol oynamaq, estetik, mədəni, təbii və tarixi dəyərləri qo-ruyaraq saxlamaq, ətraf mühiti, təbiəti mühafizə sahəsində müsbət mənada fəallığı təmin edir. Ekoloji təhsil uşaq və yeniyetmələrə, böyüklərə ətraf mühiti öyrənmək və onu necə qorumaq haqda mühüm qərarlar qəbul etməyi öyrədir.

G. Haktanır ekoloji təhsili dəyərlər təhsili, qərar qəbul etmə, yaradıcılıq və kommunikativ bacarıqlar kimi bir sıra mövzuları özündə ehtiva etdiyi üçün bunun fənlərarası qiymətləndirilməsi vacib olan bir sahə kimi qiymətləndirir.

Ekoloji maarifləndirmənin əhəmiyyətinin dərk edilməsi, bu sahədə sistemli araşdırmaların başlaması yaxın zamanları əhatə edir. Ekoloji təhsil hələ 1800-cü illərdə "təbiətşünaslıq" adlandırılırdı, artıq 1900-cü ildən başlayaraq bu "təbiəti mühafizə təhsili" adlandırılmağa başladı.

Hələ XIX əsrdə yaşamış məşhur alman pedaqoq, psixoloqu Frobel uşağın sağlam böyüməsi üçün onun daim təbiətdə olmasını məsləhət görərək "Uşaq bağı" adlandırdığı məktəb açmış və uşaqlarda təbiətə sevgi hisslərini formalaşdırmaq sahəsində böyük işlər görmüşdür.

Bildiyimiz kimi, ekologiya elmi təbiəti və ətraf mühiti, burada baş verən təbii hadisələri ətraflı tədqiq etmək, baş verə biləcək hadisələri əvvəlcədən proqnozlaşdırmaq prosesidir. Bu elm həyatın hər bir anında qarşılaşdıqları bütün problemlərə elmi həll yolları tapmaq üçün hərəkət edən insanlar yetişdirməyi qarşısına məqsəd qoyur. Eyni zamanda kurikulumu şagirdlərin insanlar, ətraf mühit və cəmiyyət arasında qarşılıqlı əlaqələr olmasını anlamalarını, davamlı inkişaf şüuru ilə hərəkət etmələrini vacib hesab edir.

Müasir dövrümüzdə ekoloji problemlər dünya gündəmində həllini gözləyən qlobal problemdir. Ekoloji problem təbiətdə mövcud olan bütün canlı və cansız təbiət arasında tarazlığın antropogen amillər tərəfindən pozulması nəticəsində ortaya çıxır. Bu tip problemlərin ən vacib xüsusiyyəti onların sosial-mədəni, iqtisadi statusundan, dinindən, dilindən, irqindən, inancından və yaxud yaşından asılı olmadan dünyanı nara-

hat edən, mövcud olan bütün canlıları məhv edəcək qlobal, aktual problem olmasıdır.

Bəs ekoloji problemləri necə həll etmək, qarşısını necə almaq olar? Bu sualın cavabı yalnız insanlara ekoloji təhsilin verilməsindədir. Böyüyən gənc nəsli ekoloji cəhətdən şüurlu yetişdirmək, onları ətraf mühitə, təbiətə qayğılı davranmağa sövq etmək, eyni zamanda onlarda ətraf mühiti mühafizə etmək, zəruri bilik, bacarıq və vərdişlər, dəyərlər, münasibətlər formalaşdırmaq lazımdır.

Onu da qeyd etmək lazımdır ki, ekoloji təhsilin məqsədi ekoloji cəhətdən şüurlu şəxsiyyət yetişdirməkdən ibarətdir. Burada əsas məsələlərdən biri də insanlar arasında ekoloji maarifləndirmə işi aparmaqdır ki, ekoloji maarifləndirmə ətraf mühitə, təbiətə isti münasibəti, ekoloji baxımdan düzgün davranış təlqin deməkdir. İnsanlarda ətraf mühitə qayğılı yanaşmaq mühiti yaratmaq onlarda ətraf mühitin qorunmasını vərdiş etdirmək deməkdir. Odur ki, ekoloji təhsilin verilməsi ekoloji baxımdan təmiz gənclər yetişdirmək üçün əsas vasitədir və bu da sağlam cəmiyyətin təməl daşıdır.

Lakin aparılan tədqiqatlar nəticəsində belə bir acı həqiqət ortaya çıxır ki, yeniyetmə və gənclər hələ də arzuolunan qədər ekoloji biliklərə sahib deyillər və ətraf mühitə uyğun davranışlar sərgiləmirlər.

Bu cür qlobal problemin həlli yolları tək ümumtəhsil müəssisələrində axtarılmamalıdır. Bildiyimiz kimi məktəblərdə bu işlər planlı, proqramlı və məqsədli şəkildə həyata keçirilir.

Lakin bu problemlə bağlı məktəbdənkənar tərbiyə müəssisələri də müəyyən işlərin görülməsində fəal iştirak edirlər. Bu tip məktəbdənkənar öyrənmə mühitinə botanika bağları, zooparkları, sənaye müəssisələri və milli parkları misal göstərmək olar. Buna bir nümunə olaraq bioloji təhsil üçün respublikamızda mövcud olan botanika bağına aparılan şagirdlərin fəaliyyətini nəzərdən keçirə bilərik. Şagirdlər bələdçilərin müşayiəti altında botanika bağında planlaşdırılmış tədris fəaliyyətində iştirak edirlər.

Qeyd etmək lazımdır ki, ekoloji təhsili sinif şəraiti ilə məhdudlaşdırmaq olmaz. Odur ki, məktəbdənkənar təlim mühitində həyata keçirilən fəaliyyət sinifdən kənar fənn kurikulumunda öyrənmə nəticələrinə yönləndirilməlidir və bu cəhətdən şagirdlərin ekoloji bilikləri öyrənmələri təkmilləşdirilməlidir.

Ekoloji maarifləndirmənin məktəbdənkənar şəraitdə aparılması şagirdlərdə təbiətə fərqli bir baxış yaradacaq və ekoloji maarifləndirmə üçün ilk növbədə ekoloji məlumatlar əldə edəcəklər. Bu zaman onlar daha təbii və sosial şəraitdə tədrisdə iştirak edərək sərbəst şəkildə özləri müşahidə etməklə ətraf mühitin nə dərəcədə əhəmiyyətli olduğunu dərk edəcəklər. Şagirdlər özləri eyni zamanda təbiətlə həm fiziki, həm də psixoloji ünsiyyət formalaşdırmaqla empatiya qura biləcəklər.

Qeyd edək ki, müasir dövrümüzdə məktəbdənkənar təlim-tərbiyə müəssisələri çox zəngin tədris materialları ilə təmin olunmuşdur. Odur ki, bu müəssisələri şagirdlərin təcrübə əldə etdikləri, ünsiyyət və qarşılıqlı şəkildə səmərəli vaxt keçirdikləri pulsuz, əyləncəli, açıq hava şəraitində təşkil edilən laboratoriyaya bənzədirlər. Şagirdlərə yaradılan bu cür şərait ətraf mühitə, ekoloji təmizliyə, təbiətə müsbət münasibət formalaşdırmağın ən obyektiv və asan üsuludur. Həm də məktəbdənkənar tədris fəaliyyəti uzunmüddətli olmaqla öyrənməni sürətləndirən təsir gücünə malikdir.

Bu gün dünyamızın ekoloji cəhətdən möhkəm narahatlıq keçirdiyi bir vaxtda ekoloji cəhətdən savadlı şagirdlərin tərbiyə edilməsi və təbiətlə düzgün davranışların formalaşdırılması çox vacib əhəmiyyət daşıyır. Odur ki, şagirdlərə anladılmalıdır ki, bizi hərtərəfli əhatə edən ətraf ətraf mühit insanlardan üstündür və gələcək nəsillərə ötürəcəyimiz ən vacib mirasdır.

Botanika bağlarında, zooparklarda, çöl təcrübələrində, ekskursiyalarda gördükləri və əldə etdikləri təcrübələr şagirdlərin ətraf mühitlə qurduqları emosional bağları, sosial münasibətləri və məsuliyyət hissini artırır. Ən sadə bir misal gətirək: şagirdlərin gəzinti zamanı meşədə olan zibil tullantılarını toplaması kiçik fəaliyyət növü kimi görünsə də, əldə etdikləri təcrübələr onları ekoloji problemlər haqqında düşünməyə vadar edəcək və təbiətin qorunmasının nə dərəcədə vacib olduğunu dərk edəcəklər.

Ətraf mühitin mühafizəsi mövzusunda ümumdünya səviyyəsində həyata keçirilən tədbirlər haqqında da şagirdləri maarifləndirmək vacib məsələdir. Beynəlxalq arenada ətraf mühitin qorunması və mühafizəsi haqqında tədqiqatlar aparan ilk təşkilat BMT-nin 1972-ci ildə keçirdiyi "İnsan və ətraf mühit" konfransı daha

təqdirəlayiqdir. Bundan əlavə 1977-ci ildə nəşr edilən, ekoloji problemin söyləndiyi və ekoloji maarifləndirmənin işləndiyi Tiflis Bəyannaməsi də bu qəbildəndir. Rioda 1992-ci ildə ekoloji təhsillə bağlı keçirilən toplantıda da mühüm qərarlar qəbul olunmuşdur. Hətta 1994-cü ildə Yeddinci Beşillik İnkişaf Planı və Tiflis bəyannaməsində bəhs edilən ekoloji təhsil strategiyası istiqamətində mühüm addımlar atılmışdır.

Ekoloji mühitin məqsəd və vəzifələrinə uyğun gələn məktəbdənkənar təlim şəraitinin yaradılması zooparklar, botanika bağları, təbii həyat parkları, milli parklar, təbiət təhsili və sənaye müəssisələri ekoloji təhsillə bağlı öyrənmə mühiti hesab edilir. Bildiyimiz kimi, zooparklar vəhşi və ev heyvanlarının yaşadığı təbii parklardır. Botanika bağları isə özlüyündə bitkiləri, onların yaratdığı qruplar və bu qruplar arasında mövcud olan qohumluq əlaqələrini əks etdirən təbii öyrənmə mühitidir.

Qeyd edək ki, məqsədindən, nümayiş etdirdikləri canlı və cansız varlıqlardan asılı olmadan bütün bu təbii mühitlərin ortaq nöqtəsi ondan ibarətdir ki, şagirdlərin öyrənə biləcəkləri, sosial cəhətdən təsirlənəcəkləri və bacarıqlarını inkişaf etdirəcəkləri yerlər hesab olunur.

Sonda onu qeyd etmək yerinə düşər ki, dinindən, dilindən, irqindən, sosial mənsubiyyətindən asılı olmayaraq yer üzündə yaşayan, bu dünyanın daimi sakinləri olan insanlar ətraf mühiti, təbiəti, onun yeraltı, yerüstü sərvətlərini qorumağa borcludurlar. Və onlar bilməlidirlər ki, gələcək nəsillərə şikəst deyil, sağlam təbiəti miras qoyub getməliyik.

**Problemin aktuallığı.** Dünya əhalisinin sürətli artımı, elmin, texnologiyanın inkişafı insanlarda bir çox ehtiyacların yaranmasına səbəb olur. Bu cür ehtiyacların ödənilməsi üçün yaradılan texnologiyanın nəzarətsiz qalması nəticəsində təbii ehtiyatlar zərər görür ki, bu da ətraf mühitə güclü dərəcədə ziyan verir. Bunun üçün ekoloji təhsilin verilməsi zərurəti aktuallıq kəsb edir.

**Problemin elmi yeniliyi.** Ekoloji təhsil uşaq və yeniyetmələrə, böyüklərə ətraf mühiti öyrənmək və onu necə qorumaq haqda mühüm qərarlar qəbul etməyi öyrədir. Dünyamızın ekoloji cəhətdən möhkəm narahatlıq keçirdiyi bir vaxtda ekoloji cəhətdən savadlı şagirdlərin tərbiyə edilməsi və təbiətlə düzgün davranışların formalaşdırılması çox vacib əhəmiyyət daşıyır.

**Problemin praktik əhəmiyyəti**. Məqalə məktəbdənkənar ekoloji təhsilin yeniyetmə və gənclərə verilməsi istiqamətində onlara güclü təsir göstərəcək və bizim daimi məskənimiz olan dünyamızın qorunmasını özlərinin vicdan borcu hesab edəcəklər.

**Ədəbiyyat:**

1. Diamond J. (1986). Elm muzeylərində ailə qruplarının davranışı. Kurator: Muzey jurnalı, 29 (2), -s. 139-154.
2. Verdiyeva Ə.İ. Məktəbdənkənar tərbiyə müəssisələrində şagirdlərin peşəyönümünün məzmun, forma və yolları: pedaqogika üzrə fəlsəfə doktoru dissertasiyası) / - Bakı, 1998. -154 s.
3. Şimalı Amerika Ətraf Mühit Təhsili Assosiasiyası (NAAEE). (2014). Ekoloji təhsil nədir? http://www.naaee.net/what-is-ee (Giriş: 30.04.2022).

**E-mail:** a.ismayilxanova@gmail.com
**Redaksiyaya daxil olub:**29.05.2024

***TƏRBİYƏ TEXNOLOGİYALARI***
***ВОСПИТАТЕЛЬНЫЕ ТЕХНОЛОГИИ***
***UPBRINGING TECHNOLOGIES***

***Gülarə Hüseynağa qızı Kərimova***
*Bakı Dövlət Universitetinin*
*Pedaqogika kafedrasının dosenti,*
*pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0009-0004-3372-9786*
*https://doi.org/10.69682/azrt.2024.91(3).75-80*

# DOSTLUQ, SƏDAQƏTLİLİK, ETİBARLILIQ, MİLLİ-MƏNƏVİ DƏYƏRLƏRİMİZDƏN BİRİ KİMİ

***Гюлара Гусейнага гызы Керимова***
*доцент кафедры педагогики Бакинского Государственного Университета,*
*доктор философии по педагогике*

# ДРУЖБА, ВЕРНОСТЬ, НАДЕЖНОСТЬ КАК ОДНА ИЗ НАШИХ НАЦИОНАЛЬНО-НРАВСТВЕННЫХ ЦЕННОСТЕЙ

***Gulara Huseynağa Karimova***
*associate professor of the department of Pedagogy of*
*Baku State University, doctor of philosophy in pedagogy*

# FRIENDSHIP, LOYALTY, RELIABILITY, NATIONAL-SPIRITUAL AS ONE OF OUR VALUES

**Xülasə.** Azərbaycan xalqının zənginliyi, onun milli-mənəvi dəyərləri, bu dəyərlərin formalaşdırılması və qorunub saxlanılması məqalədə öz əksini tapır. Xalqımıza məxsus milli mentalitetdən, humanizm hisslərindən, insani keyfiyyətlərdən, dostluq, igidlik, vətənə bağlılıq hisslərindən və s. dəyərlərdən nümunələr göstərilir. Bu milli-mənəvi dəyərləri gələcək nəsillərə, böyüyən nəsillərə ötürmək gündəmdə duran vacib məsələlərdəndir. Problemlə bağlı aparılan araşdırmalar, müşahidə və müsahibə bir daha göstərir ki, dostluq, sədaqətlilik dəyərləri bu günkü günün ən vacib və aktual məsələlərindən biridir. Apardığımız tədqiqatlar bu problemin yeniyetmələrin həyatında önəmli rol oynamasının vacibliyini göstərir.
***Açar sözlər:*** *Dostluq, qardaşlıq, xalqın əxlaqi dəyərləri, milli mentalitetlər*

**Резюме**. В статье отражено богатство азербайджанского народа, его национально-нравственные ценности, формирование и сохранение этих ценностей. Приведены примеры национального менталитета нашего народа, чувства гуманизма, человеческих качеств, дружбы, храбрости, верности Родине и т.д. Отмечено, что передача этих национальных и нравственных ценностей будущим и подрастающим поколениям является одним из важных вопросов повестки дня. Исследования, наблюдения и беседы о проблеме еще раз показывают, что ценности дружбы и верности являются одними из самых важных и актуальных вопросов современности. Наши исследования показывают важность данной проблемы, играющей важную роль в жизни подростков.
***Ключевые слова:*** *дружба, братство, нравственные ценности народа, национальные менталитеты*

**Summary.** The richness of the Azerbaijani people, its national and moral values, the formation and preservation of these values are reflected in the article. From the national mentality of our people, feelings of humanism, human qualities, feelings of friendship, bravery, loyalty to the motherland, etc. examples of values are shown. Transmitting these national and moral values to future generations and growing

generations is one of the important issues on the agenda. The research, observation and interview about the problem show once again that the values of friendship and loyalty are one of the most important and urgent issues of today. Our research shows the importance of this problem playing an important role in the life of teenagers.

***Key words:*** Friendship, brotherhood, moral values of the people, national mentality

Azərbaycan xalqının zənginliyi onun milli-mənəvi dəyərlərinin çoxluğunda təcəssüm olunur. Xalqın millət olması üçün ərazi birliyi, iqtisadi və siyasi birliklərin birliyi ilə yanaşı, mənəviyyat birliyinin də olması əsas şərtlərdən biridir. Bu birliklər tarixən xalqın əxlaqi dəyərlərinin formalaşması zəminində inkişaf edir və milli mentalitetini yaradır. Milli mentalitet isə böyük əmək, zəhmət, sağlam ruh. humanizm hisləri, insani keyfiyyətlər, vətənpərvərlik. vətənə, elə, torpağa bağlılıq, dostluq, müdriklik, igidlik, mərdlik və s. dəyərləri özündə ehtiva edir. Mənəvi dəyərlər tərbiyənin tərkib hissələrindəndir. O, daim nəsillərdən-nəsillərə ötürülmüş öz gücünü ifadə formasını zənginləşdirmişdir. Bu gün do onların böyüyən nəsillərə ötürülməsi və qorunub saxlanılması zəruri məsələlərdən biri kimi gündəmdə dayanır. Uşaqların formalaşmasında, kamillik yolunun qazanılmasında dostluq, sədaqətlilik, etibarlılıq və s. milli-mənəvi dəyərlərin rolu əvəzsizdir. Problemlə bağlı aparılan araşdırmalar, müşahidə və müsahibələr göstərir ki, dostluq, sədaqətlilik, etibarlılıq dəyərlərinin bu gün məktəblilərə aşılanması çox vacib məsələlərdəndir. Bu sahədə aparılan tədqiqatlar, monoqrafiyalar, metodik ədəbiyyatlar da bu fikri özündə ehtiva edir. Q. Cavadovun “Azərbaycanda el köməyi”, S. Quliyev və T. Hüseynovun “Gəncliyin davranış və nəzakət dəyərləri”, Mehparə Quliyeva və İradə Quliyevanın “Müasir gəncliyin əxlaq normaları”, L.N. Qasımovanın “Ədəbiyyat fənninin tədrisi prosesində milli-mənəvi dəyərlərin aşılanması”, A.M. Həsənovun “Azərbaycan uşaq ədəbiyyatındakı mənəvi dəyərlərdən kiçikyaşlı məktəblilərin əxlaq tərbiyəsində istifadə” və s. əsərlərdə dostluq və yoldaşlıq tərbiyəsindən bəhs olunur. Lakin onun elmi şərhi verilməmiş, təcrübələrdə sınaqdan keçirilməmişdir. Apardığımız tədqiqatda bu problemin məktəblilərin həyatında önəmli rol oynadığının vacibliyini müəyyənləşdirmək mümkün oldu.

Dostluq insani münasibətlər içərisində ən ülvisi və zərurisidir. Dostluq saf əqidəyə, təmiz və ülvi, təmənnaya əsaslanmayan dəyərlərimizdəndir. Təsadüfi deyildir ki, xalq pedaqogikasında dostluğu yüksək dəyərləndirirlər: “dost gəlişi bayram olar”, “dostun ətri dosta dərmandır”, “dost dostun yolunda canını oda yaxar” və s. pedaqoji ədəbiyyatda dostluğu xarakterizə edən xüsusiyyətlər aşağıdakı kimi göstərilmişdir:

- Dost dostun yolunda malından keçməyi bacarmalıdır:
- Dost dostuna güzəştə getməyi bacarmalıdır;
- Dostlar nöqsanlarını üzlərinə deməlidir;
- Dostlar bir-birinin arxasınca danışmamalıdır;
- Dostlar bir-birini çirkin əməllərdən qorumalıdır və s.

Bütün bunlar onu göstərir ki, dostluq, sədaqətlilik, sadiqlik, saflıq, ülvilik kimi keyfiyyətlər sədaqətin təməlidir.

Sədaqətliliyin, etibarlılığın dostluqda əsas şərt, doğruçu, adil, əmanətə xəyanət etməmək və s. amillərlə səciyyələnir. Xacə Nəsirəddin Tusi yazırdı ki, sədaqət möhkəm və saf dostluğun əsas şərtidir. Möhkəm sədaqət olmadan möhkəm dostluq da ola bilməz. Dünyada fəxr ediləsi bir şey varsa, o da sədaqətli dostdur. Dosta sədaqəti saxlamaq üçün sözgəzdirənlərdən, ağzıgöyçəklərdən qaçmaq lazımdır. Nəsrəddin Tusi “Əxlaqi Nasir”ində deyirdi:

***Ayıq olun, a dostlar, haray verin haraya,***
***Qoymayın sözgəzdirən girə bilsin araya.***

Sədaqətli dost qazanmaq insan üçün mənəvi tapıntıdır. Dostluq bölünməz, parçalanmaz nemətdir. Onun gücü, istisi məlhəmdir. Çünki fikirləşmək olur ki, arxamda dağ kimi dostum var. Nizami “Xəmsə”sində tərbiyəyə, xüsusilə əxlaq tərbiyəsinə, xeyir və şər probleminə mühüm yer ayırmışdı. Burada insanpərvərlik, dostluq və yoldaşlıq, düzlük, doğruçuluq, xeyirxahlıq, ədalət, sədaqət və təvazökarlıq. vətənə məhəbbət, xalqlara səmimi münasibət bir-birinə qovuşmuş, insan əxlaqının və mənəviyyatının bütün təsvir tərəfləri, onların təmizliyi, saflığı, paklığı, konkret nümunələr əsasında təhlil etmişdir. Nizami dostluğa, yoldaşlığa yüksək qiymət verir və qeyd edir ki, adamlar üzdə bir, ar-

xada başqa cürdür. Belələri üzdə şad, daxilində düyündür, yaradır. Şair həqiqi, sadiq dost tapmağı vacib sayırdı:

***Elə sadiq dost ara, səni darda qoymasın,***
***Çəkib tordan çıxarsın, səni torda qoymasın.***

Nizami təmənnalı dostluğu pisləyir və belə dostluğu düşmənçılık hesab edirdi. Şairə görə, sadiq dost səfası ilə yaranı sağaltdığı halda, dönük dost cəfası ilə yaranı qanadır, onu sızıldadır. Nizami həqiqi dostluğun necə olduğunu, şərtlərini müəyyən edir:

*Çox gözəl olsa da eybi gizlətmək,*
*Dost dostun eybini örtmasin gərək.*
*Bu dostluq aynası göstarir ki, sən*
*Özündan bu eybi kənar edəsən.*

Həqiqi dost dost üçün həm xəzinə, həm də dayaqdır, həm ata, həm qardaşdır. Nizami Gəncəvi Şərq fəlsəfi fikrinə istinad edərək qardaşın da dost olmasmı zəruri sayır və deyir ki, dost zəngin xəzinədir. Dost dosta irz sirrini bildirir, sevinc və kədərini onunla bölüşdürür. O, oğlu Məhəmmədə nəsihət edirəm yaxşı ad qazanmış dostlar aramağı, hərzə-hərzə danışmaqdan uzaq olmağı məsləhət bilir.

*Yaxşı ad qazanmış gözal dost ara,*
*Onda yetişarsan ağ giitıa, vara.*
*Xoş ətirli bir dost yaxşıdır, inan,*
*Hərzə-hərzə durub danışanlardan.*

Bununla Nizami insanları sədaqətli, xeyirxah, xoşəməlli olmağa çağırır. İnsan formalaşdıqca onun dostluğa böyük ehtiyacı yaranır. Dostu olmayan şəxs qolsuz-qanadsız kimi özünü hiss edir. Milli-mənəvi dəyərlər kimi xarakterizə olunan dostluğun öz modeli komponentləri vardır. Onun birinci komponenti dostluq haqda dərin biliyə malik olmaqdır. Tarix boyu bütün ahıl insanlar dostluq haqda müəyyən biliyə malik olmuş, bu anlayışın mahiyyətini, onun yolunu saxlamaq və s. mənimsədikdən sonra dostluq haqda fikir yürütmüşdür. Bu bilik insanın özünə sualıdır. Bilik səviyyəsində təfəkkür inkişaf edir. Böyüyən nəslin, bilik aldığı insanın özünə sualıdır. Bu bilik sayəsində təfəkkür inkişaf edir. Böyüyən nəslin bilik aldığı istiqamətlər müxtəlifdir. Onlar heç bir zaman dostluq haqqında bilik əldə etməyi düşünmürlər. Hər üzlərinə güləni, onlara yaxın olanı dost kimi qəbul edirlər. Əslində isə dostluq o zaman həqiqətə çevrilə bilir ki, bu anlayışın mahiyyətini duyub, qavramış olasan. Azərbaycan xalqının böyük şairi Əvhədi "Cami-Cəm'' əsərində biliyi ağlın zəkası, insanın yolunu işıqlandıran çıraq hesab etmişdir Əvhədi deyirdi:

Bütün bunlar göstərir ki, məktəbliləri dostluq, sədaqətlilik, etibarlılıq anlayışı ilə bağlı biliklərlə silahlandırmaqla onları səhv addımlar almaqdan uzaqlaşdırmaq olar. Demokrit yazırdı: "dərin, möhkəm bilik əidənin bünövrəsi, özül daşıdır". Şagirdlər bu biliklərə necə yiyələnir, həyatda öz təcrübəsi və əməli fəaliyyətində onlardan necə istifadə edir? kimi suallar müəllimləri düşündürməlidir. Ümumi təhsil məktəblərinin V-1X siniflərinin 50 nəfər müəllimi ilə apardığımız sorğuya: "Siz şagirdlərinizə dostluq, sadaqətlilik, etibarlılıq haqda hansı biliyi və necə verə bilirsiniz? sualı ilə müraciət etdik. Aldığımız cavab birmənalı olmuşdur: Belə zərurət yaranmamışdır. Bütün bunlara əsaslanaraq demək olar ki, istər şagirdlər, istərsə bu sahə ilə məşğul olanlarla bu istiqamətlərdə söhbətlər aparmaq zəruridir.

Dostluğun ikinci komponenti bu problemin mənasını təhlil etməyi, ümumiləşdirib nəticə çıxarmağı bacarmaqdır. Belə bir komponentin şagirdlərə öyrədilməsi müasir dövrdə daha aktuallıq kəsb edir. Ona görə də şagirdlərdə dostluq, sədaqətlilik, etibarlılıq anlayışını dərk edib, müstəqil fikir yeritməklərinə diqqət yetirilməlidir. Bunun üçün fənlərin tədrisi prosesində, sinifdənxaric tədbirlər zamanı bu imkanlara nail olmaq lazımdır.

Dostluğun üçüncü komponenti hər cür həyat şəraitində, hər bir çətinlikdə, həyatın hər məqamlarında dostunu müdafiə etməkdir. Şagirdlər dostları ilə nə qədər səmimi münasibətdə olursa-olsun, düşdükləri şərait onun təhlilini tələb edir. Dostlar düşdükləri mühitdə bir-birlərini qorumağı bacarmalı, xoşagəlməyən vəziyyət yaranarsa həmin şəraitdən dostunu çıxarmağı bacarmalıdır.

Dostluğun dördüncü komponenti fəal fəaliyyətdə dostların bir-birinə kömək etmələrinə səy göstərmələridir. Bəzən şagird dərslərdə geri qalan dostuna kömək etməyi öz vəzifəsi hesab edir. Bəzən evlərində, bəzən isə məktəbdə öz vaxtını dostunun fəallığına yönəldə bilirsə dostluğa uyğundur. Şagird dostunun uğurunu gördükdə sevinir, onu özündən irəlidə görmək üçün dostuna köməyi diqqətdə saxlayır.

Dostluq, etibarlılıq, sədaqətlilik Qasım bəy Zakirin də yaradıcılığında geniş yer tutmuşdur. Zakir Vətəni özünün həyatı, yaxın dostu, sirdaşı, sədaqətli həmdəmi hesab edirdi. Zakir gənc nəslin əxlaq tərbiyəsinə, dostluq, mərdlik, böyüyə hörmət və.s keyfiyyətlərin təşəkkülünə qayğı göstərməyi tələb edirdi. Zakirə görə birlik, dostluq, hər şeyə qadirdir. İnsana insandan kömək dəyməsə öləndə daş daş üstə durmaz. Orta məktəbin VI sinfində Q. Zakirin tədris olunan "Sədaqətli dostlar" təmsilində dostluqda etibarlı, sədaqətli olmaq şərh edilmişdir. Mövzusu "Kəlilə və Dimnə"dən olan bu təmsil sədaqətli dostluğun nə demək olduğunu yeni nəslə aşılayır. Zakirin fikrincə, hər kəs özünə uyğun dost seçməlidir. Dostluqda fikir həmrəyliyi, bərabərlik olmasa dostluq axıra qədər davam edə bilməz, özündən böyüyə xəyanət etməyin aqibəti pis olar. Tədris olunan mövzu ilə bağlı müəllimlərlə sorğu keçirməyi məqsədəuyğun hesab etdik. Müəllimə, "Dostluq, etibarlılıq, sədaqətlilik anlayışını şagirdlərə necə başa salırsınız?" sualı ilə müraciət olundu. Şagirdlərə bu problemlə bağlı verdiyimiz sualların cavablarına diqqət yetirsək onlara bu anlayışın necə mənimsədə bildiyimizi göstərə bilərik. Şagirdlərin dostlar haqda dedikləri sözlər:

- Ürək evinin qapısını ancaq sədaqətli dosta açmaq olar. - əsil dost heç vaxt düşmənə çevrilə bilməz.

- Dostun yolunu saxlamaq o qədər də asan deyildir. - yoldaşlar sınanandan sonra dost ola bilər. Təmsilə diqqət yetirək

*Ey əziz dostlar.*
*Dostluqda bir beyin, bu necə olar:*
*Özün bilə-bilə dostların darda*
*Asudə qalaydım mən bir kənarda*
*Allah o yoldaşa eyləsin qəzəb*
*Yalnız öz xeyrini eyləyər tələb.*

Q.B. Zakirin sözü gedən təmsili dostluqda sədaqətli, vəfalı, etibarlı olmağın zəruriliyindən bəhs edir. Osman Sarıvəlli deyirdi:

*Kimin ürək dostu, sirdaşı yoxsa*
*Onun bu dünyada dünyası yoxdur.*

Dostluq və yoldaşlıq, sədaqətlilik M.T. Sidqi yaradıcılığından da yan ötməmişdir. O, dostluğa böyük qiymət verir və deyirdi ki, insanlar arasında dostluq və ünsiyyətin olması zəruridir. İnsan sevinc və kədərini yaxın adamla, dostla bölmək istəyir. Yaxın dost çətin gündə tanınar. Onun fikrincə, kimin sədaqətli və səxavətli dostu varsa, onun fərəhi, sevinci çox, qəmi az olar. Dost insanın sirdaşıdır. Hər adamla dostluq etmək, hər adama dost demək olmaz. Dostun qədrini bilmək gərəkdir. Həqiqi, sadiq bir dost itirmək, dolu bir xəzinəni itirmək deməkdir. Dostluğun əsasını möhkəmləndirən sədaqətdirsə, onu uçurub dağıdan xəyanətdir. Heç bir şey yalan və xəyanət qədər dostluğun əsasını laxlada bilməz. Dosta-xəyanət ən böyük namərdlik və əxlaqdan kənar olmaq deməkdir. Dostluq və sədaqətlilik məktəbli həyatının zəruri məsələlərindəndir. M.M. Nəvvab insanlar arasında dostluq və yoldaşlığı zəruri mənəvi tələbat kimi şərh etmişdir. Nəvvaba görə, dostluğun mühüm şərti sədaqət və ağıldır. O, hiyləgər, yaltaq, ikiüzlü, paxıl, xəyanətkar adamlarla dostluğun son dərəcə təhlükəli olduğunu qeyd edir və belələrindən uzaq olmağı tövsiyə edirdi. Nəvvaba görə, həqiqi dost ömrünün bütün mərhələlərində dosta, dostluğa sadiq qalandır. İnsanın ürək dostu onun sirdaşıdır. Onun fikrincə, ağıllı dostlara malik olmaq böyük sərvətdir. Uşaqlarda dostluq, sədaqətlilik, etibarlıq tərbiyəsi onlarda məsuliyyət, təşəbbüskarlıq hissinin formalaşmasını zəruri edir. Mənəvi dəyərlərimizdən sayılan cəsarətlilik hər hansı bir işin icrası zamanı düzgün qərar çıxarmağı bacarmaq və onu cəsarətlə həyata keçirə bilməkdir. Dost seçimində atılan addımlar da cəsarətlilik tələb edir. Mənəvi-əxlaqi dəyərlərə malik olan şagird də dost seçimində daxilində formalaşan qətiyyətlilik və cəsarətlik göstərərək ağıllı və düzgün qərar qəbul edərək ona nail olmaqda da risk etməkdən belə çəkinmir. Aparılan araşdırmalar göstərir ki, dostluğun davamlılığı və daimiliyi onun qarşısına qoyulan tələblərə əməl etməkdən də çox asılıdır.

Bu tələblər sırasına: dostlar bir-birə nümunə olmalı: əqidə birliyinə malik olmalı: maraqların uyğunluğu; bir-birlərinə sədaqətliliyə: bir-birini başa düşməsi; inanmaq; intizamlılıq; təşəbbüskarlıq, diqqətlilik, əməksevərlik və s. daxildir.

Milli-mənəvi dəyərlərdən olan etibarlılıq da dostluğu şərtləndirən amillərdən biri kimi çıxış edir. Öz məzmunu və mahiyyətinə görə etibarlılıq çox aspektli etik kateqoriyadır. Etibarlılıq, əhdə vəfadarlıq əxlaqi, psixoloji, sosioloji və pedaqoji fenomendir. Etibarlılıq insanın yaxınına, dostuna, cəmiyyətə olan münasibətilə

ölçülür. Etibarlılıq ailəyə, dosta, yoldaşa, qonşuya, işlədiyi kollektivə olan məhəbbətlə şərtlənir. Etibar dövlətlər, xalqlar arasındakı münasibətlərdə də mühüm rol oynayır. O, təsadüfən yaranan anlayış deyildir. O, böyük zərurətdən, ictimai həyatın tələbatından yaranır. Etibarlılıq insanda insanlığın əlaməti kimi hər dövrdə zəruri olmuş, indi də zəruri olaraq qalır. Eyni zamanda etibarlılıq şəxsiyyətin mənəvi məsuliyyət və cavabdehliyinin təzahür formalarından biridir, o heç bir zaman gücünü itirə bilməz, həmişə istisi ilə insana sevinc gətirə bilər. Etibarlılıq insanın həm də şəxsi ləyaqətinin ölçülərindən biridir. Bu mühüm milli-mənəvi dəyər dostluğun yürüməsi üçün çox lazımı məsələlərdəndir. Çünki etibar olmadan dostluq da yalqız görünər. Bu baxımdan bu anlayışlar bir-birini tamamlayır. Bunları məktəbli yaddaşına köçürmək çox da asan deyildir. Şagirdlərlə apardığımız sorğu fikrimizi təsdiq edir.

S - dostluqda etibarlılığı gözləyirsinizmi?

C - dostum var ki, etibarlılıq gözləyim (IX sinif)

C - dost seçmək fikrimcə asan deyil, amma dost kim ola bilər, heç fikirləşməmişəm, anlayışım yoxdur (IX sinif).

C - istərəm dostum olsun, amma seçə bilmirəm (VIII sinif).

Dostluqda zəruri məsələlərdən biri də sədaqətlilikdir. Sədaqət, vəfa, əhdə sadiqlik, sözündə doğruçu kimi mənəvi dəyərlər sırasına daxildir. Sədaqət də təsadüfi yaranan məsələ deyildir. O da tələbatdan yaranmışdır. Uzun əsrlər boyu heç bir yazılı qanunlara malik olmayan insanların birgə yaşayışı yalnız onların bir-birinə öz qəbilə və tayfasına möhkəm etibarı və sədaqətliliyi sayəsində mümkün olmuşdur. Sədaqətlilik, etibarlılıqla bərabər addımlayır. Dostluqda bunlar olmasa o yürüməz. Dostluq geniş anlayışdır. Belə ki, onun istiqamətləri çoxdur. Ailədə dostluq, məktəbdə dostluq, həyatda dostluq, dövlətlərarası dostluq və s. Ümummilli liderimiz Heydər Əliyev Türkiyəyə hər səfərində dost ölkəyə səfəri kimi çıxış edirdi. O, hələ ümid körpüsünün açılışında "biz bir millət, iki dövlətik", - dedikdə dostluq tellərinin möhkəmliyini işarət edirdi. Bu gün də ulu öndərin varisi İlham Əliyev bu dostluq qanunlarını gözləyir, onu çıxışlarında əks etdirir. Bu dostluq xalq arasında böyük vüsət almış, bununla daim qürur duyulmuşdur. Türk xalqının dostluğunun ifadə forması onların ən çətin anda bizim yanımızda olmasıdır. Onlar da bizim qəhrəmanlıqla dolu həyat səhifələrimizdən qürur duyurlar. Bu duyğular qarşılıqlıdır. Türk xalqının böyük yazarı Orhan Kayınakın Azərbaycan xalqının igid oğlu milli qəhrəmanlıq səviyyəsinə yüksəlmiş Aydın Manerov haqda yazdığı şeri bu dostluğun ifadə formasıdır. O, yazır:

Ey kahraman asker şimdi anılırsın şehit diye

Birinci Karabağ savaşında koştun cepheye

Elinde silahın düşmanı verdin ateşe

Düşmanın attığı mermi değdi göğsüne

Şehit Aydın oldun, kaldın cephede

Sen de dönemedin binlerce şehit gibi evine

Karabağda öcün alındı, yaşayıp görseydin keşke

Şimdi Azerbaycan daha güclü, daha emin ellerde...

Bayrağımız daha nazlı, daha hür dalgalanıyor göklerde.

*(Birinci Karabağ şehidi Aydın Manerovun va tilm şehitlerimiz üçün yazılmışdı).*

*İctimailikdir, azsyaber portalının üzvü, şair, Orhan Kavmak. Ocak 2023. Ankara).*

Bütün bunlar göstərir ki, dostluqda sədaqət, etibar mühüm şərtdir. Bütün bunlara əsaslanaraq belə qənaətə gəlmək olur ki, böyüyən nəslə bu milli-mənəvi dəyərlərin aşılanması çox zəruridir. Onlar dost ölkələri, dost xalqları tanıyır, özlərinə dostlar seçdikdə sədaqətliliyi, etibarlılığı başlıca amil kimi qəbul etməyə hazır olurlar.

**Problemin aktuallığı.** Tərbiyənin tərkib hissəsi olan milli-mənəvi dəyərləri gələcək nəsillərə ötürülməsi və qorunub saxlanılması məqalənin aktuallığını təşkil edir.

**Problemin yeniliyi.** Apardığımız tədqiqatda bu problemin məktəblilərin həyatında önəmli rol oynadığının vacibliyinin müəyyənləşdirilməsidir.

**Problemin praktik əhəmiyyəti.** Əsərin praktik əhəmiyyəti ondan ibarətdir ki, dostluqda sədaqət, etibar mühüm şərtdir, milli-mənəvi dəyərlərin aşılanması çox vacibdir. Böyüyən nəsillər dost ölkələri, dost xalqları tanıyır və özlərinə dostlar seçdikdə etibarlılığı başlıca şərt kimi qəbul edirlər.

**Ədəbiyyat:**


1. Əliyev, P.B. Gənclərin milli-mənəvi dəyərlər əsasında tərbiyəsi. / P.B. Əliyev, H.H. Əhmədov. – Bakı: Təhsil, – 2006. – 267 s.
2. Əliyeva, G.B. Yeniyetmələrin mənəvi tərbiyəsinə təsir edən psixoloji amillər. (Metodik vəsait) / G.B. Əliyeva. – Bakı: ADPU, – 2004, – 47 s.
3. Əliyeva, X. Mənəvi dəyərlər tərbiyə işinin tərkib hissəsidir. // – Bakı: Azərbaycan məktəbi, – 2017. № 2, – s. 49-52.
4. Əhmədov, H.H., Əliyev P.B. Gənclərin milli-mənəvi dəyərlər əsasında tərbiyəsi. / – Bakı: ABU, – 2006. – 249 s.
5. Hüseynova, T.M. Şagirdlərin mənəvi tərbiyəsində bədii ədəbiyyatın təsir qüdrəti. / – Bakı: Maarif, – 1992. – 116 s.
6. İsmixanov, M.A. Gənclik və mənəvi tərbiyə. / M.A. İsmixanov – Bakı: Gənclik, – 1980. – 100 s.
7. Mehdizadə, M.M. Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi. / M.M. Mehdizadə. – Bakı: Maarif, – 1982, – 382 s.


**E-mail:** mansur.manerov@mail.ru

**Redaksiyaya daxil olub:** 08.07.2024

*UOT: 37.01*

***Günel Əmirxan qızı Əmirxanzadə***
*Bakı Dövlət Universitetinin*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*https://orcid.org/0009-0005-6253-6753*
*https://doi.org/10.69682/azrt.2024.91(3).81-84*

# MƏKTƏBLİLƏRİN LƏYAQƏT TƏRBİYƏSİNDƏN

***Гюнель Амирхан гызы Амирханзаде***
*докторант по программе доктора философии*
*Бакинского Государственного Университета*

# О ВОСПИТАНИИ ДОСТОИНСТВА У ШКОЛЬНИКОВ

***Gunel Amirkhan Amirkhanzadeh***
*doctoral student in the program of doctor of philosophy at Baku State University*

# ABOUT STUDENTS' DIGNITY AT SECONDARY SCHOOL

**Xülasə.** Məqalədə məktəblilərin ləyaqət tərbiyəsindən, böyüməkdə olan nəsillərdə ləyaqət, şərəf, namus, qeyrət, dəyanət və sair hissləri formalaşdırmaqdan bəhs edilir. Bu baxımdan ümumtəhsil məktəblərinin 5-9 cu siniflərin ədəbiyyat dərslikərində fənnin tədrisində sözügedən dəyərlərdən istifadə etməyin imkanları araşdırılmış, görkəmli alimlərin fikirlərinə müraciət olunmuş, xalq pedaqogikasından nümunələr gətirilmişdir.
***Açar sözlər:*** *məktəb, şagirdlər, ədəbiyyat, ləyaqət, namus, qürur, dəyanət, dəyər*

**Резюме**. В статье речь идет о воспитании достоинства у школьников, о формировании чувства чести, достоинства, гордости, честности, мужества у подрастающего поколения. В связи с этим исследованы возможности использования указанных ценностей при преподавании предмета в учебниках литературы 5-9 классов общеобразовательных школ, рассмотрены мнения видных ученых, приведены примеры из народной педагогики.
***Ключевые слова:*** *школа, ученики, литература, достоинство, честь, гордость, упорство, ценность*

**Summary.** The article deals with educating pupils' dignity, creating honour, dignity, pride, honesty, proud, courage in growing generation. Thus for methods of using these values have been researched in the literature textbook of 5-9 th grades, have been applied for prominent scientists' thoughts, and given samples from national pedagogics.
***Keywords:*** *school, students, dignity, honour, pride, determination, proud, value*

Müasir dövr cəmiyyət üçün ağıllı, öz hərəkət və davranışlarını tənzimləməyi bacaran, müasir ruhlu cəmiyyətə ləyaqətli övladlar tərbiyə etməyi məktəbin qarşısında qoyur. Ləyaqət insanın daxili dünyasında yaşayır, hərəkət və davranışında, insanlara münasibətində özünü təzahür etdirir. Ləyaqət insanın şəxsiyyət kimi formalaşmasına təkan verir, onun özünütəsdiq etməsinə əsaslanır. Ləyaqət ali hisslərdən biri olmaqla insanın mənəviyyatını təsdiq edir. Ləyaqət insanla addımlayan dəyərdir.

Professor A.N. Abbasov qeyd edir ki, ləyaqətin meyarı həm də mədəni olmaq, yaxşı tərbiyə görməkdir (1, s.108) Ləyaqət insanın rəftar və davranış normalarına münasibətdə müəyyən olunur. Ləyaqət insani münasibətləri tənzimləyir, hörmət və rəğbət hissini formalaşdırır.

Bu gün məktəblilərin informasiya texnologiyalarına meyilliliyin artması, həyat hadisələri-

nin məktəbli dünyasına təsiri bəzən onların həyatdakı mövqeyini dəyişir, özü də bilmədən xoşagəlməyən hadisələrin qurbanına çevrilə bilir.

Ləyaqət tərbiyəsi insanları bağışlanmaz hərəkətə yuvarlanmağın qarşısına sədd çəkir, onlarda müsbət hisslər tərbiyə edir. Elə bu səbəbdən də araşdırılan bu problem zəruriyyətdən yarandığını deməyə əsas verir, onun məktəblilərdə tərbiyə edilməsinin vacibliyini gündəmə gətirir. Onu da bildirmək lazımdır ki, ləyaqət tərbiyəsinin komponentləri çoxdur və onlar bir birini tamamlayır, aralarında keçilməz sədd yaradır. Bu sıraya şərəf, vicdan, ədalət, müdriklik, dəyanətlik, sözübütövlük, namus, qeyrət və s. daxil etmək olar. Qürur, şərəf, ləyaqət, namus bərabər yürüyürlər, ayrılmaz imkana malikdirlər. Ləyaqət, namus, qeyrət, şərəf tarixi kitabımız olan Kitabi Dədə Qorqud dastanının əsas motivlərindəndir. Qədim abidələrimizdən olan dastanımızda qəhrəman övladların timsalında bunları aydın görmək olur. Dastanın qəhrəmanları olan Basat, Buğday, Qazan xan, Bamsı Beyrək, Uruz, Dəli Domrul qadın xanımlarımızdan olan Banuçiçək, Burlaxatun ləyaqət, şərəf, namus və sair dəyərlərin daşıyıcılarıdırlar. Dastanda qalmaqal görməyən döyüş meydanında olmayan, əzablı yol keçməyən nə xanım gəlinlər və qızlar, nə də oğul və ərənlər vardır. Dastanda oğul atasının həyat yolunu davam etdirən, döyüşə girən, igidlik göstərən el obasını qoruyan igidlərdi. Oğuz elində əyilməz, qürurlu, namusunu qoruyan qızlar, xatunlar ləyaqətini hər şeydən üstün tutur, düşmənə boyun əymir. Uruz anasının düşmən tərəfindən tanına bilməsin deyə ana mənim ətimi hamı bir yesə sən iki ye, ta ki, atam Qazanın namusuna ləkə gəlməsin deməsi də fikrimizi təsdiq edir.

Bildiyimiz kimi orta məktəbin ədəbiyyat, tarix, coğrafiya və sair fənnlərin tədrisində şagirdlərin ləyaqət tərbiyəsində önəmli yer tuturlar. 5-9 cu siniflərin ədəbiyyat dərsliklərində şagirdlərdə ləyaqət, şərəf, vicdan, namus, qeyrət, dəyanət kimi dəyərləri tərbiyə etməkdə böyük imkanlar vardır. Ələmdar Quluzadənin "Alim və quldur", "İşığı söndürmə", "İlyas" , "İgid Mübariz", "Ana laylası" (5 ci sinif) "Ağabəyim ağa", "Bağban Rövşən", "Kitabi Dədə Qorqud", "Dərsimi yaz",(6 cı sinif) "Koroğlu", "Azad", "Babəkin andı", "Nurəddin", "Qazan xanın oğlu Uruz bəyin dustaqda olduğu boy", "Ana bala", "Zeylək qızı", "Vətən yaraları", "Zəhər" və sair mətnlər bu qəbildəndir.

Ədəbiyyat dərslərində xalqımızın şərəf, ləyaqət, namus, qeyrət, dəyanət və sair dəyərlərimizlə bağlı dəyərli mövzularımız çoxdur. 8 ci sinifdə tədris olunan Kitabi-Dədə Qorqud dastanında "Qazan xanın oğlu Uruz bəyin dustaqda olduğu boy"un tədrisi məktəblilərin şərəf, ləyaqət, namus, qeyrət və sair ruhda tərbiyə etməkdə əvəzsizdir. Şagirdlər bu dastanı öyrənməklə oğuz elinin psixologiyasına, onların yaşam tərzinə, adət ənənələrinə, sözübütövlüyə və s. yiyələnmiş olurlar.

Görkəmli psixoloq Ə.S. Bayramov "Etnik psixologiya məsələləri" kitabında etnoslardan danışarkən göstərmişdi: Hər bir xalq və ya etnos özünü düzgün dərk edib qiymətləndirmək və mənəvi tərəqqiyə nail olmaq üçün yalnız özünün sosial-iqtisadi, tarixi keçmişinə deyil, həm də öz psixoloji keçmişinə dərindən bələd olmalıdır. Yəni etnos və ya xalq kim olduğunu özünü nə zaman necə dərk etdiyini, necə tərəqqi etdiyini, tarix boyu nə kimi psixoloji dəyişikliklərə məruz qaldığını da yaxşı bilməlidir (2, s.111)

Dastanda göstərilən Qazan xan, Uruz, Burla xatun ləyaqət, namus və qeyrətlərinə görə yaddaşlarda dərin iz buraxanlardandırlar. Azərbaycan xalqının mənəvi fəzilətlərindən irəli gələn bu dəyərlər də xalqı tarixdə yaşatmışdır. Dastanda döyüşsüz, qalmaqalsız ağrılar görməyən heç kəs – nə cavan, nə qoca vardır. Dastan qəhrəmanları sınaqdan çıxanlardır. Ləyaqət, şərəf onlardan irəlidə gedir. Xan qızı boyu Uzun Burla xatun Qazanın gəldiyini eşidib atdan ayğır, dəvədən buğra, qoyundan qoç kəsdirdi. Bu kiçik ehtiram qadın ləyaqətinin ifadəsinin kiçik bir hissəsidir. Qadın ömür gün yoldaşının gəldiyi üçün məclis edir.

Burla xatun namusu ilə də seçilən qadınlarımızdandır. Xalq ədəbiyyatında deyildiyi kimi "namusu itə atıblar, it yeməyib." Çox ağır səslənən bu kəlmə Burla xatunun timsalında daha uca görünür. Düşmən əsirliyində olan Uruz atasının, anasının namusunu hər kəsdən, hər şeydən uca tutur. XI sinfin dərsliyində verilmiş "Kitabi-Dədə Qorqud" dastanındakı "Basatın təpəgözü öldürdüyü boy"u şagirdlərdə dəyanət, şərəf, igidlik, ləyaqət və sair milli mənəvi hisslərin formalaşmasına əsaslı təsir göstərir. Dastanda torpağını, el-obasını, təpəgözdən azad

edən Aruz Basatın dəyanətindən, hünərindən, qeyrətindən danışır. Basat təəssübkeşdir, düşüncəlidir, elini sevən, onun namus və qeyrətini qoruyandır. Allahını sevən, ona inanan, onun yolu ilə gedən, tanrının qüdrətinə səcdə edən gəncdir. Bununla birlikdə dərsliyin "Ağabəyim Aga" mövzusu da ləyaqət, şərəf namus və sairdən bəhs edir. Vətən, namusu, qeyrəti, şərəfi onu sözün əsl mənasında insanlıq zirvəsinə ucaltmışdır. Şuşa torpağı üçün alışıb yanan Ağabəyim Aga onun sərin bulaqlarına, laləli, xarıbülbüllü, torpaqlarına olan hisslərini ömrünün sonunadək yaşatdı. Vətənə çatmaq həsrətini o dünyaya apardı. Sevinc Nuruqızının qələmə aldığı bu əsər vətən namusunu, qeyrətini çəkən bir xanımın kiçik həyat tablosu idi. IX sinfin ədəbiyyat dərsliyində verilmiş Mir Cəlalın "Vətən yaraları" əsərindən ixtisarla verilmiş bir hissədə vətən qeyrətini, namusunu, şərəfini, ləyaqətini hər şeydən uca tutan obrazlarla tanış oluruq. Xəstəxanadan arxaya göndərilən əsgər və onun yoldaşlarının vətən şərəfindən, qürur və qeyrətindən, ləyaqətindən və sairdən bəhs edilir. Əsərdə Nəsrəddin və Lətifin yaxşılıqlarından onların həyat yolundan danışılır. Həm də onların şərəf və ləyaqətini əks etdirən tablolardan nümunələr gətirilir. Bütün bunlar da məktəbli dünyasına təsirindən kənarda qalmır. Dərslikdə verilmiş "Durna teli" (7 ci sinif ), "Koroğlu ilə Bolu bəy" ("Koroğlu dastanı") Koroğlu dastanında verilmiş şəxslərin hər birində şərəf, ləyaqət, şücaət, cəsurluq dəyərləri ilə zəngindir. Xalqımızın əfsanəvi qəhrəmanı olan Koroğlu məktəblilərin ləyaqət, dəyanət, igidlik və sair tərbiyəsində əvəzsizdir. Koroğlu həm igid, cəsur, tədbirlidir, qüvvətlidir, ağıllıdır, təmkinlidir, həm də nəğməkardır. Onun sözü qılınc kimi iti və kəsərlidir, mənalıdır və kəskindir. Ağıl ilə gücünün ifadəsi sazında, qılıncında özünü təcəssüm etdirir. Koroğlunun səfərlərindən də aydın görmək olur ki, düşmənləri ilə qarşılaşdıqda onlara psixoloji təsir göstərmək, sarsıtmaq məqsədi ilə qoşmalardan kəskin sözlərdən, Qıratdan, Misri qılıncdan, mərdlik, cəsurluq, şücaətindən, keçdiyi şərəfli həyat yolundan bəhs edir. Koroğlunun hər bir qolu, səfəri cəsurluq, mərdlik, namusluq, qeyrətlik, ləyaqətlik, sözübütövlük dəyərləri ilə bağlıdır. Koroğlunun Həsəni özünə tabe etməsi, Düratının Cəfər paşanın əsirliyindən qurtara bilməsi, Koroğlunun Ərzurum səfəri, Dəmirçioğlunu, Eyvazı, Bəlli Əhmədi Aslan paşanın əsarətindən azad etməsi Giziroğlu Mustafabəy ilə dost olması ("Durna teli"qolundan), Qıratı geri gətirməsi, Bəlli Əhmədi azad etməsi, Halaypozanı, Eyvazı və toxmaqvuranı Xəlil Paşanın əsirliyindən azad etməsi, Koroğlunun ilxını geri alması, Ərəb paşanın Koroğlu ilə üz üzə gəlməsi, Həsən paşanı mehtər kimi görməsi və s. cəsurluq, namus və qeyrətlik, şərəf və ləyaqətlik nümunələridir. Koroğlu dastanında at məğlubedilməzlik namus, qeyrət rəmzidir. Qırat, Dürat, Ərəbatı olmadan Koroğlu igidlərinin həyat döyüş yolu görülmür. Bu əfsanəvi atlar bizlər üçün müqəddəs olan dörd ünsür - torpaq, su, od, günəş kimi dörd ünsürünün ikisindən - torpaq və sudan meydana gəlmişlər. Hər iki at Koroğlunu məğlubedilməz, ucalardan uca etmişdir. Dastanda təbiət, torpaq, su və günəş də xalqın bütövlüyünü əks etdirir. Bu mövzunu tədris edərkən Azərbaycan xalqına məxsus ləyaqətlik, mübarizlik, ismətlik, sədaqətlik, namus və qeyrətlik dastanın qadın obrazlarının ruhuna köçmüş, onların ləyaqətini tənzimləməkdədir. "Koroğlu"da olan qadın və qızlar nəinki ismətli, ləyaqətli, sədaqətli xanımlardır, onlar həm də igid və qorxmazdılar. At oynadan, qılınc çalan tədbirli xanımlardır. Onlar kişilər kimi döyüşdən çəkinməyən, tədbirli, müdrikləşmiş şəxslərdilər. Bu xanımlar Çənlibeldə azad və rahatdırlar. Onlar kişilərlə bir süfrədə oturur, məsləhət verir, yol göstərir və döyüşlərdə birlikdə vuruşurlar. Bu qadınlar sırasında Koroğlunun ömür gün yoldaşı Nigar xanımın qeyrət, namus, şərəf və ləyaqəti özünü qabarıq şəkildə göstərir. Onun Çənlibelin ağbirçəyi, anası, yol göstərəni, qeyrət, ləyaqət mücəssəməsi kimi görürlər. Nigar əsərdə həm də Koroğlunun xanımı kimi sədaqətliyi ilə seçilir. Nigar xanımın Koroğluya bəslədiyi sədaqəti həm ülviliyini, həm məsuliyyətini, həm də sadiqliyini dərk edir. O çalışır ki, Koroğlunun şərəf və ləyaqətinə heç bir xələl gətirməsin. Dastanda verilən qadınlar cəsurdur, namusludur, şərəfli və ləyaqətlidir.

Şagirdlərin şərəf, ləyaqət, namus və qeyrətlik ruhunda tərbiyəsində 4 cü sinif dərsliyində verilmiş Abdulla Şaiqin "Kiçik qəhrəman" əsəridir. Əsərdə vətəni qorumağa gedən bir atanın Azay adlı oğlunun igidliyindən, ləyaqət və şərəfindən, namusundan söhbət açılır. Ləyaqət, şərəf, namus, dəyanət, şücaət, cəsurluq və s.

anlayışları yalnız qadınların davranışlarında yer almır, o həyatımızın bütün sahələrində özünü göstərir. Belə ki, vətən ləyaqəti, şərəfi, namusu, ailə ləyaqəti, şərəfi, namus və qeyrəti qohumların ləyaqətini, şərəfini, namusunu qorumaq o cümlədən ayrı ayrı fərdlərin öz ləyaqət, şərəf, namus, qeyrət və s. qorunub saxlanılması "Kiçik qəhrəman" əsərində də vətən şərəf və ləyaqətindən bəhs edir. Azayın atası müharibəyə gedərkən ona verdiyi sözləri xatırlayır. Tez-tez anası ilə onunla bağlı söhbət edir. O dəmiryolunun kənarı ilə gedərkən şübhə doğuran bir nəfərlə rastlaşır. Həmin şəxs relsin altına nə isə qoyur. Bunlar arsında mübahisə başlayır. Polis şübhəli adamı götürüb aparsa da, onun yadına relsin altına nə isə qoyması yadına düşür. O tez anasına məlumat verir. Qatarı saxlatdırırlar. Relslərin altına qoyulan dinamiti götürürlər. Kiçik Azayın qeyrəti, ləyaqəti hər şeyə qalib gəlmişdi. Şərəf, namus, ləyaqət şəxsiyyətin ucaldığını göstərən ən ali mənəvi dəyərlərdəndir. İnsanın varlığının bu ali dəyəri əxlaqın vicdan kateqoriyasını özündə birləşdirir. Vicdansız insanda nə ləyaqət, nə namus, nə də şərəf ola bilməz.

İlk dəfə antik yunan filosofu Sokrat tərəfindən "vicdan" anlayışı formula edilmişdir. Onun fikrincə vicdan insanın hər gün hərəkət və davranışına nəzarət etməli, həyatın onda tərbiyə etdiyi tələb və təsəvvürlərinə müvafiq olaraq davranmaq, insanların davranış və hərəkətlərinə düzgün qiymət vermək qabiliyyətinə yiyələnməlidir. Professor L. Qasımova göstərir ki, ləyaqət hər bir kəsin bir şəxsiyyət olaraq özünü dərk etməsi, öz heysiyyətini qoruyub saxlamağı bacarması və başqasının heysiyyətinə hörmətlə yanaşması, cəmiyyətdə, kollektivdə, xalq arasında nüfuz qazanmağa çalışa bilməsidir. Ləyaqət insanın rəftar və davranış normalarına münasibətdə müəyyən olunur (s.19).

M.Ə. Sabir "Uşaq və pul" şeirində namuslu, ləyaqətli olmağı vacib sayaraq göstərir ki, uşaq yolda pulunu sayarkən pulunu itirən qoca bir kişinin itirilmiş pulunu götürüb öz evinə gətirir. Bunu görən ana oğluna nəsihətlə doğrucu, namuslu, ləyaqətli olmağı vacib bilir və deyir:

"Gərçi pul çox fərəhfəzadır, oğul
Leyk namus pək bəhadır, oğul"!

Xalq pedaqogikasında göstərilir ki, "həya olmasa dünyanın nə faydası, nə yaşamağın mənası var", "həya olmadıqda namus da olmaz", "hər kəsin həyası olmasa mənliyi də olmaz", "namus və həya insanın mənasıdır". "Ləyaqətsiz adam heç nədən çəkinməz".

Oturub-durmaqda ədalətli, ləyaqətli olmaq, başqalarını dinləmək və onlara hörmətlə yanaşmaq mənəviyyatın bir mənalı formulasıdır. Məktəblilərdə bu keyfiyyətlərin formalaşdırılması zəruri məsələlərdəndir. O məktəbliləri kamilləşdirir, yetkinləşdirir, həyata hazırlayır.

**Problemin aktuallığı:** Dünya ölkələrinə inteqrasiyanın artdığı bir zamanda böyüyən nəslin ləyaqət tərbiyəsi önəmli yer tutur. Kütləvi informasiya vasitələrinə aludə olmaq, onun lazımsız məlumatlarından bəhrələnmək bu tərbiyəni yeniyetmələrə mənimsədilməsini aktuallaşdırır.

**Problemin elmi yeniliyi:** Məktəblərdə ləyaqət hissinin tərbiyə edilməsinin yol və vasitələri müəyyənləşdirilib ümumiləşdirilməsidir.

**Problemin nəzəri və praktik əhəmiyyəti:** Tədqiqat işi ləyaqət tərbiyəsinin yeniyetmələrə aşılanmasının yollarını göstərməklə ondan bəhrələnmək işini asanlaşdırır. Tədqiqatın praktik əhəmiyyəti böyükdür. Məktəbdə çalışan hər bir kəs, ondan yaradıcı şəkildə istifadə edəcək. Tədqiqatçılar bundan bir mənbə kimi istifadə edə biləcəklər.

**Ədəbiyyat:**

1. Abbasov, A.N. Milli əxlaq və ailə etikası. -Bakı: Mütərcim, -2016. -320 s.
2. Allahverdiyeva, S.B. Bədii ədəbiyyatın tələbə gənclərin ləyaqət tərbiyəsinə təsiri. -Bakı: - 2004. -107s.
3. Bayramov, Ə. Etnik psixologiya məsələləri. -Bakı: Elm və həyat, -1986. -202 s.
4. Qasımova, L.N. Ədəbiyyatın tədrisi prosesində şagirdlərin milli mənəvi dəyərlər əsasında tərbiyə edilməsi. -Bakı: BDU, -2003. -122s.
5. Qasımova, L.N. Ümumtəhsil məktəb şagirdlərinin milli-mənəvi dəyərlər əsasında tərbiyəsinin nəzəriyyə və təcrübəsi: pedaqogika üzrə elmlər doktoru dissertasiyası / -Bakı, 2005. -300s.

**E-mail:** gunel.amirxanzade@gmail.com
**Redaksiyaya daxil olub:**21.06.2024

***TARİXİN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ИСТОРИИ***
***HISTORY TEACHING METHODOLOGY***

*UOT372.894(47) Az*

***Mübariz Mirəziz oğlu Əmirov***
*pedaqogika elmləri doktoru, professor*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
*https://orcid.org/0009-0009-3806-4302*
*https://doi.org/10.69682/azrt.2024.91(3).85-88*

## TARİX DƏRSLƏRİNİN İNCƏSƏNƏTLƏ İNTEQRASİYASININ ŞAGİRDLƏRİN ESTETİK TƏRBİYƏSİNƏ TƏSİRİ

***Мубариз Миразиз оглы Амиров***
*доктор педагогических наук, профессор*
*Азербайджанский Государственный Педагогический Университет*

## ВЛИЯНИЕ ИНТЕГРАЦИИ УРОКОВ ИСТОРИИ С ИСКУССТВОМ НА ЭСТЕТИЧЕСКОЕ ВОСПИТАНИЕ УЧАЩИХСЯ

***Mubariz Miraziz Amirov***
*doctor of pedagogical sciences, professor*
*Azerbaijan State Pedagogical University*

## THE IMPACT OF INTEGRATION OF HISTORY LESSONS WITH ART ON THE AESTHETIC EDUCATION OF STUDENTS

**Xülasə.** Müasir təhsilin əsas məqsədi şagirdin təhsil ehtiyaclarını və maraqlarını təmin edən intellektual, mənəvi, əxlaqi, yaradıcı, fiziki və peşəkar inkişafı üçün şərait yaratmaqdır. Şagirdin insani dəyərlər aləm ilə tanış olmasını təmin edən və müsbət həyat fəaliyyəti təcrübəsini formalaşdıran təhsil ən mühüm vasitələrdən biri kimi sənətə müraciət edir. Bu məqalə şagirdlərin təhsilində tarix və incəsənətin inteqrasiyasını araşdırır. Məqalədə elmi və bədii biliklərin inteqrasiyasından bəhs edilir ki, bu da şagirdlərdə estetik tərbiyəsinin inkişafına kömək edir. Şagirdlər tarixi və incəsənəti həyatın müxtəlif sahələri kimi qəbul edirlər. Axı reallıq incəsənətin hər bir növünü özünəməxsus şəkildə əks etdirir və inteqrasiya şagirdlərin idrak yaradıcılıq fəaliyyətini aktivləşdirir. Bir xalqın tarixi bir xalqın taleyidir. Bu, onların şüurlu həyatıdır - milli dünya mədəniyyətində, indiki və gələcək zamanın və onların keçmişinin vəhdətində. Tarixi dərk etmək şagirdlərə onların varlığının mənasını açır, onlara həyatda uğur qazanmağa, özünü dərk etmək üçün bütün imkanlardan istifadə etməyə imkan verir. Bu imkanlar mədəni və sosial imkanlardır. Tarixi təhsil sisteminin təşkili üçün müxtəlif elmlər arasında qarşılıqlı əlaqə zəruridir.
***Açar sözlər:*** *inteqrasiya, incəsənət, tarix, yaradıcılıq fəaliyyəti, elm, mədəniyyət, dərs, təhsil, təfəkkür*

**Резюме**. Основной целью современного образования является создание условий для интеллектуального, духовно-нравственного, творческого, физического и (или) профессионального развития человека, удовлетворения его образовательных потребностей и интересов. Образование, обеспечивающее приобщение ребенка к миру человеческих ценностей, формирующее опыт позитивной жизнедеятельности, обращается к искусству как одному из важнейших средств. В данной статье на основе исследования рассматривается интеграция истории и искусств в обучении старших подростков. В статье обсуждается интеграция научных и искусствоведческих знаний, способствующая повышению эффективности обучения в целом. Подростки воспринимают историю и искусство как различные сферы жизни. Ведь реальность отражает по-своему каждый вид искусства, а интеграция активизирует познавательную творческую деятельность учащихся. История народа – это судьба

народа. Это осознанная их жизнь – в национальной мировой культуре, в единстве настоящего и будущего времени и их прошлого. Осмысление истории открывает учащимся смыслы их существования, позволяет им состояться в жизни, использовать все возможности для самореализации. Эти возможности – культурные и социальные. Для того, чтобы организовать систему исторического образования, необходимо взаимодействие разных наук.

***Ключевые слова:*** *интеграция, искусство, история творческая деятельность, наука, культура, урок, образование, мышление*

**Summary.** One of the main goals of educating children is a comprehensive upbringing of an accomplished personality oriented at their country and world cultural traditions. To educate means to introduce a child to the world of human values and one cannot do it without art. Based on a research this article reviews art and history integration into senior teens education. Integration of knowledge contributing to enhancement of effectiveness of learning in general is discussed. Senior teenagers perceive history and art rather in isolation. Indeed the reality reflects each type of art in its own way, and integration activates the creative cognitive activities of students. The history of the people is the fate of the people. It is the life perceived and created by the people in the national and world culture, in the unity of the present, the future and the past. The interpretation of history opens to students the meaning of their existence, allows them to actualize themselves, to use all opportunities for self-realization. These opportunities are cultural and social. In order to organize a system of historical education the interaction of different sciences is required.

***Keywords:*** *integration, art, history, creative activity, science, culture, lesson, education, thinking.*

Məktəbdə təlim-tərbiyə prosesində dərslərin inteqrasiyası şagirdlərin yaradıcı inkişafı üçün vacibdir. İnteqrasiya olunmuş dərslər fənlərarası əlaqələrin effektiv formalarından biridir. Dərslərin inteqrasiyası müxtəlif elmlərdən biliklərin sintezini tələb edir.

Müasir məktəbdə fənlərin inteqrasiyası sahələrindən biri pedaqoji həllərin fəal axtarışıdır. Bu, müəllimlərin yaradıcılıq potensialının inkişafına töhfə verir. Müəllimlərin yaradıcı potensialının əsas məqsədi təhsil məkanına inteqrasiya yolu ilə şagirdlərə səmərəli təsir göstərməkdir.

Sinifdə müxtəlif fəaliyyət növlərinin və biliklərin inteqrasiyası şagirdin dünyanı, özünü dərk etmək və həyatın konkret problemləri ilə qarşılaşdıqda təxəyyüllü düşünmə qabiliyyətini dərk etmək üçün keçdiyi yollardan biridir. Hətta K.D. Uşinski qeyd edirdi ki, uşaqların şüurunda nəyisə möhkəm həkk etmək istəyən müəllim əzbərləmə prosesində mümkün qədər çox hiss orqanının iştirakını təmin etməlidir.

İnteqrasiya olunmuş dərslər şagirdlərin yaradıcı fəaliyyətini də inkişaf etdirir. Dərsləri inteqrasiya etmək üçün müxtəlif elm, incəsənət, mədəniyyət sahələrindən olan məlumatlardan istifadə etmək, həmçinin ətrafdakı həyatın hadisə və anlayışlarına istinad etmək lazımdır.

İctimai şüurun əsas formalarından biri sənətdir. İncəsənət reallığın bədii və obrazlı əksidir. İncəsənət insanların yaradıcılıq qabiliyyətlərini inkişaf etdirməyə kömək edir, sosial mühitini genişləndirir, insanı tərbiyə edir, insanların dünyanı dərk etməyə, mənəvi görünüşünü, hiss və düşüncələrini formalaşdırmağa marağını oyadır. İncəsənət fərdin estetik inkişafına faydalı təsir göstərir. Sənətin idrak rolu onu elmə yaxınlaşdırır. Aristotelə görə, sənət tarixdən daha fəlsəfi və ciddi elementi ehtiva edir; poeziya tarixdən yüksəkdir. Beləliklə, qədim filosoflar sənətin insan həyatındakı rolunu müəyyən etməyə, onu elmdən bir qədər də yuxarıda qoymağa çalışmışlar. İncəsənət elmdən onunla fərqlənir ki, incəsənət bizi əhatə edən dünya haqqında təsəvvürlərini mücərrəd anlayışların köməyi ilə deyil, konkret bədii obrazların köməyi ilə ifadə edir. İnteqrasiya edilmiş dərsin ənənəvi dərsdən əsas fərqi, dərsdə digər fənlərdən məlumatların daxil edilməsini nəzərdə tutan fənlərarası əlaqələrin istifadəsidir. Bu daxiletmə epizodikdir [1].

Ənənəvi dərsdən fərqli olaraq inteqrasiya olunmuş dərslər şagirdlərin məntiqini, təfəkkürünü inkişaf etdirir, ətraf mühit haqqında biliklərini genişləndirir, kommunikativ bacarıqları inkişaf etdirir, nitqin, ümumiləşdirmə, nəticə çıxarmaq və müqayisə etmək bacarığının inkişafına kömək edir.

İnteqrasiya olunmuş dərslər formaca qeyri-standartdır. Şagirdlərin diqqətini saxlamaq üçün dərs boyu müxtəlif növ işlərdən istifadə etmək lazımdır. Bu cür, dərsin səmərəliliyindən yüksək səviyyədə danışmağa imkan verir. İnteqrasiya olunmuş dərslər hərtərəfli pedaqoji im-

kanları ortaya qoyur. Belə dərslərdə şagirdlər yorulmur və özlərini həddən artıq yükləmirlər. Bu, şagirdin diqqətini bir fəaliyyət növündən digərinə yönəltməklə baş verir. Belə dərslər şagirdlərin diqqətini, marağını, təfəkkürünü, yaddaşını və nitqini inkişaf etdirir. İnteqrasiya edilmiş dərslər öyrənməni də gücləndirir [2]

Bir faktı qeyd edək ki, inteqrasiyanın yaranması fənlərarası əlaqələrin nəticəsidir. Bir çox akademik fənlər bir-birinə bağlıdır. Elmi ideyalarda, anlayışlarda ümumi cəhətlərdən istifadə edərək, insan və onun dünyası haqqında, insan mədəniyyəti haqqında şagirdində genişləndirilmiş bilik və fikirlər formalaşdırmaq olar.

Böyük rus müəllimi K.D. Uşinski humanitar fənlərin tədrisini məhəbbət və humanizm ideyası ilə, habelə təbiət və insan dünyasını təsvir edən əsas anlayışlarla birləşdirmişdir.

Müəllimin əsas vəzifəsi şagirdlərə təhsil fəaliyyətini model üzrə öyrətmək, sonra isə onlara öz bacarıqlarını yeni şəraitdə tətbiq etməyi öyrətməkdir. Qeyd edək ki, bu halda reproduktiv fəaliyyətdən yaradıcı fəaliyyətə keçidin yaradıcılıq səviyyəsini inkişaf etdirmək və yüksəltməyə nail olmaq lazımdır. Onların nisbətini də tapmaq lazımdır.

Daha əvvəl qeyd edildiyi kimi, təhsil müəssisəsi qarşısında, ilk növbədə, əhalinin müxtəlif sosial qruplarından olan uşaqlar üçün başlanğıc imkanlarını bərabərləşdirmək, ikincisi, təhsilin əlçatanlığını təmin etmək vəzifəsi durur. Müəllim həm də öz işinizi şagirddə fərdi qabiliyyətlərin inkişafına və uğurun formalaşmasına yönəltməlidir.

Məktəbdə təlim prosesində üstünlük verilən yaradıcılıq yollarının seçilməsinə gəlincə, fikrimcə, bunlar müxtəlif elmlərdən biliklərin sintezini tələb edən və şagirdi maraqlandıra bilən inteqrasiya olunmuş dərslərdir.

İnteqrasiya şagirdlər üçün maraqlı və səmərəli olmaqla yanaşı, öz potensialını reallaşdırmaq üçün daim axtarışda olan müəllimin özünü də özünü ifadə etməyə, fəal yaradıcılığa həvəsləndirir.

Bu cür inteqrasiya olunmuş dərslər yeni faktların, yeni məlumatların axtarışına və kəşfinə kömək edir, daha çox şagirdlərin müxtəlif mövzularda müstəqil nəticə çıxarmaq bacarığı və müşahidələrini dərinləşdirir. Şagirdlər üçün mühakimə yürütməyə çalışmaq, problem və ya faktla bağlı öz baxışlarını çatdırmaq, əldə etdiyi nəticələri dərslik və müəllimin ümumi mülahizələri ilə müqayisə etmək daha maraqlı olur ki, bu da şübhəsiz ki, şagirdin özünə inamını daha da artırır.

Pedaqoji elmlər doktoru, professor T.S. Komarova rus pedaqogikasında inteqrasiya olunmuş siniflərin problemlərinə böyük diqqət yetirmişdir. T.S. Komarova hesab edir ki, inteqrasiya qarşılıqlı əlaqənin daha dərin formasıdır, bu bütün bədii və yaradıcı fəaliyyət növlərini əhatə edən şagirdlərin təhsil və tərbiyəsinin müxtəlif məzmunlarının bir-birinə nüfuz etməsidir. Müəllif eyni zamanda vurğulayır ki, "...inteqrasiyada sənətin bir növü əsas kimi çıxış edir, digəri obrazların daha geniş və dərindən dərk edilməsinə və müxtəlif ifadə vasitələrindən istifadə etməklə yaradılmasına kömək edir" [3, s. 24-25].

Yaranmış pedaqoji ənənəyə görə, "inteqrasiya" anlayışının iki mənası var: a) Şagirdlərə ətraf aləm haqqında daha tam vahid təsəvvürlərin aşılanması (bu elmi baxışla inteqrasiya təlimin məqsədi kimi çıxış edir); b) uşaqda biliyin bir-birinə nüfuz etməsi və bir-biri ilə əlaqəli olması haqqında ümumi təsəvvür yaratmaq (bu halda inteqrasiya öyrənmə vasitəsidir).

Yaradıcı inkişaf problemi pedaqogikada ən vacib məsələlərdən biridir. Şagirdin yaradıcılıq qabiliyyətlərinin üzə çıxarılmasının əsas mərhələsi bədii fəaliyyətin bir çox növləri vasitəsilə təxəyyülün inkişafıdır.

İnteqrasiya olunmuş dərslər şagirdin öyrənmə motivasiyasını əhəmiyyətli dərəcədə artırır, anlayışın fərqli nöqteyi-nəzərdən necə göründüyünü düşünmək, müqayisə etmək, empatiya qurmaq, anlamaq bacarığını, şagirdlərin daimi idrak marağını formalaşdırır, onlar hadisəyə müxtəlif nöqteyi-nəzərdən baxırlar, bu proses müəllim tərəfindən şüurlu şəkildə təşkil edilir və nəticədə inteqrasiya, böyük ölçüdə şagirdlərdə ümumi təhsil bacarıqlarının inkişafına kömək edir [4, s. 234].

Əsas məqsədlər bunlardır:

1) bədii təfəkkürün, gerçəkliyin bədii-estetik qavrayışının və yaradıcı fəaliyyətin formalaşması;

2) şagirddə yaradıcı təfəkkürün və onun bədii qabiliyyətlərinin inkişafı onun ünsiyyətdə və təhsildə, habelə oyunlarda həyata keçirilə bilən müxtəlif yaradıcı fəaliyyətlərə cəlb edilməsi

ilə baş verəcəkdir. Bədii rəngli yaradıcı fəaliyyət növləri böyüyən, formalaşan şagirddə bədii zövqü inkişaf etdirir və bütövlükdə uşağın bədii və yaradıcı inkişafına təkan verir;

3) tarix biliklərinin əsas mənimsənilməsi.

Müasir dərs işin reproduktiv formalarına deyil, inkişaf etdirici, yaradıcı olanlara yönəldilməlidir. İnnovativ pedaqoji texnologiyalardan biri də fənlərarası inteqrasiyadır. Bu texnologiya müasir dərsin bütün tələblərinə cavab verir.

Şagirdlərin intellektual fəaliyyətinin inkişafı üçün əsas şərtdir:

-incəsənət və tarix arasında əlaqə qurmaq;

-problemli təlim metodlarından istifadə etməklə "Tarix və İncəsənət" inteqrasiya olunmuş dərslərin qurulması;

- əyani və didaktik material, həmçinin "Tarix və İncəsənət" inteqrasiya olunmuş dərslər üçün tapşırıqlar toplusu;

- inteqrasiya olunmuş dərslərdə müəllimin yaradıcı fəaliyyəti;

- inteqrasiya olunmuş dərslərdə şagirdlər üçün yaradıcı mühitin yaradılması;

- şagirdlərin fənlərə marağının artırılması (öz təqdimatları etmək istəyi, biliklərin keyfiyyətinin yüksəldilməsi);

- şagirdlərdə dünyanın vahid mənzərəsinin formalaşdırılması, sənətdə, cəmiyyətdə və bütövlükdə dünyadakı hadisələr arasındakı əlaqənin dərk edilməsi;

- fərdi davranışın ümumi mədəniyyətini inkişaf etdirmək;

- şagirdlərin mənəvi dünyasının inkişafı; şagirdin öyrənməsinin "rahatlığı"; bədii kitablar, internet resursları ilə işləmək bacarıqlarını inkişaf etdirmək.

Əldə edilən nəticələrə əsasən, belə güman edə bilərik: eksperimentin nəticələri inteqrasiya olunmuş dərslərdə şagirdlərin intellektual inkişafının aktivləşdirilməsi metodunun effektiv olduğunu göstərir.

**Problemin aktuallığı.** Hal-hazırda Azərbaycan Respublikasında təhsilin modernləşdirilməsi pedaqoji heyətin qarşısında inteqrasiya olunmuş dərslərin gündəlik təcrübəyə daxil edilməsi vəzifəsi ilə üzləşir və bunun üçün bu prosesi nəzəri cəhətdən əsaslandırmaq və metodologiya hazırlamaq lazımdır.

**Problemin elmi yeniliyi.** Məqalə ümumtəhsil təhsil pilləsində tarix dərslərinin incəsənətlə inteqrasiyanın şagirdlərin estetik tərbiyəsində əhəmiyyəti məsələsinə həsr edilmişdir.

**Problemin praktik əhəmiyyəti və tətbiqi**. Məqalədən orta ümumtəhsil məktəblərinin müəllimləri, tələbə və magistrantlar istifadə edə bilərlər.

**Ədəbiyyat:**

1. Бушковская Е.А. Междисциплинарная интеграция как феномен философии и стратегия обучения // Молодой ученый- Ежемесячный научный журнал. 2009. № 5. -с.181-184.
2. Афанасьева О.Ю. Коммуникативное образование студентов педагогических вузов на основе идеи междисциплинарности // Педагогическое образование и наука. 2006. №2. -с. 24–28.
3. Коморова Т.С. Методика Metodika обучения изобразителбной дкятельности и конструировании -Мрсква: Просвещение, -1979.
4. Криворотова Т.А. Интеграция как фактор развития нового качества образования // Экономика. Право. Образование: региональный аспект. – Нижний Новгород, 2010. -с. 233–238.

**E-mail:** mubariz.amir@mail.ru

**Redaksiyaya daxil olub:** 24.06.2024

*UOT372.894(47) Az*

***Turanə Fazil qızı İsmayılova***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*https://orcid.org/0000-0001-6462-7759*
*https://doi.org/10.69682/azrt.2024.91(3).89-92*

# AZƏRBAYCAN TARİXİNİN TƏDRİSİ ZAMANI TƏLƏBƏLƏRİN İDRAK FƏALLIĞININ YÜKSƏLDİLMƏSİNDƏ TARİXİ ƏDƏBİYYATIN İMKANLARI VƏ ROLU

***Турана Фазиль гызы Исмайлова***
*докторант по программе доктора философии*
*Института Образования Азербайджанской Республики*

# ВОЗМОЖНОСТИ И РОЛЬ ИСТОРИЧЕСКОЙ ЛИТЕРАТУРЫ В ПОВЫШЕНИИ ПОЗНАВАТЕЛЬНОЙ АКТИВНОСТИ СТУДЕНТОВ ПРИ ПРЕПОДАВАНИИ ИСТОРИИ АЗЕРБАЙДЖАНА

***Turana Fazil Ismailova***
*doktoral student of the Institute of Education of the Republic of Azerbaijan*

# POSSIBILITIES AND ROLE OF HISTORICAL LITERATURE IN INCREASE COGNITIVE ACTIVITY OF STUDENTS DURING TEACHING HISTORY OF AZERBAIJAN

**Xülasə.** Məqalədə ilk növbədə ali məktəblərdə Azərbaycan tarixinin tədrisində tələbələrin idrak fəallığının inkişaf etdirilməsində mövcud olan Azərbaycan tarixi ilə bağlı müasir ədəbiyyatların rolu və imkanlarından bəhs olunur. Elmi araşdırmalar və təcrübə göstərir ki, Azərbaycan tarixi dərslərinin tədrisində idrak fəallığının yüksəldilməsi mühüm əhəmiyyət kəsb edir. Araşdırma zamanı məlum olur ki, Ali Məktəblərdə Azərbaycan tarixinin tədrisində idrak fəallığının yüksəldilməsi probleminin təhlili üçün hazırlanmış konkret ədəbiyyat mövcud deyil. Lakin konkret olmasa da bütün təhlil apardığımız ədəbiyyatlarda, dərs vəsaiti və dərsliklərdə bu məsələ ön plana çəkilmiş, işıqlandırılır.
***Açar sözlər:*** *Ali məktəb, Azərbaycan tarixinin tədrisi, idrak fəallığı, Dağlıq Qarabağ, Azərbaycan Səfəvi dövləti, XX əsr milli azadlıq hərəkatı ,Heydər Əliyev, İlham Əliyev*

**Резюме.** Прежде всего, в статье говорится о роли и возможностях современной литературы по истории Азербайджана в развитии познавательной активности студентов при преподавании истории Азербайджана в высших школах. Научные исследования и опыт показывают, что повышение познавательной активности имеет большое значение при преподавании уроков истории Азербайджана. В ходе исследования стало известно, что специальной литературы для анализа проблемы повышения познавательной активности при преподавании истории Азербайджана в высшей школе не подготовлено. Однако, даже если он и не конкретен, этот вопрос выдвигается на первый план и освещается во всей проанализированной нами литературе, учебных пособиях и учебниках.
***Ключевые слова:*** *высшая школа, преподавание истории Азербайджана, познавательная деятельность, Нагорный Карабах, Сефевидское государство Азербайджана, национально-освободительное движение XX века, Гейдар Алиев, Ильхам Алиев.*

**Summary.** First of all, the article talks about the role and possibilities of modern literature on the history of Azerbaijan in the development of students' cognitive activity in the teaching of Azerbaijani history in higher schools. Scientific studies and experience show that increasing cognitive activity is of great importance in the teaching of Azerbaijani history lessons. During the research, it is known that there is no

specific literature prepared for the analysis of the problem of increasing cognitive activity in the teaching of Azerbaijani history in Higher Schools. However, even if it is not specific, this issue is brought to the fore and highlighted in all the literatures, teaching aids and textbooks that we have analyzed.

***Keywords:*** *Higher school, teaching of Azerbaijani history, cognitive activity, Nagorno-Karabakh, Safavid state of Azerbaijan, 20th century national liberation movement, Heydar Aliyev, Ilham Aliyev*

Təhsil həm insanın əvvəlki nəsillər tərəfindən yığılmış biliklərə, dəyərlərə, təcrübəyə yiyələnməsi prosesi, həm də bu prosesin nəticəsidir. Təhsil anlayışına tədris prosesinin nəticəsi kimi təkcə bilik, səriştə və bacarıqlar deyil, həmçinin tənqidi düşünmə, ətrafda baş verən prosesləri qiymətləndirmə, yaratma da daxildir. [9, s.57].

Dərslikdə müasir təlim texnologiyalarından istifadə tələbələrə düşünməkdə – idrak prosesinə fəal cəlb olunmaqda, mürəkkəb vəziyyətlərin həlli yolunu tapmaqda mühüm əhəmiyyət kəsb edir.

Azərbaycan tarixinin müasir dövrünün mənzərəsinin tələbələrin idrakında dərk etdirilməsində Azərbaycanın müasir tarixinin məzmunun təkmilləşdirilməsində qiymətli mənbələrdə biri də müəllifi professor Sevinc Seyidovanın "Ermənistan Azərbaycana qarşı təcavüzü və Ermənistan-Azərbaycan Dağlıq-Qarabağ münaqişəsində beynəlxalq təşkilatların mövqeyi" adlı monoqrafiyadır [9].

Nuriyeva İradə Tofiq qızının Azərbaycan tarixi (ən qədim dövrlərdən zəmanəmizədək) ali məktəblər üçün hazırlanmış Azərbaycan tarixi dərsliyi 744 səhifədən, 14 fəsildən ibarətdir. Dərslikdə Azərbaycan tarixinin əsasən ən qədim dövrlərdən zəmanəmizədək baş verən bütün tarixi, siyasi və iqtisadi prosesləri ümumiləşdirilərək daha sadə şəkildə aydın şərh olunmuşdur. Texniki ali məktəblər üçün nəzərdə tutulan "Azərbaycan tarixi" adlı dərslik ali məktəb müəllimləri, bakalavr və magistr pilləsində bütün ixtisaslar üzrə təhsil alan tələbələr üçün məsləhətlidir [8,s.9]. Dərsliyin XIV fəsli Müstəqil Azərbaycan Respublikası adlandırılmış və 3 bənd üzrə bölünmüşdür. 1-ci bənd [s.501-529] Dövlət müstəqilliyinin bərpa olunması və onun möhkəmləndirilməsi uğrunda mübarizə (1991-1995-ci illər), 2-ci bənd [s. 530-608] Azərbaycan Respublikası XX əsrin 90-cı illərinin ikinci yarısı-XXI əsrin ilk onilliklərində, 3-cü bənd [s.609-674] Ərazi bütövlüyünün bərpa edilməsi uğrunda mübarizə. II Qarabağ (Vətən) müharibəsi və onun nəticələri adlanır. Ali məktəb tələbələrinə Azərbaycan tarixinin daha sadə və aydın səmərəli mənimsədilməsində istifadə üçün mühüm əhəmiyyət kəsb edir. Müasir dövrümüzü sona qədər işıqlandırma baxımından vacib əhəmiyyətli dərslikdir [8].

Tarix üzrə fəlsəfə doktoru Yunis Hüseynov tərəfindən yazılmış Azərbaycanın Qarabağ bölgəsinin tarixi əsəri 2019-cu ildə nəşr edilmişdir, 208 səhifədən ibarətdir. Azərbaycanın Qarabağ bölgəsinin tarixinin öyrənilməsi üçün ali məktəb tələbələri üçün maraqlı əsərdir. Kitabda Qarabağ bölgəsinin qədim tarixi, xüsusilə bölgənin xanlıqlar dövrü işıqlandırılmışdır. Müəllif əsəri zəngin, mötəbər mənbələr, arxiv materialları, xeyli tarixi ədəbiyyatlardan bəhrələnərək ərsəyə gətirmişdir. Əsərdə Qarabağ xanlığının 75 illik tarixi təhlili tədqiq edilmişdir. [6]

H. Həsənovun [5] yazdığı Azərbaycan tarixi (XVIII əsrin son rübü - XIX əsrin əvvəlləri) dərs vəsaiti 144 səhifədən ibarətdir. Dərs vəsaitində XVIII əsrin son rübü - XIX əsrin əvvəllərində Azərbaycanda baş verən hadisələr, Rusiya və Qacarlar dövləti münasibətlərində Azərbaycanın yeri və Şimali Azərbaycan torpaqlarının çar Rusiyası tərəfindən işğalı yeni yanaşmadan izah edilmişdir. Dərs vəsaitində XVIII əsrin ikinci yarısında yaranmış Azərbaycan xanlıqlarının daxili siyasi vəziyyəti təhlil edilərək bəhs olunan dövrdə təşəkkül tapmış beynəlxalq münasibətlərin Azərbaycan xanlıqlarının siyasi həyatına təsiri öyrənilmiş, Kərim xan Zəndin Azərbaycan xanlıqlarına münasibətdə yeritdiyi siyasətin mahiyyəti açılmış, Rusiyanın Şərq siyasətində Azərbaycanın yeri müəyyən olunmuşdur. Müəllif rus erməni blokunun Azərbaycan torpaqlarını parçalamaq, Azərbaycan ərazisində erməni dövləti yaratmaq planlarını ifşa edərək XVIII əsrin sonu -XIX əsrin əvvəllərində Azərbaycanda Rusiya işğallarının başlanması və Qacarlar dövlətinin buna münasibətini hərtərəfli işıqlandırmışdır. Həmçinin dərs vəsaitində Azərbaycan tarixində ilk dəfə Ağa Məhəmməd xan Qacarın cənub xanlıqlarını itaətə gətirmək uğrunda mübarizəsi mərhələlərə bölünmüş, hər bir mərhələnin özünəməxsus xüsu-

siyyətləri müəyyənləşdirilmişdir. Bu məqamda türkçülük ideyaları ön planda verilmiş, ilk dəfə olaraq Ağa Məhəmməd Qacarın siyasətində proqressiv cəhətlər qabardılmışdır [5, s. 4].

Dərs vəsaiti ali məktəblərin bakalavr pilləsində təhsil alan tarix müəllimliyi, tarix –coğrafiya müəllimliyi ixtisasları, həmçinin pedaqoji universitetinin digər ixtisas məktəb tələbələri, magistrantlar və maraqlananlar üçün nəzərdə tutulmuşdur.

T.H. Nəcəflinin monoqrafiyasında Azərbaycan Səfəvi dövlətinin xarici siyasətinin Türkiyə tarixşünaslığında tədqiqi səviyyəsi öyrənilmişdir. Əsərdə Azərbaycan Səfəvi dövlətinin xarici siyasət tarixinə dair zəngin faktik material verilir. Gərəkli və qiymətli tədqiqatdır. Tələbələrə bu dövrün xarici siyasəti barədə düzgün elmi nəticələr əldə etməsi üçün gərəkli və vacib monoqrafiyadır. [7, s.7]

"Yeni Qarabağnamə: Qarabağ və Şərqi Zəngəzur iqtisadi rayonlarında post-konflikt quruculuğu" adlı kitab da mühüm əhəmiyyətlidir. Müzəffər Ali Baş Komandanın rəhbərliyi ilə rəşadətli Azərbaycan Ordusu 44 gün sürən hərbi əməliyyatlar zamanı düşmən üzərində tarixi zəfər çalaraq torpaqlarımızı işğaldan azad etdi. Vətən müharibəsindən dərhal sonra işğaldan azad ərazilərimizdə bərpa quruculuq işləri başlandı. Bu zaman bir daha aydın oldu ki, Ermənistan Respublikası Azərbaycan torpaqlarını işğal altında saxladığı 30 il ərzində şəhər və kəndlərimizi qəsdən dağıdaraq, 9 şəhəri və yüzlərlə kəndi yer üzündən silib. Ermənistan mədəni və dini abidələri talan edərək həmin əraziləri urbisid və kultursidin bariz nümunəsinə çevirib. Hətta Ağdam şəhərini dağıntıların miqyasına görə mütəxəssislər, "Qafqazın Xirosiması" adlandırıblar. Kitab işğaldan azad edilən ərazilərimizdə aparılan bərpa və yenidənqurma işlərindən və Böyük Qayıdış prosesindən bəhs edir. Kitabdan hər kəs faydalana bilər [10].

Tarix üzrə elmlər doktoru, professor Mais İsrail oğlu Əmrahovun XX əsrdə Azərbaycanda milli azadlıq hərəkatı. Ali məktəblər üçün dərsliyi 484 səhifə, XII fəsildən ibarətdir. I fəsil XX əsrdə Azərbaycanda milli azadlıq hərəkatı tarixinin tarixşünaslığı, II Fəsil XIX əsrin sonu -XX əsrin əvvəllərində Şimali Azərbaycanın iqtisadi, ictimai-siyasi vəziyyəti. Milli demokratik fikir, III fəsil Birinci Dünya müharibəsi ərəfəsi və dövründə Azərbaycanda milli-demokratik hərəkat, IV fəsil 1917-1920-ci illərdə Azərbaycanda milli azadlıq hərəkatı. V fəsil 1917-1920-ci illərdə Cənubi Azərbaycanda vəziyyət, VI fəsil Azərbaycan 1920-1940-cı illərdə, VII Fəsil Azərbaycan İkinci Dünya müharibəsi illərində, VIII fəsil Azərbaycanlıların Ermənistan SSRİdən - tarixi ərazilərindən deportasiyası, IX fəsil XX əsrin 50-60-cı illərində milli müstəqillik uğrunda mübarizə, IX fəsil XX əsrin 50-60-cı illərində milli müstəqillik uğrunda hərəkat, X fəsil 1978-1979-cu illər İran inqilabı və Cənubi Azərbaycan, XI fəsil XX əsrin sonlarında Azərbaycanda milli azadlıq hərəkatı, XII fəsil Heydər Əliyev Müstəqil Azərbaycan dövlətinin memarıdır adlanır. Azərbaycan xalqının milli oyanışı əsasən XX əsrlə bağlıdır. Bu gün respublikamızın yeritdiyi milli siyasətə təsir göstərən əsas amillər xalqımızın milli təfəkkürü ilə bağlı olub XX əsrin əvvəllərindən təşəkkül tapıb formalaşmağa başlayıb. XX əsr xalqımızın siyasi mədəniyyətinin formalaşması uğrunda mübarizə tarixidir [4, s.5]. Müstəqil Azərbaycan Respublikası Azərbaycan Demokratik Respublikasının varisidir. Bu baxımdan, XX əsrin əvvəllərindən başlayaraq ADR-ə gedən yolun, Azərbaycan xalqının sovetlər dövründə özgürlüyünü qoruyub saxlaması və müstəqil dövlət quruculuğu uğrunda xalqımızın mübarizəsi tarixinin öyrənilməsi xüsusi vacib əhəmiyyətə malikdir. XX əsrdə Azərbaycanda milli azadlıq hərəkatı mövzusu geniş olmaqla bərabər, hərtərəfli araşdırmaya ehtiyac duyulan problemlərdən olsa da, bu vaxtadək tələbələr üçün ümumiləşdirilmiş vəsait hazırlanmamışdır. Ali məktəb tələbələri üçün dərslik kimi nəzərdə tutulmuş XX əsrdə Azərbaycanda milli -azadlıq hərəkatı kitabı bu sahədə ilk təşəbbüsdür. Dərslik ilk dəfə 2009-cu ildə nəşr edilmişdir. Yenidən təkmilləşdirilmişdir [4, s. 6].

Bu göstərilən məsələlərdən, yeri gəldikcə, tarix dərslərində istifadə edilməklə tələbələrin Azərbaycan tarixi dərslərində idrak fəallığının yüksəldilməsinə nail olmaq mümkündür.

Bu əsasda "İlham Əliyev. İnkişaf - məqsədimizdir" çoxcildliyi Azərbaycan tarixinin müasir dövrünün dəqiq və aydın ardıcıllıqla geniş mənimsənilməsində sanballı mənbə külliyyatıdır.

Nəşrinə 2008-ci ilin dekabrından başlanılan "İlham Əliyev. İnkişaf - məqsədimizdir"

çoxcildliyi dövlətimizin uğurlu daxili və xarici siyasətini, ölkəmizin sosial-iqtisadi həyatının müxtəlif sahələrini, beynəlxalq aləmdə mövqeyini, bir sözlə, ən yeni tariximizi əks etdirən və bununla da fəaliyyət istiqamətlərimizi müəyyənləşdirən dəyərli kitablardır.

Yubiley nəşri 2020-ci ilin yanvar-fevral aylarını əhatə edir [2]. Yüzüncü kitabda Prezident İlham Əliyevin Davos İqtisadi Forumunun illik toplantısında iştirak etmək üçün İsveçrə Konfederasiyasına işgüzar səfərinin materialları, müxtəlif ölkələrin dövlət və hökumət rəhbərləri, beynəlxalq təşkilatların nümayəndələri və şirkət rəhbərləri ilə görüşləri haqqında informasiyalar toplanıb. "İlham Əliyev. İnkişaf - məqsədimizdir" çoxcildliyinin 123-cü kitabı da çapdan çıxıb. Çoxcildliyin yeni kitabındakı materiallar 2022-ci ilin oktyabr-noyabr aylarını əhatə edir [3].

**Problemin aktuallığı.** Tədris prosesində tələbələrin tarixi biliklərinin möhkəmləndirilməsini təmin edir.

**Problemin yeniliyi.** Müasir tarixi ədəbiyyatların müxtəlifliyi auditoriyanı daha effektiv idarə edərək tələbələri dərsə cəlb etmək imkanı yaradır.

**Problemin praktik əhəmiyyəti.** Tələbələrin idrak fəallığının yüksəldilməsində mühüm praktik əhəmiyyət kəsb edir.

**Ədəbiyyat:**


1. Bolonya prosesində istifadə edilən termin və anlayışların izahlı lüğəti University of Genoa -Odlar Yurdu Universiteti -Bakı, 2014.
2. Əliyev İ. H. İnkişaf – məqsədimizdir. B. 100-cü kitab. (Yanvar 2020 – fevral 2020) -Bakı : Azərnəşr, -2020. -400 s.
3. Əliyev İ. H. İnkişaf – məqsədimizdir. B. 123-cü kitab. (oktyabr 2022 – noyabr 2022) -Bakı : Azərnəşr, -2022. -392s.
4. Əmrahov. M.İ. XX əsrdə Azərbaycanda milli azadlıq hərəkatı. Ali məktəblər üçün dərslik. / M.İ. Əmrahov. - Bakı: ADPU-nun nəşriyyatı, -2018. - 484 s.
5. Həsənov H.İ. Azərbaycan tarixi (XVIII əsrin son rübü -XIX əsrin əvvəlləri) dərs vəsaiti. / H.İ. Həsənov .- Bakı: ADPU-nun nəşriyyatı, 2019.-144 s.
6. Hüseynov Yunis Azərbaycanın Qarabağ bölgəsinin tarixi. -Bakı, 2019. - 208 s.
7. Nəcəfli T.H. Azərbaycan Səfəvi dövlətinin xarici siyasəti (Türkiyə tarixşünaslığında ). -Bakı: “Turxan NBP”, -2020. -520 s.
8. Nuriyeva, İ.T. Azərbaycan tarixi (ən qədim dövrlərdən zəmanəmizədək).Texniki ali məktəblər üçün dərslik. / İ.T. Nuriyeva -Bakı: Elm və Təhsil, -2022. -744 s.
9. Seyidova .S.M Ermənistanın Azərbaycana qarşı təcavüzü və Ermənistan -Azərbaycan Dağlıq Qarabağ münaqişəsində beynəlxalq təşkilatların mövqeyi. -Bakı: ADPU -nun nəşriyyatı, -2014. -381 s.
10. “Yeni Qarabağnamə: Qarabağ və Şərqi Zəngəzur iqtisadi rayonlarında post-konflikt quruculuğu”. -Bakı: Azprint, -2022. -217 s.


**E-mail:** turanaismayilova1122@gmail.com
**Redaksiyaya daxil olub:**05.06.2024

## *KİMYANIN TƏDRİSİ METODİKASI*
## *МЕТОДИКА ПРЕПОДАВАНИЯ ХИМИИ*
## *CHEMISTRY TEACHING METHODOLOGY*

*UOT 372.854*

***Ульвия Шаеддин гызы Ахундова***
*диссертант по программе доктора философии*
*Азербайджанский Государственный Педагогический Университет*
*https://orcid.org/0009-0003-1126-7536*
*https://doi.org/10.69682/azrt.2024.91(3).93-97*

# ВАЖНОСТЬ ИСПОЛЬЗОВАНИЯ МОДЕЛИРОВАНИЯ ПРИ ПРЕПОДАВАНИИ ХИМИИ В ОБЩЕОБРАЗОВАТЕЛЬНЫХ ШКОЛАХ

***Ülviyyə Şaəddin qızı Axundova***
*fəlsəfə doktoru proqramı üzrə dissertant*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ KİMYA FƏNNİNİN TƏDRİSİNDƏ MODELLƏŞDİRMƏDƏN İSTİFADƏNİN ƏHƏMİYYƏTİ

***Ulviya Shaaddin Akhundova***
*doctoral student in the program of doctor of philosophy*
*Azerbaijan State Pedagogical University*

# THE IMPORTANCE OF USING MODELING WHEN TEACHING CHEMISTRY IN SECONDARY SCHOOLS

**Резюме.** В статье повествуется о том, что имеется большой интерес как учителей, так и учащихся к использованию моделирования в процессе преподавания химии в общеобразовательной школе. Правильное применение моделирования в учебном процессе облегчает работу учителя и повышает интерес учащихся к данному предмету. С применением моделей повышается наглядность уроков, мультимедийные системы стимулируют качество работы, активизируют все органы чувств учащихся, а за счет повышения качества обучения создаются условия для длительного сохранения усвоенных знаний.
***Ключевые слова:*** *химия, моделирование, ученик, учитель, преподавание, химические процессы*

**Xülasə.** Kimya fənninin orta ümumtəhsil məktəblərində tədrisi prosesində modelləşdirmədən istifadəyə aid həm müəllimlərdə, həm də şagirdlərdə böyük maraq vardır. Modelləşdirmənin tədris prosesində düzgün tətbiq olunması həm müəllimlərin işlərini asanlaşdırır, həm də şagirdlərin həmin mövzuya maraqlarını artırır. Modellərin tətbiqi ilə dərslərin əyaniliyi artır, multimedia sistemləri işin keyfiyyətini yüksəldir, şagirdlərin bütün qavrama hiss üzvləri aktiv olur, mənimsənilmənin keyfiyyətini artırmaqla öyrənilən biliklərin uzunmüddətli saxlanılmasına şərait yaradır.
***Açar sözlər:*** *kimya, modelləşdirmə, şagird, müəllim, tədris, kimyəvi proseslərin*

**Summary.** There is a great interest of both teachers and students in the use of modeling in the process of teaching chemistry in a secondary school. The correct use of modeling in the educational process facilitates the work of the teacher and increases the interest of students in this subject. With the use of models, the visibility of lessons increases, multimedia systems stimulate the quality of work, activate all the senses of students, and due to the increase in the quality of education, conditions are created for the long-term preservation of acquired knowledge.
***Keywords:*** *chemistry, modeling, student, teacher, teaching, chemical processes*

С помощью компьютерного моделирования можно получить электронную структуру атомов различных элементов, межатомные ковалентные и ионные связи, межмолекулярные водородные связи, электронные облака. Механизм образования сигма ς- и π-связей, которые являются разновидностью ковалентных связей, а также процесс гибридизации в атомах, связи, образующиеся между гибридными орбиталями, и взаимодействие иономеров могут быть также получены с помощью компьютерного моделирования.

Как известно, некоторые физические свойства органических веществ изменяются в соответствии с гомологическим порядком, к которому они принадлежат Правда, в некоторых случаях возможны и отклонения от закона. П.И. Беспалов [4]. применил программу Microsoft Excel для наглядного отображения закономерного изменения температуры кипения веществ гомологического ряда, предложил различные таблицы этих зависимостей и составил различные диаграммы для этой зависимости [4]. Разумеется, объяснение того, что некоторые физические свойства органических веществ закономерно изменяются в зависимости от числа атомов углерода в гомологическом порядке, становится для учащихся более очевидным и надолго запечатлевается в их памяти. Пространственная структура обычно используется для объяснения того, почему физические и химические свойства каждого химического вещества отличаются от других в гомологическом ряду, в который они входят. Поскольку для одного химического вещества нарисованы три разные структуры, учащиеся могут более четко усвоить строение углеводородов, их кислорода, азота, галогенов, серы, фосфора и производных металлов.

В ходе применения молекулярного типа моделирования в преподавании химии учащиеся «знают» и «чувствуют» молекулу, а посредством моделей повышают свои теоретические знания. Учащиеся находят эти модели простыми в использовании для обучения и практики. Исследователи отмечают, что важно моделировать различные химические процессы. По их мнению, не обязательно моделировать все процессы, особенно химические реакции, которые легко и безопасно проводить.

Некоторые ученые классифицировали особые методы, используемые в преподавании химии, следующим образом:

• демонстрация самих химических веществ и их описание;

• химический эксперимент

• решение проблем;

• моделирование;

• демонстрация химикатов;

• интерпретация химических процессов;

• предварительное выявление изменений, которые могут произойти при химических превращениях.

Наиболее часто используемыми моделями при преподавании химии в средних общеобразовательных школах являются модели молекул химических веществ «стержни». Цветные сферы обычно используются производителями для создания таких моделей сферы для различных химических веществ.

Путем педагогического эксперимента, проведенного учеными, доказано, что применение моделирования позволяет учащимся прекрасно понимать пространственные понятия в области органической химии. Учащиеся, обучающиеся в экспериментальных группах, лучше понимают переход от одномерных изображений к двух- и трехмерным изображениям, нежели учащиеся контрольной группы [122, с.1-4; 156, с. 185-192]. К.И.Рамачандран, Г. Дипа и П.К. Кришнан Намбури использовали вычислительную химию и молекулярное моделирование для описания реальных процессов, происходящих на молекулярном уровне в химических и биологических системах [7]. Как известно, строение материи является одним из основных понятий химии и физики. Ученику, который только начинает знакомиться с предметами химии и физики, очень сложно объяснить абстрактные объекты, такие как молекулы и атомы. Эти концепции можно легко объяснить, используя веретенообразные модели молекул. С помощью этих моделей можно визуально объяснить следующие понятия: из каких атомов состоит то или иное вещество; понятия о молекулах и атомах; внешний вид атомов и молекул, когда

Biologiya dərslərində məntiqi və tənqidi tapşırıqların tətbiqinə yönəlmiş metodlar tədris prosesində baş vermiş müşahidələr zamanı yaranan qanunauyğunluqlar əsasında müəyyənləşdirilir. Məntiqi və tənqidi tapşırıqların tətbiqinə yönəlmiş biliklərin öyrənilməsində müəllim tərəfindən hazırlanmış tapşırıqlardan və elmi əsasların sintezindən istifadə olunur. Anlayış və bacarıqların tədricən inkişaf yolu ilə şagirdlərin bilik əldə etmələri zamanı istifadəsi daha yaxşıdır.

Mövzu ilə əlaqədar metodlar seçilərkən aşağıdakı göstərilənlər tədris materiallarının həcmi və xüsusiyyəti, şagirdlərin yaş xüsusiyyəti, hazırlığı, ümumi inkişaf və dünyagörüşü, konkret tapşırıq və məqsədlər mütləq nəzərə alınmalıdır.

Biologiya dərslərində fəal təlim prosesində məntiqi və tənqidi tapşırıqların tətbiqi prosesində yönəlmiş metodikadan istifadə müşahidələr zamanı yaranan qanunauyğunluqlar əsasında müəyyənləşdirilməlidir. Elm onu aşkar etdiyi qanunauyğunluqlar əsasında təzahürlərin səbəb əlaqəsini açıqlayır və bu təzahürləri müəyyən yerlərdə istifadə etməyə şərait yaradır. [4, s.106].

Məntiqi və tənqidi təfəkkürü formalaşdırmaq üçün tapşırıqların hazırlanmasına müəllim xüsusi diqqət verməlidir. Müəllim mövzu ilə əlaqədar sualları, həm də tapşırıqları diqqətlə hazırlamalı və dərs prosesində şagirdlərə təqdim etməlidir. Məsələn, biologiya fənnin 8-ci sinfində "Damarlarımızdakı qan və onun hərəkəti" mövzusu ilə əlaqədar müəllim şagirdlərə aşağıdakı tapşırıqları verə bilər: [3, s 123].

1. Mövzu ilə əlaqədar məntiqi və tənqidi təfəkkürü inkişaf etdirən tapşırıqlar hazırlayın və dərs modelinə tətbiq edin;
2. Mövzudakı əsas anlayışları tapın və onların tədrisi yollarını müəyyənləşdirin;
3. Bu mövzu ilə əlaqədar dərsin təhsilverici, tərbiyəvericiliyi və inkişafetdirici tələblərini müəyyən edin;
4. Mövzuda problemin həlli metodundan istifadə edin.

Müəllim tərəfindən hazırlanmış tapşırıqlar keçirilən dərsə uyğun olmalı, onu tam əhatə etməli və şagirdlərin mövzu ilə əlaqədar biliklərin verilməsinə, bacarıq və vərdişlərin aşılanmasına xidmət etməlidir.

**Problemin aktuallığı.** Şagirdlərə yaddaşı, məntiqi, tənqidi və yaradıcı təfəkkürü inkişafa sövq edilən tapşırıqların mahiyyəti açıqlanır.

**Problemin yeniliyi.** Məqalə məntiqi, tənqidi və yaradıcı təfəkkürünü formalaşdıran tapşırıqların tərtibi və həlli texnologiyasına həsr olunmuşdur.

**Problemin praktik əhəmiyyəti.** Məqalə ümumtəhsil məktəblərinin müəllimləri, tədqiqatçılar faydalana bilərlər.

**Ədəbiyyat:**


1. Azərbaycan Respublikasının ümumi təhsil müəssisələri üçün "Biologiya fənni üzrə təhsil (kurikulum)" (VII-XI siniflər). Bakı, 2023.
2. Hacıyeva G. N. Biologiyanın tədrisi metodikası. Ali məktəblər üçün dərs vəsaiti. / G. N. Hacıyeva. - Bakı, 2018. -356 s.
3. İbrahimova X.Q. Biologiyanın tədrisində fəal təlim metodlarının tətbiqi. -Bakı: RN Novruz- , -2005. - 160 s.
4. İbrahimova X.Q. Məktəb biologiya kursunda məsələ həllinin texnologiyası. -Bakı: Müəllim, -2022, - 216 s.
5. Sultanov R.L. Ümumtəhsil məktəbləri üçün biologiya fənni üzrə təhsil standartları. Bakı mətbəəsi, - 2004. -28 s.


**E-mail:** xosqedem.ibrahimova59@gmail.com

**Redaksiyaya daxil olub:** 02. 07.2024

*UOT 372.857*

***Mətanət Cabbar qızı Əliyeva***
*Bakı şəhəri Qaradağ rayonu 253 nömrəli məktəbin biologiya müəllimi*
*https://orcid.org/0009-0001-0189-2763*
*https://doi.org/10.69682/azrt.2024.91(3).111-114*

# BİOLOGİYA DƏRSLƏRİNDƏ EKOLOJİ TƏRBİYƏ ÜZRƏ İŞLƏRİN TƏŞKİLİ

***Матанат Джаббар гызы Алиева***
*учитель биологии школы № 253 Гарадагского района города Баку*

# ОРГАНИЗАЦИЯ РАБОТЫ ПО ЭКОЛОГИЧЕСКОМУ ВОСПИТАНИЮ НА УРОКАХ БИОЛОГИИ

***Matanat Jabbar Aliyeva***
*biology teacher at school No. 253 of Garadagh district of Baku city*

# ORGANIZATION OF WORK ON ENVIRONMENTAL EDUCATION IN BIOLOGY LESSONS

**Xülasə.** Müasir cəmiyyət gənc nəslin ekoloji mədəniyyətinin, vətəninə məhəbbətin, təbiətin mühafizəsinin tərbiyəsi kimi xüsusilə kəskin problemlə üzləşir. Biologiyanın öyrənilməsinə tarix komponentinin tətbiqi və ekoloji layihələrin həyata keçirilməsi məktəblilərin ekoloji maarifləndirilməsi və tərbiyəsi, onlarda yeni ekoloji təfəkkürün formalaşması üçün səmərəli istiqamətlərdir. Hazırda bu problemə istər ümumi təhsildə, istərsə də məktəbdənkənar tədbirlərdə xüsusi diqqət yetirilməlidir.
***Açar sözlər:*** *biologiya, ekologiya, tərbiyə, maariflənmək, təhsil, məktəbdənkənar tədbir, ekoloji təfəkkür.*

**Резюме.** Перед современным обществом особенно остро стоит проблема воспитания экологической культуры молодого поколения, любви к своей исторической Родине, охрана природы. Введение краеведческого компонента в изучение биологии, реализация экологических, природоохранных проектов – эффективные направления по экологическому образованию и воспитанию школьников и формированию их нового экологического мышления. В настоящее время данной проблеме необходимо уделять особое внимание, как в рамках общего образования, так и во внеурочной деятельности.
***Ключевые слова:*** *биология, экология, воспитание, просвещение, образование, внешкольное мероприятие, экологическое мышление*

**Summary.** Modern society is facing a particularly acute problem of educating the young generation in ecological culture, love for the motherland, and protection of nature. The introduction of the history component to the study of biology and the implementation of ecological projects are effective directions for the ecological education and upbringing of schoolchildren, and the formation of a new ecological thinking in them. Currently, special attention should be paid to this problem, both in general education and in extracurricular activities.
***Keywords:*** *biology, ecology, upbringing, enlightenment, education, extracurricular activity, ecological thinking.*

Azərbaycan Respublikası müstəqillik əldə etdikdən sonra iqtisadiyyatın bütün sahələrinin sürətli inkişafı müsbət haldır. Lakin bəzən insan fəaliyyətinin ətraf mühitə artan mənfi təsiri təbii sərvətlərin həddindən artıq istismarı ilə nəticələnmişdir. Əksər ölkələrdə olduğu kimi, Azərbaycan Respublikasında da ətraf mühitin mühafizəsi və təbii sərvətlərdən səmərəli istifadə olunması problemlərinin həllinə böyük ehtiyac var və buna xüsusi diqqət yetirilir.

Bu baxımdan, ekoloji siyasətin əsasını təşkil edən ətraf mühitin qorunması sahəsində nəti-

cə əldə etmək məqsədilə respublikamızda bir sıra mühüm qanunlar qəbul olunmuş, normativ-hüquqi sənədlər, dövlət proqramları hazırlanmış və təsdiq edilmişdir. Respublika üçün aktual olan ekoloji problemlərin həll edilməsi məqsədilə müvafiq dövlət proqramları çərçivəsində tədbirlər görülür.

Dövlət proqramları çərçivəsində fəaliyyət təhsildə də öz əksini tapmışdır. Təlim prosesində şagirdlərə müxtəlif fənlər üzrə biliklərin verilməsi ilə bərabər ekoloji problemlərin həlli istiqamətində, ekoloji tərbiyənin inkişaf etdirilməsi vacib şərtlərdən biridir. Ekoloji tərbiyənin aşılanması xüsusilə təbiət və biologiya dərslərində daha çox mümkündür. Belə ki, 6-7-ci siniflərdə ekologiyaya aid mövzuların tədrisində təbiətin qorunması ilə bağlı referatlar hazırlamaq, Milli Parka, Botanika bağına, Şüvəlan Dendrari Parkına ekskursiyaların təşkili şagirdlərdə təbiətə, bitkilərə diqqət və qayğının artırılmasına səbəb olur.

Torpağın, suyun və havanın çirklənməsinin bilavasitə insanların təbiətə ögey münasibəti nəticəsində baş verdiyi məlumdur. Bu məqsədlə dərs prosesində mövzulara uyğun şagirdlərə yaranan ekoloji problemlər və onların həll olunması yolları haqqında geniş məlumatlar verib müzakirələr aparılmalıdır. Belə maarifləndirmə nəticəsində yay tətili zamanı şagirdlərin təbiətə diqqət və qayğı ilə yanaşmasına nail olunar.

8-ci sinifdə havanın, suyun və torpağın çirklənməsi və onun qarşısının alınması mövzularının tədrisində şagirdlərlə bu problemlərin yaranma səbəbləri və bunların aradan qaldırılma yolları haqqında geniş müzakirələrin aparılması, video görüntülərin nümayişi çox önəmlidir.

Azərbaycan Respublikasının müxtəlif ekoloji amillər nəticəsində təbiətin strukturunun və funksiyasının dəyişməsi nəticəsində yaranan əsas ekoloji problemləri aşağıdakılardan ibarətdir:

- torpaq, su və hava çirkliliyinin artması, su ehtiyatlarının tullantı suları ilə çirkləndirilməsi, o cümlədən transsərhəd çirklənməyə məruz qalması;
- yaşayış məntəqələrinin keyfiyyətli su ilə təminatının aşağı səviyyədə olması, şirin suların tələbatçılara çatdırılana qədər itkisinə yol verilməsi, kanalizasiya xətlərinin azlığı;
- sənaye müəssisələri və nəqliyyat vasitələri tərəfindən atmosfer havasının çirklənməsi;
- münbit torpaqların deqradasiyaya uğraması (eroziya, şoranlaşma və s.);
- bərk sənaye və məişət tullantılarının, o cümlədən təhlükəli tullantıların tələb olunan səviyyədə idarə olunmaması;
- canlıların məhvi, biomüxtəlifliyin seyrəkləşməsi;
- meşə ehtiyatlarının, faunanın, o cümlədən balıq ehtiyatlarının azalması.

Texnika inkişaf etdikcə havada oksigen ehtiyatı azalmağa və karbon qazı çoxalmağa doğru getmişdir. Bu proses əvvəlki əsrlərə baxmış XX əsrdə daha çox sürətlənmişdir. Milyonlarla avtomobillərdən çıxan tüstülər, qazanxanalar, zavodların tüstüsü, kondisionerlər və s. Texnika dünyamızı addım-addım məhvə doğru aparır. Deməli bu gün atmosferdə oksigenin miqdarını artırmaq üçün yeni yaşıllıqların, meşə zolaqlarının salınması vacibdir. Məktəblərdə biologiya və təbiət dərslərində məhz iməciliklərin bu istiqamətə yönəlməsi bu problemin həllinə kömək edəcək ən önəmli addımdır.

Təlim prosesində şagirdlərə ekoloji halın dözülməz hala gəlməsi, ozon qatının məhvi və oksigen qazının çox-çox azalması zəncirvari olaraq digər fəsadlar törədə biləcəyi haqqında söhbətlərin aparılması çox vacibdir. Bu mənfi amillər get-gedə müxtəlif xəstəliklərin, xüsusilə bəd xassəli şişlərin yaranmasına, insan ömrünün qısalmasına, doğuşların qeyri-normallığı, yaşama və işləmənin çətinləşməsinə səbəb olur.

İri şəhərlərdə xüsusilə Bakı, Sumqayıt, Gəncə kimi şəhərlərin sənaye və məişət tullantılarının uzun illər yığılıb istifadəsiz qalması öz növbəsində gərgin ekoloji vəziyyətin yaranmasına səbəb olmuşdur. İri yaşayış məntəqələrində, xüsusən sənaye mərkəzlərində məişət tullantılarının vaxtında daşınmaması və yerləşdirilməməsi də xüsusi narahatlıq doğurur. Şəhər kənarlarında saysız miqdarda qanunsuz tullantı poliqonları yaranır ki, bu da ətraf mühiti çirkləndirməklə bərabər, həm də insanların sağlamlığı üçün təhlükə yarada bilən xəstəlik mənbələrinə çevrilir. Qeyd olunan məsələlər təlim prosesində şagirdlərə çatdırılaraq bunların aradan qaldırılması məqsədi il görülən tədbirlərlə bağlı müzakirələrin aparılması çox vacibdir.

Ekoloji baxımdan davamlı inkişaf prinsiplərinə müvafiq olaraq təhlükəli sənaye tullantı-

larının idarə olunması üçün aşağıdakı strateji tədbirlərin həyata keçirilməsi zəruridir:

- təhlükəli sənaye tullantılarının yerləşdirilməsi üçün yeni poliqonların yaradılması;
- məişət tullantıları üçün çeşidli ağzı bağlı zibil qutularının yerləşdirilməsi;
- yaşayış yerlərində qoyulan zibil qutularının vaxtında boşaldılaraq dezinfeksiya olunması;
- məişət tullantılarının çeşidlənməsi, utilizə edilməsi və təkrar emalının təşkili məqsədilə mütərəqqi təcrübədən istifadə olunması;
- tullantılardan bioqazın alınması üçün müvafiq üsulların tətbiq edilməsi;
- enerji alınması, eləcə də kompost alınması məqsədilə tullantılardan səmərəli istifadə və s.

Biologiya dərslərində mövcud ekoloji pozğunluğun aradan qaldırılması yolları ilə bağlı bir sıra məsələlərin müzakirəsi də ekoloji tərbiyənin aşılanmasında vacib şərtlərdən biridir:

1. Sənaye istehsalında oksigenə tələbatı təkmilləşdirmək, və digər zərərsiz tələbatı həyata keçirmək;
2. Təbii resurslardan səmərəli və qənaətlə istifadə etmək;
3. Nəqliyyat sisteminin elektrikləşdirilməsi, mexaniki və qeyri-mexaniki nəqliyyat vasitələrindən istifadə;
4. Əsas və işlək yollara iki tərəfli elektrik xətlərinin çəkilməsi, avtomobillərin bu sistemə görə təkmilləşdirilməsi, yeni yol hərəkəti qaydalarının yaradılması;
5. Torpaqların münbitləşdirilməsi və yeganə oksigen istehsal edən yaşıllıqların salınması və qorunması;
6. Suvarma sisteminin təşkili və bütün bunların, ümumi və dövlət tərəfindən qorunması;
7. Torpağa verilən mineral gübrələrdən norma daxilində istifadə olunması;
8. Tullantı materiallarının təkrar emalı prosesinin artırılması;
9. Geni dəyişilmiş meyvə və tərəvəzlərin bazarlara açılan qapılarının bağlanması;

Azərbaycan Respublikası ərazisinin təbii və coğrafi vəziyyəti flora və faunanın növ müxtəlifliyinə şərait yaratmışdır. Yer kürəsində mövcud olan 11 iqlim tipinin 9-u Azərbaycandadır. Bu amil ölkədə zəngin biomüxtəlifliyin formalaşmasında mühüm rol oynayır. Ölkəmizin ərazisinin 12% qədər meşələrin payına düşür. Respublikada 10 Milli Park, 10 təbiət qoruğu və 24 təbiət yasaqlıqları vardır. 6-7-ci siniflərdə biologiya dərslərində bu məsələlərlə bağlı geniş məlumatların verilməsi vacibdir.

İnsanlar daima ətraf mühiti çirkləndirmişlər. Lakin, son zamanlara kimi ətraf mühitin çirklənməsi bu səviyyədə ciddi problemə çevrilməmişdi. Çünki insanlar əhalinin yerləşməsinin zəif olduğu kənd təsərrüfatı ərazilərində məskunlaşırdılar və onlar təbiəti çirkləndirən maşınlara malik deyildilər. Sənaye şəhərlərinin inkişaf etməsi və əhalisinin artması ilə əlaqədar olaraq, bu şəhərlərdə külli miqdarda tullantılar nisbətən kiçik əraziyə toplanırdı. Bu səbəbdən, problem daha ciddi forma aldı. Avtomobillər və digər texniki-texnoloji kəşflər çirklənmə prosesini daha da intensivləşdirirdi. Artıq XXI ci ilin əvvəlindən insanlar ətraf mühitin çirklənməsinin ilə bağlı təhlükəni artan xəstəliklərdən, ürək-damar problemindən müxtəlif bədxassəli şişlərdən dünyasını dəyişən insanların sayının artmasından hiss etməyə başladılar və ekoloji problemlərin aradan qaldırılması üçün daha ciddi tədbirlərin, xüsusi proqram və layihələrin lazım olduğu qənaətinə gəldilər.

Hava, su və torpaq canlı orqanizmlərin yaşaması üçün zəruri vasitələrdir. Belə ki, çirklənmiş hava xəstəliyə və hətta, ölümə səbəb ola bilər. Çirklənmiş su dəniz və şaylarda biomüxtəlifliyin o cümlədən qiymətli balıqları və digər su heyvanlarını məhv edir. Çirklənmiş torpaqlarda qida məhsullarını becərmək olmur. Bundan əlavə, ətraf mühitin çirklənməsi bizim planetin təbii gözəlliyini korlayır. Ətraf mühitin çirklənməsi problemi mürəkkəb olduğu qədər ciddidir. Günügündən iri şəhərlərdə artan avtomobillərin buraxdığı qazlar havanı çirkləndirir. Fabrik və zavodlarda hava təmizləyici qurğuların düzgün işləməsi də havanın mirklənməsinin qarşısını alır. Gübrələr və pestisidlər kənd təsərrüfatında xüsusi əhəmiyyət kəsb edir, lakin onlar torpağı məhv edə bilir. Beləliklə, əgər insanlar birdəfəlik ətraf mühitin çirklənməsinin qarşısını almaq istəyirlərsə, gərək onda bir sıra faydalı vasitələrin istifadəsindən imtina etsinlər. Qeyd olunan problemlər və məsələlərlə bağlı biologiya fənnində10-cu sinifdə "Ətraf mühitin qorunması və bərpası" bölməsində ətraflı bəhs olunur. Bölmənin tədrisi şagirdlərin daha da maariflənməsinə səbəb olur.

Ekoloji problemlərin aradan qaldırılması, ətraf mühitin çirklənməsini tədricən azaltmaq olar.

Elm inkişaf etdikcə alimlər, mühəndislər avtomobillərdən və fabriklərdən ixrac olunan zərərli tullantıların ixtisara salınması yollarını tapa bilirlər. Eyni zamanda Dövlət tərəfindən fabrikvə zavodlarda, müxtəlif restoran və şadlıq evlərində havanın çirklənmənin azaldılmasına yönəlmiş qanunların hazırlanmasını və icrasını təşkil edə bilən tədbirlər bu problemin həllində əsas rol oynayır. Bu məqsədlə ayrı-ayrı şəxslər və təşkilatlar əməkdaşlıq edərək, müəssisələr tərəfindən ətraf mühitin korlanmasına gətirib çıxaran fəaliyyətlərdən çəkindirilməsinə çalışmalıdırlar.

Hamıya məlumdur ki, 30 ildən artıq bir dönəmdə Azərbaycan Respublikası Qarabağ bölgəsinin təbii resursları mənfur düşmənlər tərəfindən talanmış, flora və faunası məhv olunmuş, torpağımız minalar və zəhərli maddələrlə çirklənmişdir. Xüsusi mühafizə olunan təbiət ərazilərinə zərər vurulmuş, qiymətli ağac növləri ilə zəngin meşələr, eləcə də təbiət abidələri məqsədli şəkildə talan olunmuşdur.

2020-ci ildə Qarabağ regionu azad edildikdən sonra "Azərbaycan Respublikasının işğaldan azad olunmuş ərazilərində müvəqqəti xüsusi idarəetmənin təşkili haqqında" Azərbaycan Respublikası Prezidentinin 2020-ci il 29 oktyabr tarixli Fərmanı ilə verilmiş tapşırıqlara əsasən Ekologiya və Təbii Sərvətlər Nazirliyi tərəfindən ekoloji tarazlığın bərpa olunması istiqamətində meşə ehtiyatlarının, fauna və floranın, xüsusi mühafizə olunan təbiət ərazilərinin, su ehtiyatlarının, faydalı qazıntı yataqlarının qiymətləndirilməsi işlərinə surətlə başlanılmışdır.

Biologiya dərslərində şagirdlərlə bu problemlərin həlli və aradan qaldırılması yollarının dövlətimiz tərəfindən uğurla həyata keçirilməsi və yenidən bərpa olunmasındakı xidmətləri haqqında müzakirələrin aparılmasının da şagirdlərin ekoloji tərbiyəsində böyük əhəmiyyəti vardır. Çünki bu günün şagirdi sabahın qurucusu, fabrik və zavod rəhbəri və bir sıra sənaye müəssisələrində çalışacaq kadrlar olacaqdır. Deməli ekoloji tərbiyənin məktəb dövründən aşılanması çox vacibdir.

**Problemin aktuallığı.** Ekoloji maarifləndirmə dərsdənkənar məşğələlər zamanı da həyata keçirilir. Həyata keçirilmə formaları bioloji müsabiqələr, KVN-lər, ekoloji əmək aksiyaları, ekoloji cığırların çəkilməsi layihələri, sinif otaqlarının abadlaşdırılması, plakatlar, rəsmlər sərgiləri, ekoloji olimpiadaların keçirilməsi ola bilər.

**Problemin elmi yeniliyi**. Biologiya dərslərində ekoloji iş şagirdə təbiəti onun yaşayış yeri kimi anlamağa kömək edir. Şagirdlərdə ətraf mühit hadisələrini dərk etmək, dünyada mövcud olan bitki və heyvanlar arasında əlaqə və asılılıq yaratmaq, təbiətin vəziyyəti ilə bağlı ümumiləşdirmə və nəticə çıxarmaq bacarığını formalaşdırır, təbiətdəki gözəlliyi qorumaq üçün məsuliyyət hissini aşılayır. Məktəblilərdə təbiətdəki müəyyən insan hərəkətlərinin mümkün nəticələrini proqnozlaşdırmaq, təbiətdəki bioloji əlaqələrin mümkün pozuntularını proqnozlaşdırmaq bacarığını inkişaf etdirir.

**Problemin praktik əhəmiyyəti.** Laboratoriya və praktiki işlər ən çox tarix materialından istifadə etməklə aparılır. Dərsdənkənar dərslər və Nəbatat bağına, şəhər parklarına və tarix-diyarşünaslıq muzeyinə ekskursiyalar keçirilir. Bu cür dərs formaları şagirdlərdə bir çox kompetensiyaların inkişafına kömək edir. Ekoloji tərbiyə baxımından dərslərdə coğrafiya, ədəbiyyat, təsviri incəsənət və məktəb kurikulumunun digər fənləri ilə fənlərarası əlaqələrdən geniş istifadə olunur.

**Ədəbiyyat:**

1. Ümumi təhsil pilləsi üzrə Dövlət Standartları və proqramları (kurikulumları)
2. Babayev M.Ş., Hüseynov Ə., Məcidov M. Biologiyanın tədrisi metodikasından mühazirələr. −Bakı: ADPU, −1998. −139 s.
3. Mahmudova K.F. Biologiya fənn kurikulumunun layihəsinin təkmilləşdirilməsi məsələləri. Təhsilin müasir problemləri. −Bakı: Mütərcim, −2010.
4. Концепция непрерывного экологического образования в системе общего образования Челябинской области [Электронный ресурс]. — Режим доступа: https://ipk74.ru/upload/iblock/73a/73af2f8f3ffb9b386a78e6253a6879ea.pdf Леднева, О. С.
5. Сиднева, О. Ф. Экологическое воспитание школьников на уроках биологии / О. Ф. Сиднева. — Текст : непосредственный // Молодой ученый. — 2022. — № 42.1 (437.1). — С. 31-33. — URL: https://moluch.ru/archive/437/96217/

**E-mail:** shahin-mehdiyev@mail.ru

**Redaksiyaya daxil olub:**13.05.2024

## *XARİCİ DİLLƏRİN TƏDRİSİ METODİKASI*
## *МЕТОДИКА ПРЕПОДАВАНИЯ ИНОСТРАННЫХ ЯЗЫКОВ*
## *METHODOLOGY OF TEACHING FOREIGN LANGUAGES*

*UOT 372.881.113.31*

***Jalə Oktay qızı Salmanova***
*Azərbaycan Dillər Universitetinin baş müəllimi,*
*fəlsəfə doktoru proqramı üzrə dissertant*
*https://orcid.org/0000-0002-4846-1514*
*https://doi.org/10.69682/azrt.2024.91(3).115-120*

# PLÜRALİST YANAŞMA: FRANSIZ DİLİ FƏNNİNİN TƏDRİSİNDƏ QEYRİ-VERBAL ÜNSİYYƏT VƏ BƏDƏN DİLİ

***Жаля Октай гызы Салманова***
*старший преподаватель Азербайджанского Университета Языков*
*диссертант по программе доктора философии*

# ПЛЮРАЛИСТИЧЕСКИЕ ПОДХОДЫ: НЕВЕРБАЛЬНАЯ КОММУНИКАЦИЯ И ЯЗЫК ТЕЛА ПРИ ПРЕПОДАВАНИИ ФРАНЦУЗСКОГО ЯЗЫКА

***Jala Oktay Salmanova***
*senior lecturer at Azerbaijan University of Languages*
*doctoral student in the program of doctor of philosophy*

# PLURALISTIC APPROACHES: NON-VERBAL COMMUNICATION AND BODY LANGUAGE IN FRENCH COURSES

**Xülasə.** Dillərə və mədəniyyətlərə plüralist yanaşma xarici dilin tədrisində mühüm əhəmiyyət kəsb edir. Dillərə və mədəniyyətlərə plüralist yanaşmanın əsas prioriteti dilöyrənənlər arasında ifadəli öyrənməni dəstəkləməsidir. Odur ki, mədəniyyətlərarası kommunikasiyada bədən dilini və qeyri-verbal ünsiyyəti öyrənmək ünsiyyətin digər elementlərini bilmək qədər vacibdir. Bədən dili və qeyri verbal ünsiyyətin mədəniyyətlərarası mühitdə tədrisi dildə səmərəli və düzgün ünsiyyəti təmin etməkdir. Beləliklə, xarici dil dərslərində həmin dildə danışan insanların mədəniyyətlərinə xas ola biləcək bədən dili xüsusiyyətlərinin ötürülməsi dilin səmərəli şəkildə mənimsənilməsində mühüm rol oynayır.
***Açar sözlər:*** *plüralist yanaşma, qeyri-verbal ünsiyyət, bədən dili, verbal ünsiyyət, tədris.*

**Резюме.** Плюралистический подход к языкам и культурам занимает важное место в преподавании иностранных языков. Основным приоритетом плюралистического подхода к языкам и культурам является поддержание выразительного обучения. Поэтому изучение языка тела и невербального общения в межкультурном общении так же важно, как и знание других элементов общения. Обучение языку тела и невербальному общению в межкультурной среде призвано обеспечить эффективное и правильное общение на языке. Таким образом, на уроках иностранного языка передача особенностей языка тела, которые могут быть специфичными для культуры людей, говорящих на этом языке, играет важную роль в эффективном овладении языком.
***Ключевые слова:*** *плюралистический подход, невербальное общение, язык тела, вербальное общение, преподавание*

**Summary.** A pluralistic approach to languages and cultures is important in foreign language teaching. A major priority of a pluralistic approach to languages and cultures is to support expressive learning among learners. Therefore, learning body language and non-verbal communication in intercultural communication is

as important as knowing other elements of communication. Teaching body language and non-verbal communication in a cross-cultural environment is to ensure effective and correct communication in the language. Thus, in foreign language lessons, the transfer of body language characteristics that may be specific to the cultures of the people who speak that language plays an important role in the effective acquisition of the language.

***Keywords:*** *pluralistic approaches, non-verbal communication, body language, verbal communication, teaching.*

Çoxdilli və çoxmədəniyyətli səriştə onun "*dillərə görə fərqli və ayrı-ayrı ünsiyyət bacarıqlarının məcmusundan"* ibarət deyil, daha çox *"mövcud olan bütün dil repertuarını əhatə edən çoxdilli və çoxmədəniyyətli səriştədən"* ibarət olması ilə xarakterizə olunur. Dillər üzrə Ümumavropa çərçivə sənədində (CEFR) də qeyd edildiyi kimi, linqvistik və mədəni səriştənin formalaşdırılması istənilən dil layihəsinin plüralist yanaşmada tədrisində mühüm əhəmiyyət kəsb edir. Belə ki, "*Xarici dilin tədrisində eyni anda bir neçə dil və mədəniyyət növünü əhatə edən fəaliyyətlər*" təklif etməsək, *"bir-birimizlə qarşılıqlı şəkildə dil öyrətməkdə və öyrənməkdə"* uğur qazanmaq mümkün deyil [4].

"Dillərə və mədəniyyətlərə plüralist yanaşma*"* metodunun qısa izahatına nəzər yetirsək, bu yanaşmanın ünumi xüsusiyyəti tələbələrə eyni vaxta birdən çox dil (Ana dili də daxil olmaqla) və ya bir neçə mədəniyyət növünü öyrənməyə imkan verməsidir. Təcrübələr göstərir ki, dərsdə belə bir iş formasının təşkili tələbələrə dillər (və mədəniyyətlər) arasında əlaqə qurmağa kömək üçün səmərəli metod və vasitə hesab edilir. 2007-ci ildə Avropa şurası tərəfindən Dillər üzrə Ümumavropa çərçivə – CEFR sənədinin davamı olaraq qəbul edilən "Dillərə və mədəniyyətlərə" plüralist yanaşmanın əsas prioriteti dilöyrənənlər arasında ifadəli öyrənməni dəstəkləməsidir. Mişel Kandalie və onun dilçi komandası tərəfindən tərtib edilən CARAP (Dillərə və mədəniyyətlərə plüralist yanaşma) çərçivə sənədi CEFR-in təlim standartlarını tamamlayır və dil tədrisində CEFR ilə müqayisədə gələcəkdə eyni dərəcədə əhəmiyyətli nəticəni göstərməsi ehtimal edilir.

Bəs fransız dili fənninin tədrisində qeyri-verbal ünsiyyət və bədən dilinin plüralist yönümlü tədrisi hansı formada həyata keçirilir ?

Elmi tədqiqatlar göstərir ki, ilk insanlar bədən dilindən istifadə edərkən oxşar əlamətlər və davranışlar nümayiş etdirirdilər. Bədən dilinin əsas işarələmə sistemini təşkil edən bu mesajlar bəşəriyyətin universal dilidir. Ona görə də bir azərbaycanlının qorxduğu zaman verdiyi fiziki mesajlar fransız və ya almanın göstərdiyi fiziki mesajlarından heç bir fərqi yoxdur. Ancaq insanların sayı artdıqca, dəyişən həyat tərzləri, vərdişləri, dini inancları, yaşadıqları coğrafiya və iqlimdən asılı olaraq bədən dillərində mədəni fərqliliklər ortaya çıxmağa başladı [9]. Bədən dilini mənalandırma mədəni mühitlə, eləcə də ünsiyyət quran insanların sosial rolları ilə sıx bağlıdır. Bu kontekstdə demək olar ki, hər bir cəmiyyətin öz mədəni quruluşu daxilində istifadə etdiyi jest və mimikaları vardır.

Jestlər və mimikalar insanların yaşadıqları cəmiyyətlərin mədəniyyəti daxilində formalaşır və yönləndirilir. Baltşa görə biz, ilk növbədə, bədən dilindən həm yaxın ətrafımızda, həm geniş ictimai həyatımızda, həm də müxtəlif ölkələrdən olan insanlarla münasibətlərimizdə istifadə edir və onların bədən dili ilə dediklərini anlamağa çalışırıq. Mədəni həyat tərzimizdə ünsiyyət qurduğumuz insanlarla nə qədər ümumi xüsusiyyətlər varsa, qarşılıqlı bədən dilini başa düşməyimiz bir o qədər asan olar. "Mədəni fərqlər bədən dili əlaqələrimizdə artdıqca, xarici ölkədə ətrafımızdakı insanların duyğu və düşüncə axınını qiymətləndirmək bizim üçün çətinləşir" [3]. Buna görə də, digər mədəniyyətlərin qeyri-verbal dillərini təhlil etmək üçün xarici dili tədris edən hər bir müəllim çox məlumatlı olmalıdır.

Hələ danışa bilməyən bir körpənin hərəkətlərindən nəyə ehtiyac duyduğunu anlamağa çalışdığımız kimi, dili bilmədiyimiz bir ölkədə də, eyni şəkildə insanların hərəkətlərini izləyərək onları anlamağa çalışırıq. Bədən dilinin mədəniyyətlərarası fərqlərini müəyyən etmək üçün bir çox araşdırmalar aparılmışdır.

Bu gün xarici dilin tədrisində üstünlük təşkil edən plüralist yanaşmada da vurğulandığı kimi, xarici dili öyrənmək mədəniyyəti öyrənməklə bərabər tutulur. Başqa sözlə, insan xarici dilin köməyi ilə dilini öyrəndiyi ölkənin mədəniyyətini formalaşdıran amilləri tanımağa başla-

yır və "yad mədəniyyətdə vərdişlər formalaşdırır" [1]. Mədəniyyətlərarası ünsiyyətdə kommunikasiyanın mühüm tərkib hissəsi olan bədən dilini öyrənmək və öyrətmək ünsiyyətin digər elementlərini bilmək qədər vacibdir. Dilin sintaksisi, qrammatikası, düzgün tələffüzü və s. tədrisilə yanaşı, xarici dil dərslərində həmin dildə danışan insanların mədəniyyətlərinə xas ola biləcək bədən dili xüsusiyyətlərinin ötürülməsi səmərəli tədris üçün vacibdir. Bu kontekstdə xarici dil tədrisində bədən dili haqqında məlumat verilərkən, xarici dil öyrənənin öz mədəniyyətinin bədən dili ilə hədəf mədəniyyətin bədən dilinin xüsusiyyətləri müəyyən edilərək müqayisə edilə bilər.

Bədən dilinin bəzi xüsusiyyətləri hər iki mədəniyyətdə eyni ola bilər və ya olmaya da bilər. Eyni kimi görünən, lakin fərqli şəkildə başa düşülən xüsusiyyətlər də ola bilər. Bundan əlavə, eyni şeyi ifadə etmək üçün müxtəlif bədən dili kodları istifadə edilə bilər. Bu hallarda, fərqi başa düşmək və şərh etmək üçün o mədəniyyətin bədən dili xüsusiyyətlərinə müəyyən bir həssaslıqla yanaşılaraq dərk etmək lazımdır. Mulən qeyd edir ki, bir asiyalının təbəssümünü dostcasına qəbul və ya bəyənmə kimi şərh edən avropalı onun təbəssümünün əslində onun vəziyyətindən narazı olduğunu ifadə etdiyini anlamaya bilər [6]. Burada bədən dilinin istifadəsi formaca eynidir, lakin mənaca fərqlidir. Bunlar üz-üzə mədəniyyətlərarası ünsiyyətdə ən çox yanlış təsəvvürlərə və anlaşılmazlıqlara səbəb olan bədən dili mesajlarıdır. Başqa bir misal, şifahi olmayan dildən istifadə edərək təsdiqləmə "bəli" və ya rədd etmə "yox" formalarıdır. Azərbaycanlılar dilində şifahi mesajı təsdiqləyərkən başlarını irəli yelləyirlər, əslində onlar da eyni işarədən yox mənasında istifadə edirlər, baxmayaraq ki, bu jest bir çox mədəniyyətlərdə bəyənmə və başa düşülən sayılır. "Yox" mənasında Azərbaycan, Türk, və Fransızlar başqa insanlar başlarını sağa-sola çevirərək nəyisə bəyənmədiklərini və ya rədd etdiklərini göstərirlər. Aşağıda qeyd edəcəyimiz 1-ci cədvəldə bədən dilində jest və mimikaların plüralistyönlü istifadəsinə dair bir neçə nümunələrə nəzər yetirək:

| **Mövzular** | **Təriflər** | **Nümunələr** |
|---|---|---|
| **Mimik** | Mimika bir duyğu və ya düşüncəni bədən hərəkətləri ilə ifadə etmək aktıdır, qaş, göz, üz və ağız hərəkətləri ilə üz ifadələrinin hərəkətlərindən ibarətdir. | Qaş qaldırmaq, göz qırpmaq, burun dəliklərini böyütmək, alnını qırışdırmaq və s. |
| **Jest** | Bədənin bütün hərəkətlərini əhatə edir. Əllərin, qolların, ayaqların, başın və bütün bədənin danışmadan göndərdiyi mesaja jest deyilir. | Əl sıxmaq, baş silkələmək, barmaqla göstərmək və s. |
| **Bədən dili** | Bədənin nümayiş etdirdiyi hər əzələ hərəkəti ilə ortaya çıxan jest və mimik formalaşmasıdır. | Ayaqlara yüklənmə, duruş və s. |
| **Pantomim** | Jestlərdən və mimik hərəkətlərdən istifadə etməklə oynanan oyunlardır. | Dil öyrənənlərin iştirakı ilə təşkil edilən səssiz teatrlar və oyunlar |
| **Səssiz kino** | Sinxron səs yazılışı olmayan, sadəcə dialoqlardan ibarət vizual sənətlərdən istifadə olunan filmlər.<br>Səssiz film — Vikipediya (wikipedia.org) | İzlənilən səssiz filmlərin səhnələşdirilməsi;<br>Dilöyrənənlərin iştirakı ilə səssiz filmlər üzərində iş :<br>- Çarli Çaplinin səssiz filmləri;<br>- Jan Düjardənin baş rolda oynadığı "The Artist" filmi;<br>- Azərbaycan dilində ilk səssiz filmlər: "Neft və milyonlar səltənətində" "Neft və milyonlar səltənətində" filminin 95 yaşı tamam olur (medeniyyet.az)<br>"Şəhər bağında xalq gəzintisi", "Qafqaz rəqsi" Səssiz dövr (1920-1935) - Azerbaijan.az |

| **Göz qırpmaq** | Gözünü qırpmadan kiməsə baxmaq. | Fransada və digər Avropa ölkələrində qarşı tərəfi təhdid edib ruhdan salmaq mənasında olduğu halda, Azərbaycanda heyranlıqla izləmək deməkdir. |
|---|---|---|
| **Alnını qırışdırmaq** | Alnını qırışdırmaq bir jest nümunəsidir. | Azərbaycanda və türkdilli ölkələrdə bu qəzəb əlaməti olduğu halda, Avropada bir hadisəni düşünmək və ya birini danlamaq deməkdir. |
| **Bədənin donması** | Bədənin donması və ya hərəkətsiz qalması. | Azərbaycanda qorxu və təşviş əlaməti olsa da, Avropa ölkələrində birinə rədd cavabı vermək mənasında işlənir. |

Tədris mühitində şagird-müəllim və ya tələbə-müəllim ünsiyyətində müəllimlərin bədən dilindən istifadəsi hədəf dilinin aşılanmasında mühüm rol oynayır. Bunlara müəllimin hər bir dilöyrənənlə göz təması qurması, mövzunu izah edərkən arxasını auditoriyaya çevirməməsi, dinləyərkən tələbələrə tərəf çevrilməsi və s. davranışlardır. Lakin onu da qeyd etmək lazındır ki, xüsusilə xarici dil müəllimləri gələcəkdə tədris etdikləri mədəniyyətin bədən dilini tələbələrinə aşılaması üçün bu bacarıqlarla yanaşı, bu mövzuda kifayət qədər araşdırmalar aparılmalıdırlar. Tədqiq etdiyimiz müxtəlif mənbələr xarici dilin tədrisində bədən dili ilə bağlı araşdırmaların çox az olduğunu göstərir. Bəs xarici dil öyrədərkən həmin dilin qeyri-verbal ünsiyyət bacarıqlarını öyrənənlərə ötürmək üçün hansı üsul və metodlardan istifadə edə bilərik?

Fransız dilində verbal ünsiyyətin tədrisində nümunə olaraq bir neçə dərslik və ya metodlar göstərə bilərik ki, bunların içərisində ən səmərəlisi "Tendance" dərsliyidir. Dərslik Ümumavropa çərçivə sənədinin (CEFR) tələblərinə uyğun tərtib edilmişdir. Dərsliyin məzmunu və mövzuları tələbələrin müxtəlif situasiyalarda fransız dilində fikirlərini yazılı və şifahi şəkildə ifadə etmələrinə şərait yaradacaq şəkildə tərtib edilmişdir. Bundan əlavə dərslikdə təqdim edilən hər bölməyə uyğun tələbələrin dinləyəcəyi fransızdilli səsləndirmələr də mövcuddur. Məlumdur ki, səsləndirmələr dilöyrənən üçün dinləmə bacarıqlarının formalaşdırılmasında əvəzedilməz bir vasitədir və tələbələrə dərsdənkənar vaxtlarda təkrar-təkrar dinləmələri tövsiyə olunur [7].

Dərslikdə qeyri-verbal ünsiyyətin və bədən dilinin real situasiyalarda tədrisinə təkan verəcək digər məhsuldar fəaliyyətlər də vardır ki, tələbələrin dilə qarşı maraq dairəsini daha da gücləndirir. Sözü gedən fəaliyyətlər isə fransızdilli aktyorların iştirakı ilə hər bölməyə uyğun video filmlərin yer almasından ibarətdir. Bununla yanaşı, serial şəklində təqdim edilən filmlərdə aktyorlar həm fransız, həm Belçika, həm çin, həm də ispan mədəniyyətinin fransız dilində təmsilçiləri hesab edilirlər. Yəni, dörd fərqli mədəniyyətin təmsilçisi olan insanların Fransada bir araya gəlməsi, eyni evi bölüşmələri və özlərini özlərinə məxsus tərzdə bu dildə ifadə etmələri dərsliyin metoduna marağı daha da artırır. Bundan başqa, mövzuların gündəlik real həyatdan bəhs edən film formatında dilöyrənənə çatdırılması onlarda bir başa tərcümə olmadan jestlər, mimikalar və bədən dili vasitəsilə öyrənmə prosesini möhkəmləndirməyə şərait yaradadır. Tələbələr eyni zamanda, heç bir tərcüməyə ehtiyac olmadan məzmunu başa düşür və aktyorların hərəkətlərini, davranışlarını öz ana dilində müqayisəli şəkildə dərk edirlər. Dərs zamanı mənimsədikləri bilikləri isə rahat şəkildə rollu oyunlar zamanı və ya real situasiyalarda istifadə etməyə nail olurlar. Bu şəkildə mədəniyyətlərarası fərqliliklərin filmlər vasitəsilə dilöyrənənə çatdırlıması digər mədəniyyətlər çərçivəsində maarifləndirməyə şərait yaradır. Belə ki, hədəf mədəniyyət qeyri-verbal ünsiyyət vəziyyətlərini çatdıran filmlər, şəkillər və s. materiallarla dərs prosesini daha da səmərəli şəkildə təşkil etmək olar.

Dərs zamanı istifadə edilən səmərəli fəaliyyətlərə nəzər salsaq görərik ki, bəzi onlayn dil saytlarında qeyri-verbal və bədən dilinin tədrisinə dair müxtəlif tapşırıqlar, rollu oyunlar yer almaqdadır. Məsələn, "https://ticsenfle.blogspot.com/" saytında göstərilən interaktiv tapşırıqlardan birinə nəzər yetirək:

***« Des gestes simples et efficaces pour réviser l'impératif et protégez -vous contre le virus de la grippe ... ! »***

*a) Mouillez-vous les mains avec de l'eau b) Nettoyez également les ongles c) Versez du savon dans le creux de votre main d) Frottez-vous les mains de 15 à 20 secondes: les doigts, les paumes, le dessus des mains et les poignets e) Fermez le robinet avec l'essuie-main puis jetez-le dans une poubelle f) Entrelacez vos mains pour nettoyer la zone entre les doigts g) Séchez-vous les mains si possible avec un essuie-main à usage unique h) Rincez-vous les mains sous l'eau.*



Yuxarıda qeyd etdiyimiz tapşırıq növü dil-öyrənənlərdə fransız dilində əmr formasını (Impératif) şəkillərlə təsvir edilmiş jestlər vasitəsilə sadə və səmərəli üsulla mənimsəməyə kömək edir. Belə ki, tapşırığın tərtibində əsas məqsəd şəkillərdə sıralama ilə qeyd edilən jestlərin izlənilməsi və onların mənasının xarici dildə və yeri gələrsə, ana dilində dərk edilməsidir. Proses zamanı dilöyrənənlər öz fərziyələrinə güvənərək müəllim tərəfindən heç bir tərcümə və izahatlara ehtiyac olmadan verilən sözlü ifadələri şəkillərdə hərəkətlərlə qeyd edilən jestlərlə uyğunlaşdırmalıdır. Daha sonra, fransız dilində əmr formasında qeyd edilən sözlü ifadələrin dərs zamanı tələbələr tərəfindən şəkillərdə göstərilən jestlərlə öz əksini tapmasıdır. Fransız dilində əmr formasında fellərin cümlələrin içərisində altından xətt çəkilərək qeyd edilməsi və mənasının jestlərlə göstərilməsi məzmunun, fellərin mənalarının və qrammatik qaydanın işlənmə formasını real situasiyada daha sürətli dərk edilməsinə şərait yaradadır. Bədən üzvlərinə dair göstərilən ifadələri sözlü şəkildə qeyd edərək şəkillərdəki hərəkətləri öz hərəkətləri ilə göstərdikdə, tələbədə ünsiyyətə girmə vərdişləri daha sürətli formalaşır.

Bundan başqa, tapşırığın başlığında dilöyrənəndən eyni zamanda qrip virusuna qarşı ehtiyat tədbirlərinin görülməsi üçün şəkillərdə qeyd edilən jestlərə diqqətlə nəzər yetirməsi tövsiyə edilir. Tələbə cəmiyyətdə sosial bir fərd kimi özünü və ətrafdakı insanları yoluxucu xəstəliklərdən qorumaq üçün şəkillərdəki hərəkətlərin nə dərəcədə əhəmiyyətli olduğunun fərqinə varır və öz real həyatında da onları tətbiq etməkdən çəkinmir. Belliklə, müəllim tələbələrdə həm leksik, həm qrammatik biliklərin mənimsənilməsində, həm də interaktiv mühitdə verbal və qeyri-verbal ünsiyyət bacarıqlarının formalaşdırılmasında interaktiv dərslərdə istifadə edilən metod və onlayn texnikalardan istifadə etməkdən çəkinməməlidir [3].

Araşdırmaların nəticəsi olaraq deyə bilərik ki, qeyri-verbal ünsiyyət formalarına dair interaktiv metodlarla tərtib edilmiş fəaliyyətlər xarici dilin tədrisində həm şifahi ünsiyyət bacarıqlarının səmərəli şəkildə formalaşdırılmasında, həm də sosial-mədəni sferanın inkişafında mühüm əhəmiyyət kəsb edir. Şəxslərarası ünsiyyət çoxkomponentli bir prosesdir. Bu proses ünsiyyətin sifahi və qeyri-verbal aspektləri ilə qurulur. Belə ki, qeyri verbal- ünsiyyət və bədən dili ünsiyyətin ayrılmaz, vacib bir hissəsidir. Mədəniyyətlərarası ünsiyyətin hədəfləndiyi bir dövrdə bədən dilini öyrənmək və öyrətmək ünsiyyətin digər linqvistik elementlərini bilmək qədər vacibdir [2]. Bədən dili və qeyri verbal ünsiyyətin öyrədilməsinin məqsədi səmərəli və düzgün ünsiyyəti təmin etməkdir.

Qeyri-verbal ünsiyyət bacarıqlarının şifahi nitqlə eyni anda səmərəli tədrisi üçün, ilk növbədə, dərslik müəlliflərinin bədən dili xüsusiyyətləri ilə bağlı materiallar hazırlamaları məqsədəuyğun olardı. Xarici dilin tədrisi üçün hazırlanan kurs materiallarında dil tədrisinin hər bir mərhələsi üçün hədəf mədəniyyətin bədən dilinin istifadəsi haqqında məlumatlar sistemli şəkildə öz əksini tapmalıdır. Xarici dil dərslərində istifadə olunacaq filmlər, slaydlar, şəkillər və

fotoşəkillər mədəniyyətin şifahi olmayan ünsiyyət kodlarına istinad edərək dil öyrənənləri mədəniyyətlərarası ünsiyyətə hazırlamaq məqsədi daşıyır. Bu isə dil tədrisində səmərəli bir ünsiyyət üçün vacibdir. Bu o deməkdir ki, hər bir ölkə xarici dilin tədrisi üçün öz tədris materiallarını yaratsa da, dil tədrisini şərtləndirən digər bacarıqlarla yanaşı, bədən dilinin ötürülməsi məsələsini də diqqət mərkəzində saxlamalıdır.

**Problemin aktuallığı.** Fransız dili fənninin tədrisində qeyri-verbal ünsiyyət və bədən dilinin tədrisi əhəmiyyəti ön plana çıxarılır. Ünsiyyət zamanı yaranan problemlərin aradan qaldırılmasında müasir təlim metodlarına və yanaşmalara ehtiyac duyulur.

**Problemin elmi yeniliyi.** Bədən dili və qeyri verbal ünsiyyətin plüralist yanaşmada tədrisi dildə səmərəli və düzgün ünsiyyəti təmin edir və bu istiqamətdə aparılan elmi araşdırmalar tədqiqatın elmi yeniliyini müəyyənləşdirir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə müəyyən edilən problemlər və irəli sürülən təkliflər xarici dildə verbal və qeyri verbal ünsiyyətin tədrisində müasir yanaşmalardan, interaktiv dərslərdə istifadə edilən metod və texnikalardan istifadə mühüm əhəmiyyət kəsb edir.

**Ədəbiyyat:**


1. Baltaş, A. Bedenin Dil. Dərs vəsaiti. / Z Baltaş. – İstanbul: Remzi Kitapevi, – 2002. – 176 s.
2. Berthier-Mclaughlin, C. Etre l’acteur de son cours / M. Harfaut. – Paris, Ed.Eyrolles: MasterClass, – 2008. – 149 s.
3. Cadre de Référence pour les Approches Plurielles des Langues et des Cultures / M. Candalier [və b.] – Strasbourg : Conseil de l’Europe, 2007. – 123 s.
4. Conseil de l’Europe. Cadre europeen commun de reference pour les langues : apprendre, enseigner, evaluer. / tərt.ed. Conseil de l’Europe, – Paris : Didier, – 2001. – 191 s.
5. Darwin, C. L'expression des émotions chez l'homme et les animaux. / Edité par Payot & Rivages. – Marseille, – 2001. – 222 s.
6. Moulin, J.F. Le discours silencieux du corps enseignant : La communication non verbale du maître dans les pratiques de classe // – Picardie : Carrefours de l’éducation, – 2004. № 17, – s. 142-159.
7. Tendances A1 – Méthodes de français / C. Gibbe, J. Girardet, J Parizet [və b.] – Paris: CLE International, – 2019. – 162 s.
8. Abbasəliyeva, R. Dildə ekspressivlik və emosionallığın verbal və qeyri-verbal ifadə vasitələri. – Bakı : Polygraphic production, – 2018. – 159 s.
9. Kaşıkçı, E. Doğrucu Beden Dili. – İstanbul: Hayat Yayıncılık, – 2002. – 216 s.


**E-mail:** salmanovajala@gmail.com
**Redaksiyaya daxil olub:** 03.06.2024

*UOT 372.881*

***Cavahir İsaxan qızı Maçanova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şamaxı filialının müəllimi*
*https://orcid.org 0000-0002-8437-3693*
*https://doi.org/10.69682/azrt.2024.91(3).121-124*

# LAYİHƏ ƏSASLI ÖYRƏNMƏNİN XARİCİ DİL DƏRSLƏRİNƏ TƏTBİQİNİN ÜSTÜNLÜKLƏRİ

***Джавахир Исахан гызы Мачанова***
*преподаватель Шамахинского филиала*
*Азербайджанского Государственного Педагогического Университета*

# ПРЕИМУЩЕСТВА ПРИМЕНЕНИЯ ПРОЕКТНОГО ОБУЧЕНИЯ НА УРОКАХ ИНОСТРАННОГО ЯЗЫКА

***Javahir Isakhan Machanova***
*lecturer at the Shamaki branch of Azerbaijan State Pedagogical University*

# ADVANTAGES OF APPLYING PROJECT-BASED LEARNING TO FOREIGN LANGUAGE CLASSES

**Xülasə**. Layihə metodu, şagirdyönlü metod olub, onların ehtiyac və qabiliyyətinə diqqət yetirilməsi zərurətini nəzərdə tutur. Bu öyrənmə üsulu əməkdaşlıq və fəal iştirakı prinsiplərinə əsaslanır. Xarici dilin tədrisində layihə metodundan istifadə şagirdlərə xarici dildən idrak vasitəsi, öz fikirlərini ifadə etmək, başqa insanların fikirlərini qavramaq və anlamaq üsulu kimi istifadə etməyə imkan verir. Bu, tələbələrin diqqətini ifadə formasından məzmuna yönəltmək və ətraf aləmi xarici dil vasitəsilə biliyə daxil etmək, beləliklə, sosial-mədəni səriştənin əhatə dairəsini genişləndirmək üçün ən səmərəli üsuldur.
***Açar sözlər**: layihə metodu, xarici dil, şagird, təcrübə, tapşırıq, psixologiya, pedaqogika, tədqiqat, fərziyyə, müəllim.*

**Резюме**. Метод проектов – это метод, ориентированный на учащихся, который предполагает необходимость обратить внимание на их потребности и способности. Этот метод обучения основан на принципах сотрудничества и активного участия. Использование метода проектов в обучении иностранному языку позволяет учащимся использовать иностранный язык как познавательное средство, способ выражения своих идей, восприятия и понимания идей других людей. Это наиболее эффективный способ переключить внимание учащихся с формы выражения на содержание и ознакомить их с окружающим миром посредством иностранного языка, расширяя тем самым объем социокультурной компетенции.
***Ключевые слова:** метод проектов, иностранный язык, ученик, опыт, задание, психология, педагогика, исследование, гипотеза, учитель*

**Summary.** The project method is a student-oriented method, which implies the need to pay attention to their needs and abilities. This learning method is based on the principles of cooperation and active participation. The use of the project method in teaching a foreign language allows students to use a foreign language as a cognitive tool, a way to express their ideas, to perceive and understand other people's ideas. This is the most efficient way to shift students' attention from form of expression to content and to introduce the surrounding world into knowledge through foreign language, thus expanding the scope of socio-cultural competence.
***Keywords:** project method, foreign language, student, experience, task, psychology, pedagogy, research, hypothesis, teacher*

Müasir təhsil sisteminin məqsədlərinə çatmaq üçün dünya pedaqogikası şəxsiyyətyönlü yanaşmanı rəhbər tutur.

Psixologiya və pedaqogikada humanist istiqamətin prinsiplərinə əsaslanan yanaşma tətbiq olunur. Layihə metodu tədrisin mahiyyətinə görə şagirdin şəxsiyyətinə, ehtiyac və qabiliyyətlərinə diqqət yetirilməsinin zəruriliyini nəzərdə tutur və əməkdaşlıq və fəal iştirak prinsiplərinə əsaslanır.

Xarici dilin tədrisində layihə metodundan istifadə şagirdlərə xarici dildən idraki alət kimi, öz fikirlərini ifadə etmək, başqalarının fikirlərini qavramaq və anlamaq üsulu kimi istifadə etməyə imkan verir.

Layihə işində şagirdlər müəllimin təşkil etdiyi tədqiqat fəaliyyətlərində iştirak edirlər. Eyni zamanda, şagird fəaldır, yaradıcılıq nümayiş etdirir və müəllimin iradəsinin passiv icraçısı deyil. Layihə üzərində işləyərkən linqvistik cəhətdən ən zəif və psixoloji cəhətdən aktiv olmayan hər bir iştirakçı şagird öz təxəyyülünü, yaradıcılığını, fəallığını və müstəqilliyini nümayiş etdirmək imkanı əldə edir. Layihə fəaliyyətləri şagirdlərə dil öyrənmənin formal xarakterini aradan qaldırmağa və dilin tədrisində praktiki nəticələr əldə etmək üçün qarşılıqlı əlaqə qurmağa imkan verir. Layihə şagird və müəllimin funksional vəzifələrini dəyişdirir

Layihə fəaliyyəti uşaqların müstəqilliyi sahəsinə aiddir, bu üsul məktəb yaşlı uşaqların maraqlarına əsaslanır. İbtidai siniflərdə layihələndirmə fəaliyyətinin xüsusi əhəmiyyəti ondan ibarətdir ki, onlar məktəbdən kənarda sosial təcrübə əldə edirlər və müasir həyat şəraitinə uyğunlaşırlar. İbtidai məktəbdə sinifdaxili və məktəbdənkənar tədbirlər çərçivəsində aşağıdakı layihələr növləri təşkil edilə bilər:

- şagirdlərin dominant roluna görə: təcrübəyönlü, informativ, yaradıcı, rollu oyun;
- müddətinə görə: qısamüddətli, uzunmüddətli. istifadə
- təhsildə tələbələrin fəal, müstəqil və təşəbbüskar mövqeyinin yaradılması

Layihə fəaliyyəti ümumi məqsədə, ümumi nəticə əldə etməyə yönəlmiş razılaşdırılmış, idrak, yaradıcı və ya oyun fəaliyyətidir. Müəllimin qarşısında yalnız ətrafdakı reallıqdan götürülə bilən layihələr üçün problemləri tapmaq və seçmək kimi çətin vəzifə durur. "Layihə üzərində işləmə prosesi bir neçə ardıcıl mərhələdən ibarətdir:

1. Məqsəd: gələcək layihənin məqsədləri, vəzifələri, əsas ideyası, təxmini mövzuları və formatları.
2. Layihə haqqında poster məlumatı.
3. Gələcək yazarlara təkliflərin verilməsi (mövzular, tələblər, müddətlər və s.).
4. Təhsil layihələri üçün mövzuların seçilməsi, ideyaların və planların formalaşdırılması üzrə məsləhətləşmələr.
5. Qrupların yaradılması.
6. Layihə mövzularının və iş müddətlərinin təsdiqi.
7. Axtarış mərhələsi.
8. Şagirdlərin aralıq hesabatları.
9. Layihələrin məzmunu və dizaynı ilə bağlı məsləhətləşmələr.
10. Ümumiləşdirmə mərhələsi: nəticələrin təqdim edilməsi.
11. Rəy və təklifləri nəzərə almaqla layihələrin yekunlaşdırılması.
12. Layihənin ictimai müdafiəsinə hazırlıq.
13. Yekun mərhələ: layihənin ictimai müdafiəsi.
14. Görülən işlərin ümumiləşdirilməsi və təhlili.
15. Son mərhələ. Tərkiblərin xülasəsi. İştirakçılara təşəkkür edirik.

Hər bir layihə mütləq şagird araşdırması tələb edir. Məktəblilərin şəxsiyyətinin inkişafı və sosiallaşması üçün layihə metodunun imkanları ənənəvi təhsil təşkilatında fəaliyyət strukturundan əhəmiyyətli dərəcədə fərqli olan müəllim və şagird fəaliyyətinin strukturunu təhlil etməklə müəyyən edilir.

Layihə metodundan istifadə edərkən müəllim və şagird fəaliyyətlərinin strukturu.

Layihə və tədqiqat fəaliyyətləri müstəqillik, məqsəd qoyma qabiliyyəti, yaradıcılıq, məsuliyyət, təşəbbüskarlıq, əzmkarlıq və dözümlülük kimi şəxsiyyət xüsusiyyətlərinin inkişafına kömək edir. Şagirdlərin layihə üzərində işləməyə cəlb edilməsinə aşağıdakı layihə bacarıq və bacarıqlarının mənimsənilməsi daxildir:

-Araşdırma: ideyalar yaratmaq, ən yaxşı həll yolunu seçmək;

- Sosial qarşılıqlı əlaqə: təhsil fəaliyyəti prosesində əməkdaşlıq, həmyaşıdların köməyini qəbul etmək və onlara kömək etmək, komanda

onun öz tələblərinə çevrilməsi birdən-birə baş vermir, bir sıra mərhələlər keçir. İlk dövrdə şagird həmin tələbi xarici, məcburi tələb kimi qəbul etməli olur. Sonra şagird həmin tələbi könüllü olaraq qəbul edir, öz vəzifəsini, borcunu dərk edir. Son mərhələdə kənardan verilən əxlaqi tələb şagirdin özünün şəxsi, daxili tələbinə çevrilir, özünə qarşı həqiqi tələbkarlıq meydana gəlir. Əxlaq tərbiyəsi düzgün əxlaqi anlayışlar yaratmaq, bu anlayışlara müvafiq adətlər, rəftarlar formalaşdırmaq kimi vəzifələri yerinə yetirir.

Müşahidələr və aparılan tədqiqatlar göstərmişdir ki, əxlaqı nöqsana səbəb çox vaxt onun mahiyyəti haqqında düzgün məlumatın olmamasıdır. Ona görə də əxlaq tərbiyəvi tərbiyə olunanlarda əxlaqi biliklər, məlumatlar və bu biliklərə istinad edən əxlaqi şüur formalaşdırmasından başlandıqda daha səmərəli nəticə verir. Şüurlu sürətdə dərk edilmiş əxlaq norma və qaydaları insanları hər zaman və hər yerdə şüurlu sürətdə hərəkət etməyə məcbur edir. Şüurlu qavranılmış əxlaq insan davranışının tənzimləyicisinə çevrilir. Formalaşmış düzgün əxlaqi istiqamətlər insana həm özünü həm də başqalarının hərəkətlərini, davranışını təhlil edərək obyektiv qiymət vermə imkanı yaradır. Düzgün əxlaqi münasibətlər insanlara müxtəlif situasiya və vəziyyətlərdə vicdanla, etik normalara uyğun şüurlu seçim imkanı verir. Əxlaqi ideal əxlaqın şüurluluğunun xüsusi forması vacib tərkib hissəsi kimi təzahür edir. İdeal hər kəsin arzu etdiyi əxlaqi keyfiyyətlərə malik insan obrazlarıdır. Daha doğrusu, şəxsin özünün olmaq istədiyi insan nümunəsidir. Yəni hər adam idealında gördüyü müsbət əxlaqi keyfiyyətləri özündə də yaratmağa, formalaşdırmağa çılışır. Əxlaqi anlayışlar aşılanması tərbiyənin ilk mərhələsindən başlanır, müxtəlif fəaliyyət sahələrində davam etdirilir. Belə ki, sistemli təlim və tərbiyə müəssisələrində çəmiyyətdə mövcud ümumi əxlaq normaları və onlara riayət etmənin zəruriliyi aşılanır, izah edilir. Müxtəlif fəaliyyət sahələrində isə həmin fəaliyyət üçün zəruri olan əxlaqi keyfiyyətlər, hərəkətlər haqqında anlayışlar yaradılır. Məsələn istehsal əxlaqı, pedaqoqa verilən (həm orta həm də ali məktəb pedaqoqlarına) əxlaqi tələblər, tələbələrə verilən əxlaqi tələblər, diplomatiya əxlaqi, biznes əxlaqı, mədəni fəaliyyət əxlaqı və s. Bunlar isə müvafiq təhsil və fəaliyyət müəssisələrində köməkçi tərbiyəvi fəaliyyət vasitəsilə həyata keçirilir. Məsələn, istehsalat əxlaqı istehsalat müəssisələrindəki mədəniyyət müəssisələrində keçirilən tərbiyə tədbirləri (əxlaqi söhbət, disput, ədəbi –bədii gecələr və s.) vasitəsilə çatdırılır və s.

Əxlaq tərbiyəsinin məzmununa ümumbəşəri dəyərlərlə yanaşı cəmiyyətdə mövcud olan birgə yaşayış qaydaları, yeni sosial və məişət münasibətləri də daxildir. Əxlaq ictimai şüur forması olduğuna görə onun məzmunu da cəmiyyətlə bərabər dəyişir, hər cəmiyyət özünün iqtisadi-ictimai tələblərinə uyğun əxlaq normaları, qaydaları müəyyən edir. Bu qaydalar bütün cəmiyyət üzvləri üçün zəruri-məcburi, hamı üçün məqbul hesab edilən qaydalardır. Bu norma və qaydaların əksi, ona zidd hərəkətlər isə cəmiyyət üçün qeyri-məqbul, hərəkətlər hesab olunub nə cəmiyyət, nə də ki, digər cəmiyyət üzvləri tərəfindən qəbul edilmir. Əxlaq tərbiyəsinin məzmununa vətənpərvərlik, dostluq və yoldaşlıq, qarşılıqlı yardım, beynəlmiləlçilik, fəaliyyətə şüurlu münasibət, intizam, məsuliyyət, düzlük, doğruçuluq, sadəlik tövazökarlıq insanlara humanist münasibət, onu əhatə edən mühitə – təbiətə qayğılı münasibət və s. daxildir.

Əxlaq tərbiyəsinin mühüm komponentlərindən biri də intizamlılıqdır. İntizam tərbiyəsi əxlaq tərbiyəsinin qiymətli, əhəmiyyətli və vacib keyfiyyətidir. Belə ki, intizam insanın bütün fəaliyyətinin ilk göstəricisidir. Ona görə də hələ tərbiyənin ilk mərhələsində onun səmərəli şəkildə formalaşmasına ciddi fikir verilir. İntizam yaşından asılı olmayaraq hər kəsin özünün–özünə rəhbərliyi, fəaliyyətinin şüurlu istiqamətidir. Humanizm mühüm əxlaqi keyfiyyətdir. Bu, başqa insanlara, onların əməyi, fəaliyyəti, şəxsiyyətinə hörmət üzərində qurulur. Şəxsiyyətin hərtərəfli inkişafı şərtlərindən biri də humanistlikdir. Humanizm dedikdə həm də başqa insanların xoşbəxtliyi uğrunda mübarizə, onların istedad, bacarıq və yaradıcılıq qabiliyyətlərinin üzə çıxarılması, inkişafı üçün şərait yaratmaq, insanlar arasında səmimi münasibətlər yaratmaq da başa düşülür. Humanist münasibətlər bütün insanlara ictimai mövqeyindən asılı olmayaraq bərabər hüquqlu şəxslər kimi baxmaq: insanların ehtiyaclarına diqqətli olub onlara kömək etmək: insanların qəlbinə dəyməmək – onlara qarşı diqqətli olmaq; başqalarını anlamaq, başa düşmək bacarığı və hövsələsi; zəifləri müdafiəyə hazır

olmaq və s. daxildir. Bu münasibətlər insanların bütün həyat boyunca onlara aşılanmalıdır. Humanizmin əsasını başqalarına hörmət və qayğıkeşliklə yanaşmaq təşkil edir. Başqalarına hörmətlə yanaşan insanlarda isə özündən razılıq, başqalarına yuxarıdan aşağı baxma münasibətləri olmur, onlar yüksək ünsiyyət mədəniyyətinə malik olurlar.

**Problemin aktuallığı**. Əxlaq uşağın kiçik yaşlarından formalaşan prosesdir. Gənc nəslin əxlaqını, tərbiyəsini, psixoloji vəziyyətini araşdırmaq müəllimlərin, pedaqoq və psixoloqların diqqət mərkəzində olub. Bu baxımdan, şəxsiyyətin əxlaqi keyfiyyətlərinin formalaşması aktual olaraq qalır.

**Problemin elmi yeniliyi**. Tərbiyə uşaq psixologiyasının çox mürəkkəb problemlərindən biridir. Məqalə də uşaqlarda əxlaq tərbiyəsi haqqında yeni fikirləri formalaşdırır və zənginləşdirir.

**Problemin tətbiqi əhəmiyyəti.** Məqalədən əxlaq tərbiyəsi ilə maraqlananlar ali və orta ixtisas məktəblərində çalışan müəllim və tələbələr istifadə edilə bilər.

**Ədəbiyyat:**

1. Ağayev Ə.Ə. Azərbaycan ictimai-pedaqoji fikrində şəxsiyyətin formalaşması problemi. -Bakı: Avropa, -2005, -288 s.
2. Bayramov Ə.S. Mənəvi əxlaqi tərbiyənin və dini psixologiyanın bəzi xüsusiyyətləri // Azərbaycan məktəbi, -1988, -s. 42-53.
3. Əliyev B.H., Cabbarov R.V. Təhsildə şəxsiyyət problemi / Bakı: Təhsil, -2008. -134 s.
4. В.А. Сластенина. Социальная психология. -М.: Академия, -2000. -264 с.

**E-mail:** qariba648@mail.ru

**Redaksiyaya daxil olub:** 23.05.2024

*UOT159.9*

***Günəş Əli qızı Əfəndiyeva***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi*
*https://orcid.org0009-0003-1938-8965*
*https://doi.org/10.69682/azrt.2024.91(3).140-145*

# TƏLƏBƏ ŞƏXSİYYƏTİNİN TƏLİM ŞƏRAİTİNƏ ADAPTASİYASININ ƏSAS PSİXOLOJİ AMİLLƏRİ

***Гюнешь Али гызы Эфендиева***
*старший преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета*

# ОСНОВНЫЕ ПСИХОЛОГИЧЕСКИЕ ФАКТОРЫ АДАПТАЦИИ ЛИЧНОСТИ СТУДЕНТА К УСЛОВИЯМ ОБУЧЕНИЯ

***Gunesh Ali Afandiyeva***
*senior teacher of Azerbaijan State Pedagogical University*

# MAIN PSYCHOLOGICAL FACTORS OF ADAPTATION OF STUDENTS' PERSONALITY TO STUDYING CONDITIONS

**Xülasə.** Məqalədə qeyd olunur ki, tələbəlik həyatı gənclərin həyatının ən önəmli bir dövrüdür. Tələbəlik tərkibcə mütəmadi olaraq dəyişən mobil sosial qrupdur. Ünsiyyətin yüksək intensivliyi - tələbəliyin səciyyəvi xüsusiyyətidir. Psixoloqlar tələbəliyi "xüsusi sosial kateqoriya", insanların spesifik birliyi kimi səciyyələndirərək tələbəlik yaşının psixoloji səciyyəsini müəyyən edib buraya tələbələrin yüksək idraki motivasiyasını, sosial aktivliyini və sosial yetkinliyini daxil etmişlər. Ali məktəbdə tələbələrin təlim uğurlarına bir çox amillər təsir göstərir. Bu amillərə: maddi vəziyyət, sağlamlıq dərəcəsi, yaş, ailə vəziyyəti, ali məktəbə daxil olana qədər hazırlıq səviyyəsi, özünütəşkil vərdişlərinə yiyələnmə, öz fəaliyyətini planlaşdırma və nəzarət, təlim formaları, ali məktəbin maddi bazası, müəllimlərin ixtisaslaşma səviyyəsi aiddir. Bildirilir ki, tələbələrin intensiv sosiallaşma mərhələsi və ali psixi funksiyaların inkişafı ali məktəblərdə təlimin ümumi psixoloji inkişaf planında özünü daim təzahür etdirir və beləliklə, tələbənin özünütərbiyəsində zəruri keyfiyyətlər, sosial təcrübə formalaşır.
***Açar sözlər:*** *tələbə, sosial qrup, ünsiyyət, müəllim, sosial təcrübə, təlim, yoldaşlıq, dostluq*

**Резюме:** В статье отмечается, что студенческая жизнь является важнейшим периодом жизни молодежи. Студенчество представляет собой мобильную социальную группу, состав которой постоянно меняется. Высокая интенсивность общения – специфическая особенность студенчества. Психологи охарактеризовали студенчество как «особую социальную категорию», особую группу людей и определили психологические особенности студенческого возраста, в том числе высокую познавательную мотивацию студентов, социальную активность и социальную зрелость. На академические успехи студентов в вузе оказывают влияние многие факторы. К этим факторам относятся: материальное положение, уровень здоровья, возраст, семейное положение, уровень подготовки перед поступлением в вуз, приобретение навыков самоорганизации, планирования и контроля собственной деятельности, формы обучения, материальная база высшей школы, уровень подготовки, а также специализация учителей. Отмечается, что этап интенсивной социализации студентов и развития высших психических функций постоянно проявляется в общем психологическом плане развития обучения в вузе, и таким образом формируются необходимые качества и социальный опыт в процессе самообразования студента.
***Ключевые слова:*** *студент, социальная группа, общение, педагог, социальный опыт, обучение, товарищество, дружба*

**Summary:** The article notes that student life is the most important period in the life of young people. Students are a mobile social group, the composition of which is constantly changing. High intensity of communication is a specific feature of students. Psychologists have characterized students as a "special social category", a special group of people and identified the psychological characteristics of student age, including students' high cognitive motivation, social activity and social maturity. Many factors influence the academic success of students at university. These factors include: financial situation, level of health, age, marital status, level of preparation before entering a university, acquisition of skills of self-organization, planning and control of one's own activities, forms of education, material resources of higher schools, level of training, as well as specialization of teachers. It is noted that the stage of intensive socialization of students and the development of higher mental functions is constantly manifested in the general psychological plan for the development of education at a university, and thus the necessary qualities and social experience are formed in the process of student self-education.

***Keywords:*** *student, social group, communication, teacher, social experience, learning, camaraderie, friendship*

Ali məktəblərdə tələbə şəxsiyyətinin özünəməxsus tipologiyası özünü göstərir. Tələbə şəxsiyyətində gələcək peşə sahələrinə iddia səviyyələri yüksəlir, sosial və peşə təcrübəsinin səmərəli şəkildə əldə edilməsi və lazımi keyfiyyətlərin formalaşması sayəsində tələbə şəxsiyyətində yetkinlik və təkidlilik inkişaf edir. Ali məktəblərdə təlimin ümumi psixoloji inkişaf planında tələbələrin intensiv sosiallaşma mərhələsi və ali psixi funksiyaların inkişafı özünü təzahür etdirir. Bütünlükdə tələbə şəxsiyyəti gələcəyin ali təhsilli mütəxəssisi kimi aşağıdakı istiqamətdə inkişaf edir:

* Peşəyə istiqamət möhkəmlənir, zəruri qabiliyyətlər əldə edilir.

* Psixi proseslər, təcrübələr artır və təkmilləşir.

* Borc hissi yüksəlir, peşə fəaliyyətində uğura görə məsuliyyət hissi artır.

* Sosial və peşə təcrübəsi, zəruri keyfiyyətlərin formalaşması nəticəsində tələbə şəxsiyyətinin ümumi yetkinliyi artır.

* Gələcəyin mütəxəssisi kimi tələbənin özünütərbiyəsində zəruri keyfiyyətlər, sosial təcrübə formalaşır.

* Gələcək praktik işə hazırlıq və peşə müstəqilliyi möhkəmlənir və s.

Bu dövrdə tələbə üçün gələcək mütəxəssis kimi lazım olan zəruri keyfiyyətlərin, təcrübənin formalaşmasında özünütərbiyənin xüsusi çəkisi artır. Nəhayət, tələbələrdə peşə müstəqilliyi və gələcək praktik işə hazırlıq səviyyəsi artır və möhkəmlənir (4, s.77). Tələbələrin sosial-psixoloji portretini müəyyən edən və təlim uğurlarına təsir edən amilləri iki kateqoriyada fərqlənirlər:

1/ birincisi, onları diqqətinə görə qəbul edirlər - tələbə ali məktəbə gəlmişdir;

2/ ikincisi, təlim prosesində özlərini təzahür etdirirlər ki, onları idarə etmək olsun.

*Birinci kateqoriyaya:* hazırlıq səviyyəsi, dəyərlər sistemi, təlimə münasibət, ali məktəb realları ilə məlumatlandırılma, gələcək peşə ilə bağlı təsəvvürlər aiddir. Bu amillər bütünlükdə cəmiyyətdə və konkret "məişət bilikləri", habelə informasiya mənbələrinin daşıyıcıları ilə müəyyən olunur. Onlardan tələbəyə dolayı yollarla təsir etmək vasitəsi kimi istifadə etmək olar.

Birinci kateqoriyanın amilləri adaptasiya mərhələsində üstünlüyü ilə həyata keçir. Tədricən birinci qrupun amillərinin təsiri zəifləyir və həlledici rolu ikinci qrup oynayır. İkinci qrupa: təlim prosesinin təşkili, təhsilin səviyyəsi, müəllim və tələbələrin qarşılıqlı münasibət tipləri və s. aiddir. Məhz bunlar əhəmiyyətli dərəcədə tələbə gənclərin psixoloji simasını və peşəkarlıq səviyyəsini müəyyən edir. Bu qarşılıqlı münasibətlərdə tələbə gənclərin peşə seçimi ilə bağlı təhlillər böyük maraq kəsb edir. Bu baxımdan müasir gəncləri üç qrupa ayırırlar:

*Birinci qrupu* peşəyə yiyələnmək üçün təhsilə yönəldilən tələbələr təşkil edir. Onlar üçün gələcək işlər maraqlıdır. Özünüreallaşdırma əsas məqsədə çevrilir. Hətta gələcəkdə təhsilini magistraturada, doktoranturada davam etdirməyə də meyillidirlər.

*İkinci qrupu* biznesə yönələn tələbələr təşkil edir. Onlarda təhsilə münasibət bir qədər fərqlidir. Belə ki, onlar üçün təhsil alət qismində dəyərlidir, onun vasitəsi ilə gələcəkdə öz şəxsi işlərini qurmağa cəhd göstərmək və ticarətlə məşğul olmaqdır.

*Üçüncü qrupa* o tələbələr aid edilir ki, bir tərəfdən onlar "qeyri-müəyyənliklər", digər tərəfdən isə məişət planında müxtəlif şəxsi problemləri ilə yüklənmişlər. Onlar üçün birinci planda məişət, şəxsi, yaşayış və ailə problemləri dayanır (1, s. 25-27).

Müasir tələbə gənclərin bir neçə tiplərini fərqləndirirlər:

*Birinci tipi - "Sahibkar"* adlandırırlar. Bu tipə malik olan tələbə biznes sahəsində uğurlar əldə etməyə can atır. Ali təhsili ona görə almaq istəyir ki, sahibkarlıqla bağlı nəzəriyyə və praktikaya yiyələnsin, gələcəkdə rəhbər vəzifələrdə çalışsın. Bu tələbə düzgün ixtisas seçdiyinə inanır, eyni vaxtda öz təhsil müəssisəsinə tənqidi yanaşır, peşə spesifikasına daha yaxşı bildiyini nümayiş etdirmək istəyir. Odur ki, o, işsiz qalmaqdan ehtiyat etmir, onda şəxsi keyfiyyətlər, o cümlədən fərdiyyətçilik, peşəkarlıq, müstəqillik, şəraitə uyğun olaraq baxışları dəyişmək qabiliyyəti, tez adaptasiya olmaq və yeni şəraitə məskunlaşmaq kimi keyfiyyətlər vardır.

*İkinci tipi "Emiqrant"* adlandırırlar. Bu tip tələbələr yüksək ali təhsilə ona görə yiyələnmək istəyirlər ki, sərbəst şəkildə xarici dildə danışsınlar, təhsil almaq imkanlarından istifadə edib gələcəkdə xaricdə işləsinlər. Onlar peşələrdə düzgün seçim etmələrinə çox inamlıdırlar. Onlarda fərdiyyətçilik, həyati optimizm, yeni şəraitə uyğunlaşma inkişaf edir.

Hər iki tipə qarşı "ənənəyə sadiqlik" dayanır. O, yaxşı təhsili, peşə hazırlığını qiymətləndirir. Ali təhsilə ona görə yiyələnmək istəyir ki, diplom alsın, elmi- tədqiqatlar aparsın. Bu tip tələbə oxuduğu ali təhsil müəssisəsinə qarşı az tənqidçidir. Öz peşə fəaliyyətini ilə bağlı kifayət qədər məlumata malik deyil. İşsiz qalmaqdan ehtiyatlanır, onda peşəkarlıq və işə qabillik güclü inkişaf etmişdir. Lakin onda risk etmək qabiliyyəti, şəraitə uyğun baxışları dəyişmək, həyati optimizm, yeni şəraitə tez məskunlaşmaq bir qədər aşağı səviyyədədir.

*Tədris və idrak sahəsindəki fəaliyyətə və davranışına görə* tələbə şəxsiyyətinin üç tipini xüsusi olaraq qeyd edirlər:

*Birinci tip* tələbə şəxsiyyətinə malik olanlar ali məktəbdə tədrisin məqsəd və vəzifələrinə geniş yer verirlər. Bu cür tələbələrin maraqları proqramda nəzərdə tutulandan daha geniş bilik sahəsinə yönəlmiş olur. Həmin tələbələrin sosial fəallığı ali məktəb həyatının mühüm sahələrində özünü göstərir. Bu tipə mənsub olan tələbələrin fəaliyyəti daha geniş əhatəli peşə hazırlığına yiyələnməyə yönəlmiş olur.

*İkinci tip* tələbə şəxsiyyəti dar ixtisaslaşmaya aydın yönəlişliyi ilə fərqlənir. Birinci tipdə olduğu kimi, bu tipdən olan tələbələrin idrak fəallığı tədris proqramından kənara çıxır. Lakin birinci tipdən fərqli olaraq onlarda proqram çərçivəsindən kənara çıxmaq halları güclü baş verir.

*Üçüncü tip* tələbələrin idrak fəaliyyəti yalnız tədris proqramı həcmində bilik, bacarıq və vərdişlərə yiyələnməyə istiqamətlənmiş olur (4, s.7).

*Tədrisdəki münasibətə görə* bir sıra tədqiqatçılar tələbələri beş qrupa bölürlər:

*Birinci qrupa* daxil olan tələblər biliklərə, müstəqil iş metodlarına yiyələnməyə, peşə bacarıq və vərdişlərinə yiyələnməyə can atır, təlim fəaliyyətini səmərəliləşdirmək yollarını axtarırlar. Onlar üçün tədris fəaliyyəti seçdikləri peşəyə yaxşı yiyələnməyin zəruri yoludur. Onlar keçdikləri həmin fənləri yaxşı öyrənirlər. Bu cür tələbələr tədris proqramında nəzərdə tutulandan daha çox bilik sahəsinə yiyələnməyə can atırlar. Onlar tədris fəaliyyətinin bütün sahələrində fəaldırlar.

*İkinci qrupa* daxil olan tələbələr tədris fəaliyyətinin bütün sahələri üzrə biliklərə yiyələnməyə can atırlar. Bu qrupa daxil olan tələbələr üçün daha çox fəaliyyətlə maraqlanmaq xarakterik haldır. Lakin bu və ya digər fənnin mahiyyətinə dərindən daxil olmaq onları tez yorur, bezikdirir. Odur ki, onlar çox vaxt səthi biliklərə yiyələnməklə məhdudlaşırlar. Onlar hər şeydən bir az bilməyə üstünlük verirlər. Adətən onlar yaxşı oxuyur, lakin onları maraqlandırmayan fənlərdən çox vaxt qeyri-kafı qiymətlər alırlar.

*Üçüncü qrupa* yalnız öz peşəsi ilə maraqlanan tələbələri aid etmək olar. Onların bütün fəaliyyətləri biliklərə yiyələnməklə və dar peşə çərçivəsi ilə məhdudlaşır. Onlar yalnız gələcək peşə fəaliyyətləri üçün zəruri olan biliklərə yiyələnməyə can atırlar. Bu qrupa daxil olan tələbələr ixtisasları ilə bağlı fənlərdən yaxşı və əla qiymətlər alırlar.

*Dördüncü qrupa* daxil olan tələbələr pis oxumurlar. Lakin tədris proqramına seçici münasibət bəsləyirlər. Yalnız onların xoşlarına gələn fənlərlə maraqlanırlar. Onlar tez-tez dərsləri buraxırlar. Tədris planındakı bəzi dərslərlə maraqlanmırlar.

*Beşinci qrupa* tənbəl tələbələri aid edirlər. Onlar ali məktəbə ya valideynlərinin təhriki, ya da yoldaşları ilə "kompaniya" xatirinə işləmək, orduya getməmək xatirinə daxil olurlar. Tədrisə laqeyd münasibət bəsləyirlər. Daima dərs buraxır, "kəsirləri" olur, onlara yoldaşları kömək edir (5, s.78).

A.V. Yureviçin fikrincə, tələbə kütləsi müddət ölçüləri üzrə üç tipə ayrılırlar:

1/ hamı məşğələlərdə iştirak edir; 2/ demək olar ki, tələbələr mühazirə və seminarlarda iştirak etmirlər; 3/ təsadüfdən təsadüfə dərslərdə iştirak edirlər.

Məkani ölçülərdə üç tip bölgü müşahidə olunmuşdur: 1/ birinci cərgədə deyilənləri qeydə alan əlaçılar; 2/ orta cərgədə yalnız onlar üçün vacib və maraqlı informasiyaları qeydə alanlar; 3/ arxa cərgələrdə qulaq aşmayanlar, qeydiyyat aparmayanlar və kənar işlərlə məşğul olanlar.

L.N. Zaxarov aparılmış eksperimentin nəticələri üzrə tələbələri peşə davranışı üslubundan asılı olaraq dörd tipə ayırmışdır: *avtoritar* (tələbələrə təzyiq), *rigid* (plana uyğun tipik xahiş üzrə tələbələri sakitləşdirən), *nümayişkaranə* (fənnə maraq yaratmaq vasitəsi kimi situasiyaya nəzarət etməyə cəhd göstərmə), *konstruktiv* (plana uyğun olaraq qrupu idarəetmə prosesində adekvat vasitələr axtarışı.

Bununla əlaqədar olaraq dərsdə tələbələrin davranışı və peşə sahəsində motivasiya xüsusiyyətləri arasındakı əlaqə qeydə alınmışdır: şəxsi məna—►yüksək emosionallıq, praqmatik motivasiya^ emosional təmkinlilik, konstruktiv üslub, emosional proseslərin aşağı dinamikliyi — avtoritar və rigid üslubu (2, s.61-62).

Psixoloq V.T. Lisotski tələbə şəxsiyyətinin tipologiyasını işləyib hazırlamışdır. Həmin tipologiya hərtərəfli inkişaf edən subyektin spesifik fəaliyyətini qeydə almaqla tələbə haqqında təsəvvürləri bütünlükdə əks etdirir.

1. "*'Harmonik" (ahəngdar).* Bu cür tələbələr öz ixtisaslarını şüurlu şəkildə seçirlər. Çox yaxşı oxuyur, elmi və ictimai işlərdə fəal iştirak edirlər. Mədəni və ünsiyyətcildirlər. Ədəbiyyat və incəsənətlə, ictimai hadisələrlə dərindən və ciddi şəkildə maraqlanır, idmanla məşğul olurlar. Qüsurlara qarşı barışmaz, düzgün və doğruçudurlar. Yaxşı bir yoldaş kimi kollektivdə yüksək nüfuza malikdirlər.

2. *"Peşəkar".* Öz ixtisasını şüurlu şəkildə seçir. Bir qayda olaraq yaxşı oxuyur. Elmi-tədqiqat işlərində az iştirak edir, lakin o məktəbdən sonrakı praktik fəaliyyətə yönəlir. İctimai işlərdə iştirak edir, tapşırıqları məsuliyyətlə yerinə yetirir. İmkan daxilində idmanla məşğul olur. Ədəbiyyat və incəsənətlə maraqlanır. Onun üçün başlıca məqsəd oxumaqdır. Qüsurlara qarşı barışmazdır. Düzgün və doğruçudur. Kollektivdə nüfuza malikdir.

3. *"Akademik".* Öz ixtisasını şüurlu seçmişdir. Yalnız əla qiymətlərlə oxuyur. Aspiranturada oxumağa meyllidir. Ona görə də vaxtının çoxunu elmi-tədqiqat işlərinə sərf edir.

4. *"İctimaiyyətçi".* Bu cür tələbələrdə ictimai işlərə meyl aydın təzahür edir. Bu meyl digər maraqlardan üstünlük təşkil etdiyinə görə tədris və elmi-tədqiqat işlərində onun fəallığına öz mənfi təsirini göstərir. O, peşəsini düzgün seçdiyinə inanır. Ədəbiyyat və incəsənətlə maraqlanır.

5. *"İncəsənəti sevənlər".* Bu tipə mənsub olan tələbə adətən yaxşı oxuyur, lakin elmi-tədqiqat işlərində az iştirak edir. Daha çox ədəbiyyat və incəsənət sahələri ilə maraqlanır. Onda inkişaf etmiş estetik zövq, dərin bədii erudisiya mövcuddur.

6. *"Çalışqan".* İxtisasını o qədər də şüurlu şəkildə seçməmişdir, lakin oxumağa ciddi səy göstərir. İnkişaf etmiş qabiliyyətə malik olmasa da, adətən semestrdə kəsirləri olmur. Kollektivdə az ünsiyyətlidir. Ədəbiyyat və incəsənətlə zəif maraqlanır. Vaxtının çoxunu oxumağa sərf edir, lakin kinoda, konsertdə olmağı da sevir. İdmanla ali məktəb çərçivəsində məşğul olur.

7. *"Ortabab".* "Necə gəldi" oxuyur, bunun üçün xüsusi səy göstərmir. Hətta bununla fəxr edir. Onun prinsipi: "Diplom alacam və başqalarından pis işləməyəcəyəm". Peşəni seçərkən xüsusi olaraq fikirləşməmişdir. Lakin inanır ki, ali məktəbə daxil olmuşam, onu bitirmək lazımdır. Yaxşı oxumağa çalışır. Halbuki təlimdən həzz ala bilmir.

8. *"Ümidsiz".* Bir insan kimi qabiliyyətlidir. Lakin seçdiyi ixtisas onun üçün bir o qədər də cəlbedici deyildir. Yaxşı oxumağa cəhd göstərir, lakin oxumaqdan həzz almır. Özünü müxtəlif növlü xobbilərdə - incəsənətdə, idmanda təsdiq etməyə cəhd göstərir.

9. *"Tənbəl”.* Adətən, zəif oxuyur. Oxumağa az güc sərf edir. Lakin özündən çox razıdır. Öz peşəsinə ciddi yanaşmır, imtahanlarda "şparqalka"dan mütəmadi istifadə edir. Elmi-tədqiqat və ictimai işlərdə iştirak etmir. Daha çox əyləncələrə maraq göstərir.

10. *"Yaradıcı".* Hər bir işə yaradıcı yanaşmaq ona xasdır. Lakin dözümlülük, səliqəlilik, intizamlılıq tələb edən məşğələlər onu cəlb etmir. Ona görə də oxumaqda ardıcıl deyildir. Odur ki, o, "bu mənim üçün maraqlıdır", "maraqlı deyil" prinsipi üzrə hərəkət edir. Elmi-tədqiqat işi ilə nüfuzlu şəxslərin fikirləri ilə razılaşmadan məşğul olarkən müstəqil şəkildə problemin orijinal həlli yolunu axtarır.

11. *'İlahiləşdirilmiş".* Bir qayda olaraq nüfuzlu fakültələrdə müvəffəqiyyətlə oxuyur. Kütləvi peşələrdə oxuyan tələbələrə "yuxarıdan" aşağı baxır. Özünə uyğun kompaniyalarda liderliyə can atır. Onun fikirləri həmyaşıdları tərəfindən dinlənilir, bəyənilir, lakin biliyi seçicidir. İncəsənət sahəsində daha çox maraq kəsb edən hadisələr onu cəlb edir. Kütlədən fərqli olaraq onun öz rəyi var. O, kafelərə, zövqlü klublara mütəmadi olaraq gedir (3, səh.437).

Bütün ali məktəb müəllimlərinə yaxşı məlumdur ki, hələ I kurs tələbələrində qeyri-adekvat özünüqiymətləndirmə özünü təzahür etdirir. Bu fenomen praktik olaraq tələbə şəxsiyyətinin tipologiyasında özünün aydın ifadəsini tapmışdır. Bir çox tədqiqatçılar qeyd edirlər ki, tələbələrin psixoloji xüsusiyyətlərinin tədqiqində, şəxsiyyətin ayrı-ayrı xassələrinin ifadə olunmasında iradi keyfiyyətlər mühüm rol oynayır. V.A. İvannikova görə, insan o zaman iradi keyfiyyətləri təzahür etdirir ki, hər hansı bir fəaliyyəti həyata keçirmiş olsun. Təlim prosesində mühüm problem ondan ibarətdir ki, tələbə bütün gücü ilə özünü təlim fəaliyyətinə yönəltməlidir. Təlim motivi təlim fəaliyyətinin daxilində olmalıdır və ya həmin prosesə yaxın məsafədə olmalıdır. Buna yalnız o zaman nail olmaq mümkündür ki, təlim tələbə üçün maksimum dərəcədə maraqlı olsun, onda məmnunluq və razılıq hissi yarada bilsin.

Habelə tələbədə elə motiv və yönəlişlik formalaşdırılmalıdır ki, onlar təlim fəaliyyətində daxili və xarici maneələri aradan qaldıra bilsin. İstənilən fəaliyyətdə, o cümlədən təlimdə uğur tələbənin, ilk növbədə, intellektual inkişaf səviyyəsindən asılıdır. İntellektual qabiliyyətlərlə fəaliyyət arasında qarşılıqlı əlaqə dialektik səciyyə daşıyır. Odur ki, fəaliyyətin müxtəlif sahələrində effektivlik həmin fəaliyyətdə müəyyən qabiliyyətlərin səviyyəsini tələb edir, o da öz növbəsində inkişaf prosesinə öz təsirini göstərir. Tələbələrin təlim fəaliyyətində müvəffəqiyyəti təkcə ümumi intellektual inkişaf və xüsusi qabiliyyətlərdən deyil, həm də sağlam düşüncə tərzindən, maraq və motivlərdən, temperamentdən, xarakterdən, şəxsiyyətin istiqamətindən, onun özünüdərkindən çox asılıdır.

Tələbə şəxsiyyətinin potensial imkanlarının optimallaşdırılması şərtlərinə onun fəallığı, müəyyən fəaliyyət növlərinə istiqamətlənmə aiddir. Tələbənin əsas tələbatlarından biri ünsiyyətdir. Ünsiyyətdə onlar təkcə ətrafdakı insanları deyil, həm də özlərini dərk edir, sosial həyat təcrübəsinə yiyələnirlər. Ünsiyyətə tələbat tələbələrin çoxsaylı əlaqələrini, yoldaşlıq və dostluğun inkişafını şərtləndirir, bilik və təcrübə mübadiləsini, əhval-ruhiyyəni stimullaşdırır. Tələbə şəxsiyyətinin digər mühüm tələbatlarından biri uğura tələbatdır. Tələbənin həyati tələbatlarının ödənilməsi imkanına görə səciyyəvidir. Psixoloji tədqiqatlar göstərir ki, tələbənin fəallığının effektivliyinin yüksəlməsi gələcək peşədə və ali məktəbdə təlimin tələblərinə müvafiq mənəvi tələbatların inkişafı ilə bağlıdır.

Odur ki, təlim prosesinin optimallaşmasına müxtəlif mövqelərdən yanaşılır: təlim metodlarının təkmilləşməsi, təlim və tərbiyə prosesinin fərdiləşdirilməsi və s. Bütün bu yanaşmaların mərkəzində tələbə şəxsiyyəti durur. Tələbə şəxsiyyətinin psixoloji xüsusiyyətlərinə dair biliklər - qabiliyyətlər, ümumi intellektual inkişaf, maraq və motivlər, ali məktəbdə müasir təlim şəraitində onların qeydə alınmasının real imkanlarını araşdırmağa imkan verir.

**Problemin aktuallığı**. Tələbə şəxsiyyətinin potensial imkanlarının optimallaşdırılması şərtlərinə onun fəallığı, müəyyən fəaliyyət növlərinə istiqamətlənmə aiddir. Tələbənin əsas tələbatlarından biri ünsiyyətdir. Ünsiyyətdə onlar təkcə ətrafdakı insanları deyil, həm də özlərini dərk edir, sosial həyat təcrübəsinə yiyələnirlər. Ünsiyyətə tələbat tələbələrin çoxsaylı əlaqələrini, yoldaşlıq və dostluğun inkişafını şərtləndirir, bilik və təcrübə mübadiləsini, əhval-ruhiyyəni stimullaşdırır. Tələbə şəxsiyyətinin digər mühüm tələbatlarından biri uğura tələbatdır. Tələbənin həyati tələbatlarının ödənilməsi imkanına görə

spesifikdir. Bu baxımdan və onun pedaqoji-psixoloji ədəbiyyatda qoyuluşu kimi vacib bir mövzuya həsr olunması məqalənin aktuallığını şərtləndirir.

**Problemin elmi yeniliyi**. Elmi yenilik onunla bağlıdır ki, məqalədə tələbə şəxsiyyətinin tipologiyasının mahiyyəti ilə bağlı görkəmli psixoloqların yanaşmaları diqqətə çatdırılır, tələbə şəxsiyyəti anlayışı sosial-psixoloji problem kimi nəzərdən keçirilərək ayrı-ayrı mərhələlərinin səciyyəvi cəhətləri göstərilir və bu istiqamətdə aparılmış müxtəlif tədqiqatların nəticələri təhlil olunur.

**Problemin tətbiqi əhəmiyyəti**. Məqalədən ali və orta ixtisas məktəblərin müəllimləri, tələbə və magistrantlar, eləcə də praktik psixoloqlar yararlana bilərlər.

**Ədəbiyyat:**


1. Bayramov, Ə.S. Sosial psixologiya. Dərslik. / Ə.S. Bayramov, Ə.Ə. Əlizadə. -Bakı: Qapp-Poliqraf Korporasiyası, -2003. -356 s.
2. Əliyev, B.H., R.B. Cabbarov, K.R. Əliyeva. Pedaqoji psixologiya. / B.H. Əliyev, R.B. Cabbarov, K.R. Əliyeva. -Bakı, 2011. -256 s.
3. Əliyev, R.İ. Tərbiyə psixologiyası. / R.İ. Əliyev. -Bakı: Nurlan, -2006. -200 s.
4. Həmzəyev, M.Ə. Yaş və pedaqoji psixologiya. / M.Ə. Həmzəyev. -Bakı, 2000. -171 s.
5. Абакумова Н.Н. Организация среды профессионального самоопределения: предпрофильная подготовка и профильное обучение. Вестн. Томск. Гос.ун.-та. 2007, № 296, с. 194-196


**E-mail:** gunes.efendiyeva1953@gmail.com

**Redaksiyaya daxil olub:**30.05.2024

*UOT 159.9.*

***Rəna Nurəddin qızı Qasımova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Ümumi psixologiya kafedrasının baş müəllimi.*
*https://orcid.org/ 0009-0005-2097-3787*
*https://doi.org/10.69682/azrt.2024.91(3).146-149*

## YENİYETMƏLƏRDƏ AQRESSİYAYA SƏBƏB OLAN AMİLLƏR

***Рена Нураддин гызы Гасымова***
*старший преподаватель кафедры общей психологии*
*Азербайджанского Государственного Педагогического Университета*

## ФАКТОРЫ, ВЫЗЫВАЮЩИЕ АГРЕССИЮ У ПОДРОСТКОВ

***Rena Nuraddin Khasumova***
*senior lecturer of the department of General psychology of*
*Azerbaijan State Pedagogical University*

## FACTORS CAUSING AGGRESSION IN TEENAGERS

**Xülasə.** Bu məqalə yeniyetmələrdə aqressiyanın artmasına səbəb olan amillər haqqındadır. Yeniyetməlik dövründə uşaqlar emosional olaraq qeyri-sabit olurlar. Psixoloqlar bunun səbəbini ilk növbədə bioloji amillərlə əlaqələndirirlər - hormonal dəyişiklik, bədəndə gedən yeniliklər, yetkinlik. Buna baxmayaraq, bəzən emosional hallar radikal forma ala bilər və aqressiyaya çevrilə bilər. Və əgər yeniyetmə öz inadkarlığı, üsyanı, aqressiyası ilə baş-başa qalarsa, bu, onu cinayətə və ya qarşısı alınmaz digər mənfi hallara sürükləyə bilər.
***Açar sözlər:*** *yeniyetməlik, aqressiya, aqressivlik, zorakılıq, emosional vəziyyət, psixologiya*

**Резюме:** В данной статье рассматриваются факторы, которые приводят к повышению агрессивности у подростков. В подростковом возрасте дети эмоционально нестабильны. Психологи связывают причину этого прежде всего с биологическими факторами – гормональными изменениями, изменениями в организме, половым созреванием. Тем не менее, иногда эмоциональные ситуации могут принять радикальную форму и перерасти в агрессию. И если подросток останется наедине со своим упрямством, бунтарством, агрессивностью, это может привести его к преступлению или другим негативным ситуациям, которых невозможно избежать.
***Ключевые слова****: подростковый возраст, агрессия, агрессивность, насилие, эмоциональное состояние, психология*

**Summary.** This article examines the factors that lead to increased aggressiveness in adolescents. During adolescence, children are emotionally unstable. Psychologists attribute the reason for this primarily to biological factors - hormonal changes, changes in the body, puberty. However, sometimes emotional situations can take a radical form and develop into aggression. And if a teenager is left alone with his stubbornness, rebellion, and aggressiveness, this can lead him to crime or other negative situations that cannot be avoided.
***Key words:*** *adolescence, aggression, aggressiveness, violence, emotional state, psychology*

Yeniyetmələr uşaqlıqdan yetkinliyə keçidin həyəcanverici dövrünü yaşayırlar. Yeniyetmə yaş dövründə unikal şəxsiyyət xüsusiyyətlərini və bacarıqlarını inkişaf etdirdikcə maraqlı kəşflərlə dolu yaş dövrü ola bilər. Digər tərəfdən, erkən yeniyetməlikdən gəncliyə gedən yol bəzi çətinliklərlə müşayiət olunur. Yeniyetmələrin beyni kiçik uşaqların və ya böyüklərin beyinlərindən əsaslı şəkildə fərqləndiyinə görə, yeniyetmə yaş aralığında onların unikal psixolo-

giyasını anlamaq münasibətlərinizi gücləndirməyə və onlar böyüdükcə onlara daha yaxşı dəstək olmağa kömək edə bilər.

Aqressiya insanın birgəyaşayış normalarına zidd olan, hücum hədəflərinə zərər vuran, insanlara fiziki və mənəvi zərər vuran və ya psixoloji diskomfort yaradan motivasiyalı dağıdıcı davranışdır.

Yeniyetmələrdə aqressiv davranış, özünə zərər vermək, evdən çıxmaq, bir qayda olaraq, başqalarının hərəkətlərinə və davranışlarına mənfi reaksiyadır.

Yeniyetməlik yetkinlik və emosional dəyişikliklərin baş verdiyi dövrdür, amma uşağın psixikası həmişə bu dəyişikliklərə vaxtında uyğunlaşa bilmir. Bədən sürətlə dəyişir, hormonal sistem yenidən qurulur. Yəni, emosiyalar aşıbdaşır, lakin yeniyetmə onların öhdəsindən gəlməkdə çətinlik çəkir, o, heç də həmişə onları idarə etmək və cilovlamaq iqtidarında olmur. Hər hansı bir hadisə onun öz uğur və ya uğursuzluğu ilə əlaqədar olaraq qəbul edilir. Beləliklə, yeri gəlmişkən, sosial şəbəkələrdən real asılılıq və orada mümkün qədər çox dost qazanmaq istəyi, uğurlarına dair şübhələr uşağın ağır diskomfort yaşamasına, özünə hörmətin azalmasına səbəb olur və əsəbilik və narahatlıq əlamətləri ilə özünü göstərə bilər. Bu yaşda uşaqlar emosional labillik ilə xarakterizə olunur - yəni onların əhval-ruhiyyəsi tez və bəzən heç bir səbəb olmadan dəyişir. Gah ağlayır, gah gülür, gah da ətrafdakı hər kəslə xoş ,sevgi dolu, mərhəmətli, səmimi davranır, sonra heç bir səbəb olmadan kobudluq edib incitməyə, qəlb qırmağa başlayır.

Narahatlıq, kobudluq, dostları ilə yola getməmək komandada uyğunlaşmanın pozulmasına gətirib çıxarır. Nəticədə həmyaşıdları ilə effektiv və uğurlu ünsiyyət qura bilməyən yeniyetmələr kənarda qalanlar kateqoriyasına düşür. Belə uşaqlar tənhadırlar, dostları yoxdur və sosial mühitlə bağlı problemləri var. Belə yeniyetmələr davranışları, ünsiyyət tərzi, hətta xarici görünüşü ilə seçilirlər.

Aqressiv davranışın əsas səbəblərinə bioloji (müxtəlif növ xəstəliklər) və sosial-psixoloji (tərbiyə, ailədə aqressiya, antisosial qruplar, informasiya mühitinin təsiri və s.) aiddir.

Yeniyetmələrin üsyankar, inadkar və hətta bəzən qəzəbli olması qeyri-adi davranışlar deyil. Bəs qəzəb aqressiv davranışa çevrildikdə valideynlər nə etməlidirlər? Və yaxud da nə vaxt yeniyetmələrdə aqressiya onların psixi sağlamlıq vəziyyəti üçün müalicəyə ehtiyacı olduğuna işarədir?

Aparılmış bir araşdırmada böyüklər və yeniyetmələrə müxtəlif insanların fotoşəkilləri göstərilib. Eyni zamanda, tomoqrafda subyektlərin beyin fəaliyyətinə nəzarət edilib. Məlum oldu ki, yeniyetmələr başqa insanların emosiyalarına böyüklərdən daha aktiv reaksiya verirlər. Üstəlik, oğlanlar və qızlar neytral ifadəli insanların simalarında belə təbəssüm, istehza, qəzəb və aqressiya görməyə meyillidirlər. Bu, bir çox yeniyetmələrin niyə göz yaşlarına boğulduğunu və ya əksinə, əsəbiləşə biləcəyini izah edir, əgər onlara "bir şəkildə" baxsanız, onların beyni emosiyaları, duyğuları xəyal edəcək və yeniyetmənin sinir sistemi buna çox şiddətli reaksiya verəcəkdir.

Yeniyetmə aqressiyası, təcavüzü müxtəlif yollarla, o cümlədən şifahi təcavüz, fiziki zorakılıq və anti-sosial davranışlarla özünü göstərə bilər. Təcavüzkar yeniyetmə davranışları aşağıdakıları əhatə edə bilər:

- Qışqırmaq
- Etik olmayan ifadələr
- Sarkazm və təhqir kimi şifahi təhqiramiz danışıq üslubu
- Fiziki zorakılıq
- Evdən qaçıb gecəni evdən kənarda qalmaq kimi nəzarətdən kənar davranışlar
- Bulinq və kiber zorakılıq
- Qeybət və şayiələr yaymaq
- Əmlakın zədələnməsi (avtomobillərin açarlarının vurulması, təkərlərin kəsilməsi və s.)

Yeniyetmələrdə aqressiya bəzən impulsiv aqressiya və ya instrumental aqressiya kimi təsnif edilir.

- İmpulsiv aqressiya affektiv aqressiya və ya emosional aqressiya kimi də tanınır. Adətən nəzarətsiz və kortəbii olur.
- İnstrumental aqressiya koqnitiv aqressiya kimi də tanınır. Bu hallarda, yeniyetmənin aqressiv davranış üçün planı, niyyəti və ya məqsədi olur.

İmpulsiv yeniyetmə aqressiya nümunələri, bacı-qardaşı əsəbləşdikdə itələmək və ya hiss etdiklərini açıq şəkildə ifadə edə bilmədikdə valideynə qışqırmaq ola bilər.

İnstrumental aqressiya nümunəsi bir dost qrupu daxilində təkrarlanan təcəvüzkar davranışları ola bilər.

Depressiya, narahatlıq, travma və ya zərərli maddə istifadəsi aludəciliyi ilə mübarizə aparan yeniyetmələrin aqressiv davranışları nümayiş etdirmə ehtimalı daha yüksəkdir. Bununla belə, valideynlər bir yeniyetmənin niyə bu cür hərəkət etdiyini başa düşməlidirlər. Valideynlər yeniyetmələrdə aqressiyaya səbəb olan şeylər haqqında nə qədər çox məlumatlı olsalar, uşaqlarını dəstəkləmək üçün bir o qədər yaxşı təchiz olunmuş olacaqlar.

Tədqiqatlar göstərir ki, göstərilən risk faktorları, zorakılıq, aqressiya kimi hallara məruz qalınması azaldılsa və ya aradan qaldırılarsa, çox şiddətli davranış pozuntuları azaldıla və ya hətta qarşısı alına bilər. Ən əsası, uşaq və yeniyetmələrin birinci növbədə evdə, cəmiyyətdə və media vasitəsilə zorakılığa məruz qalmasının kəskin şəkildə qarşısının alınmasına yönəldilməlidir. Aydındır ki, zorakılıq zorakılığa gətirib çıxarır.

Bundan əlavə, aşağıdakı strategiyalar zorakı davranışı azalda və ya qarşısını ala bilər:

Uşaq istismarının qarşısının alınması (valideyn təlimi, ailəyə dəstək proqramları və s. kimi proqramların istifadəsi)

Yeniyetmələr üçün cinsi təhsil və valideynlərə dəstək proqramları

Zorakılığa məruz qalan gənclər üçün erkən identifikasiya və müdaxilə proqramları

İnternet, planşetlər, smartfonlar, TV, videolar və filmlər daxil olmaqla, uşağın ekran vaxtı ərzində zorakılığa baxmasının qarşısının alınması monitorinqi.

Valideyn və ya başqa bir yetkin şəxs yeniyetmənin davranışlarından narahat olduqda, onlar dərhal ixtisaslı mütəxəssis tərəfindən yoxlanış və hərtərəfli qiymətləndirmə üçün görüş təşkil etməlidirlər. Bir mütəxəssis tərəfindən erkən müalicə tez kömək edə bilər. Müalicənin məqsədi adətən aşağıdakı yollarla uşağa kömək etməkdən ibarətdir:

qəzəbini idarə etməyi öyrənmək;

əsəb və məyusluqları müvafiq doğru yollarla ifadə etmək;

öz hərəkətlərinə görə məsuliyyət daşımaq;

və nəticələri qəbul etmək.

Bəs uşağında aqressiv davranışlar olan, valideynlər nə etməlidir?

Valideynlər övladının öhdəsindən gələ bilmirlər və buna görə də problemi görməzdən gəlməklə həll etməyə çalışırlar. Bu üsul nəticə vermirsə, inandırma, mübahisə və sadə şantajlardan istifadə olunur: “Sakit ol, yoxsa , telefonunu əlindən alacam”, “Əgər mənimlə bir daha mübahisə etsən, o zaman, atana deyəcəm! ” Bir yeniyetmə ilə bu cür davranış modeli heç bir nəticə vermir, çünki bu yaşda uşağa birbaşa "təzyiq göstərmək" cəhdləri faydasızdır.

1. Aqressiv, zorakı uşaqları idmana yönləndirmək doğru seçim ola bilər. İdman müəllimləri orada ona izah edəcəklər ki, mübahisəni yumruqlarla həll etmək bir seçim deyil, ədalətli döyüş və özünümüdafiə bacarıqları onun üçün faydalı olacaq. Bu futbol və ya atletika, döyüş növləri - cüdo, sambo, karateni sınaqdan keçirə bilərsiniz. Bu idman növləri yaxşı nəticə verəcək, çünki orada uşağa təkcə öz işini deyil, həm də duyğularını mənimsəməyi öyrədirlər.

2. Uşaqlara uğur qazanacaqları bir sahəyə yönləndirmək onları daha öz güvənli və sakit olmaqda kömək edəcək. Misal üçün hər hansı bir fənn olimpiadasında və ya rəsm yarışında qalib gələn yeniyetmə daha sakit, özgüvənli, mərhəmətli olacaq.

3.Yeniyetmələrdə mütaliə bacarıqlarını inkişaf etdirin. Cek London, Mark Tven, Tolstoy və Artur Konan Doylun kimi klassiklərin kitablarını oxumaq, onların inkişafında üstünlük təşkil edən məqamlardandır.

4. Sevgi bütün çətinliklərin öhdəsindən gəlir. Sevildiyini bilmək hər uşaq üçün vacibdir. Valideynlər tez-tez uşaqlarına sevgisini bildirməlidir. Diqqətsiz qalan yeniyetmə daha aqressiv və təcavüzkar olur. Bu bir növ onların müdafiə mexanizmidir.

5. Aqressiv davranışın psixoloji səbəbləri olduğu qədər, bir çox bioloji səbəbləri də var. Məsələn, ürək problemi. Bir yeniyetməni müşahidə edin: əgər səbəbsiz aqressiya nümayiş etdirirsə, uşaq tez-tez qışqırır, heç bir səbəb olmadan əsəbiləşirsə o zaman mümkünsə həkimə getmək, düzgün müalicə metodu seçmək lazımdır.

Bütün bu xoşagəlməz halların qarşısını almaq üçün əsas odur ki, yeniyetmə onun tək olmadığını və ailənin onu dəstəkləməyə hazır olduğunu və ailəsinin onun arxasında olduğunu bilsin.

**Problemin aktuallığı.** Yeniyetməlik yaşı, yeniyetmələrdə baş verən fiziki, psixoloji dəyişikliklər daima psixoloqların və əlaqəli sahələrin mütəxəssislərinin diqqətini çəkmiş və yeniyetməlik yaş dövründə baş verən problemlər ilə bağlı bir sıra nəzəriyyələr irəli sürülmüş, araşdırmalar və tədqiqatlar aparılmışdır. Buna baxmayaraq, eyni zamanda psixoloji ədəbiyyatda və praktikada geniş araşdırılmasına baxmayaraq, yeniyetməlik yaş dövründə aqressiyanın artması ilə bağlı amillər nəzəri baxımdan kifayət qədər işlənməmişdir. Bu baxımdan yeniyetmə şəxsiyyətinin inkişafının yaş, cins və s. xüsusiyyətləri ilə bağlı araşdırılması psixologiya elmi üçün çox aktual məsələlərdəndir. Xüsusilə, yeniyetməlik yaş dövründə onlarda baş verın emosional dəyişikliklər qaçınılmaz olduğunu nəzərə alaraq yeniyetmələrin psixoloji vəziyyətini araşdırmaq, onlarda baş qaldıran zorakılıq, aqressiya hallarının qarşısının alınması ilə bağlı tədbirlər görmək çox vacib məsələlərdən biridir.

**Problemin yeniliyi**. Məqalədə yeniyetmə şəxsiyyətinin inkişafı, yeniyetməlik dövründə artan aqressiya halları, bu dövrdə aqressiyanın artmasına təsir edən amillərdən bəhs edir. Digər tərəfdən, məqalədə aqressiyanın, zorakılıq və təcavüzkarlıq hallarının qarşısının alınması ilə bağlı fikirləri diqqət mərkəzinə çatdırılır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə irəli sürülən fikirlər gənc tədqiqatçılar, ailələr, ümumtəhsil məktəblərində, ali təhsil, dərs deyən müəllimlər və geniş ictimaiyyət üçün aktual və əhəmiyyətlidir. Həmçinin məqalədən mühazirə materiallarında istifadə etmək üçün uyğundur.

**Ədəbiyyat:**

1. Cepeda, Claudio ve Gotanco, Lucille. Clinical manual for the psychiatric interview of children and adolescents. s.l.: American Psychiatric Publishing, – 2017. – s. 1-53.
2. De Haan AD, Prinzie P, Deković M. Change and reciprocity in adolescent aggressive and rule-breaking behaviors and parental support and dysfunctional discipline. Development and Psychopathology. 2012;24:301–315.
3. Teen aggression and arguments (21 March 2023) https://www.nhs.uk/mental-health/children-and-young-adults/advice-for-parents/teen-aggression-and-arguments/
4. *J Gen Intern Med. (2003 Oct; 18)(10): 864–870. Aggression in Teens: What It* Means and How to Support Them. June 1, 2023 *https://www.newportacademy.com/resources/restoring-families/aggression-in-teens/*

**E-mail:** rnqasimova@gmail.com
**Redaksiyaya daxil olub:** 08.07.2024

*UOT159.9*

***Lalə Sabir qızı Sadıxova***
*Azərbaycan Dillər Universitetinin*
*Psixologiya kafedrasının baş müəllimi*
*https://orcid.org/0009-0006-1976-8628*
*https://doi.org/10.69682/azrt.2024.91(3).150-154*

# MÜDAFİƏ MEXANİZMİ VƏ ONUN NÖVLƏRİNİN PSİXOLOJİ SƏCİYYƏSİ

***Лала Сабир гызы Садыхова***
*старший преподаватель кафедры психологии*
*Азербайджанского Университета Языков*

# ЗАЩИТНЫЙ МЕХАНИЗМ И ПСИХОЛОГИЧЕСКИЕ ХАРАКТЕРИСТИКИ ЕГО ВИДОВ

***Lala Sabir Sadikhova***
*senior lecturer at the department of Psychology of*
*Azerbaijan University of Languages*

# DEFENSE MECHANISM AND PSYCHOLOGICAL CHARACTERISTICS OF ITS TYPES

**Xülasə.** Elmi məqalədə müdafiə mexanizminin psixoloji mahiyyəti, təhlili açıqlanır. Qeyd edilir ki, psixoloji müdafiə psixi sağlamlığın qorunması məqsədilə travmatik həyəcanlara yönəlmiş şəxsiyyətin stabilliyinin xüsusi sistemidir. Elmi məqalədə müdafiə mexanizmlərinin növləri ardıcıllıqla fərqləndirilir. Müntəzəm istifadə edilən müxtəlif müdafiə mexanizmləri eyni olmadığından yaş fərqləri özünü göstərir. Məlum olur ki, oğlan və qızlar müxtəlif müdafiə mexanizmlərindən müxtəlif tezlikdə istifadə edirlər.
***Açar sözlər:*** *psixoloji müdafiə, reqressiya, sublimasiya, təcridetmə, inkaretmə*

**Резюме.** В научной статье описаны психологическая сущность и анализ защитного механизма. Отмечается, что психологическая защита – это особая система устойчивости личности, направленная на травмирующие раздражители с целью защиты психического здоровья. В научной статье последовательно выделяются виды защитных механизмов. Возрастные различия проявляются потому, что различные регулярно используемые защитные механизмы не одинаковы. Оказывается, мальчики и девочки используют разные защитные механизмы с разной частотой.
***Ключевые слова:*** *психологическая защита, регрессия, сублимация, изоляция, отрицание*

**Summary.** The scientific article describes the psychological essence and analysis of the defense mechanism. It is noted that psychological defense is a special system of personal stability aimed at traumatic stimuli in order to protect mental health. The scientific article consistently identifies the types of defense mechanisms. Age differences occur because the various defense mechanisms used regularly are not the same. It turns out that boys and girls use different defense mechanisms with different frequencies.
***Keywords:*** *psychological defense, regression, sublimation, isolation, denial*

Müasir dövrdə uşaq psixologiyasında psixoloji müdafiə aktual problemdir. Sual oluna bilər ki, nə üçün tez-tez psixoloji müdafiəni müzakirə edirlər, lakin onu öyrənmirlər. Əsas diqqət valideynlərlə uşaqlar arasındakı münasibətlərdə psixoloji müdafiə mexanizmlərinin formalaşmasına verilir. Lakin burada uşağın konkret psixi təzahürləri də tam araşdırılmayıb. Bundan əlavə, uşaqların tez-tez böhranlı inkişaf mərhələlərində rastlaşdıqları maneələrin, digər tərəfdən psixoloji müdafiənin öyrənilməsindəki çətinliklərin, psixi hadisənin qanunauyğunluqlarının araşdırılmasına böyük ehtiyac vardır.

Psixoloji müdafiə nədir? Psixoloji müdafiə psixi sağlamlığın qorunması məqsədilə travmatik həyəcanlara yönəlmiş şəxsiyyətin stabilli-

yinin xüsusi sistemidir. Həyat prosesində insan dəyişir, yəni o, öz baxışlarında, mənəvi dəyərlərində, təsəvvürlərində dəyişikliklər edir. Bəzən o, insan üçün gözlənilməz olur, bəzən də ondan ciddi iş tələb edir. Belə dəyişikliklər adətən insan tərəfindən dərk edilir. Bəzən elə hallar baş verir ki, insan qeyri-ixtiyari olaraq yeni təcrübədən imtina edir. Bunlar şüursuz requlyativ psixoloji mexanizmlərin hesabına həyata keçir. Belə psixoloji mexanizmlərin hərəkəti bəzən dərketmə, bəzən də insanın iradəsi ilə baş verir. Həmin mexanizmlər psixikanı qoruyur və onu ağır yükdən müdafiə edir. Ona görə də onlar psixoloji müdafiə mexanizmləri adını almışlar.

Müasir psixoanalitiklərdən olan Brener psixoloji mexanizmi təfəkkürün müvafiq aspekti kimi səciyyələndirir. O "Mən"(Eqo) və "O"(İd) arasındakı qarşılıqlı təsiri əks etdirir. Konfliktli situasiyaların xüsusiyyətlərindən asılı olaraq "Mən" müdafiə mexanizminin maraqlarının qənaətbəxş olması üçün onları müdafiə kimi qəbul etmək olar. Alim tədqiqatçı Brenerin fikri ilə razılaşaraq qeyd edə bilərik ki, müdafiə məqsədlərində "Mən" istənilən yönəlişlikdən, qavrayışdan, diqqətin yayınıqlığından, davranışa qıcıqlandırıcıların müdaxiləsindən istifadə edir.

Hal-hazırda psixoloji müdafiə anlayışı artıq uzun müddətdir ki, psixoanaliz çərçivəsindən kənar çıxmış və psixologiyada psixoterapiyanın istənilən istiqamətlərində əhəmiyyətli məna kəsb etmişdir [4].

Psixoloji ədəbiyyatda psixoloji müdafiəni iki kateqoriyaya ayırırlar: birinci qrupda ona müvafiq psixi hadisənin mahiyyətinin əksi kimi diqqət yetirilir və aktivlik forması kimi baxılır. İkinci qrupda psixoloji müdafiə mexanizmlərinin məzmunu koqnitiv nəzəriyyələr terminində əks olunur ki, onu informasiyaların xüsusi işlənilməsində nəzərdən keçirirlər. Psixoloji müdafiə fenomenini təhlil edərkən həmin anlayışa aid olanları aşağıdakı şəkildə fərqləndirdik:

- psixoloji müdafiə psixikanın xassələrinin sistemi kimi ( İ.D. Stoykov);
- psixoloji müdafiə şəxsiyyətin xassəsi kimi (A. Freyd, V.A. Taşlıkov);
- psixoloji müdafiə mexanizmləri və ya psixoloji müdafiənin reallaşmasının konkret üsulu kimi (K. Perri, E.S. Romanova);
- müdafiə hərəkətləri psixoloji müdafiə prosesinin xarici davranış xarakteristikası kimi (R.M. Qranovskaya);
- müdafiə strategiyası və taktikası müdafiə üsulları və hərəkətlərinin davamlı sistemi kimi (E.T. Sokolova).

Müəlliflərin əksəriyyəti müdafiə mexanizmlərinin bir sıra növlərini aşağıdakı kimi fərqləndirmişlər:

* *İnkaretmə* - travmatik hadisələri və ya xaricdən gələn təhlükəni aradan qaldırmaqdır.
* *Əvəzetmə* - "İd"in bir obyektdən digərinə impulslarının keçirilməsi və ya bir təhlükədən digərinə keçməkdir.
* *İntroyeksiya* - ətrafdakı obyektlərin bəzi keyfiyyət və xassələrini öz tərkibinə daxil etməkdir.
* *Rasionalizasiya* - davranışın daha aydın olması üçün onun yenidən təşkilidir.
* *Reaktiv təhsil* - bir impulsun dəyişdirilməsidir. Yəni "İd"in başqasına-birinciyə zidd dəyişməsidir.
* *Reqressiya* - psixi həyatın müəyyən mərhələsində daha təhlükəsiz görünən əvvəlkilərə qayıdışdır.
* *Sublimasiya* - "İd"in bəzi impulslarının cərəyanın instinktlərə keçirilməsi vasitəsilə məqsədin dəyişməsi və əvəz edilməsidir.
* *Sıxışdırılıb çıxarılma* - elə mexanizmdir ki, subyekt onu dərk etmədən meyllərlə bağlı təəssüratlarını saxlamağa və ya yenidən bərpa etməyə cəhd göstərir.
* *Təcridetmə* - subyektin öz fikir və hərəkətlərindən təcrid edilməsi, başqalarının fikirləri ilə onların əlaqəsinin pozulmasıdır.
* *Təcavüzlü identifikasiya* - A. Freyd tərəfindən qeydə alınmış müdafiə mexanizmidir. Xarici təhlükə ilə rastlaşarkən subyekt təcavüzkarın özünü - eyniləşdirməsinə meyllənir və nəticədə özü də aqressiv olur.
* *Kompensasiya* - müdafiə mexanizmidir ki, "Eqo" təhlükədən müdafiə olunmaq məqsədi ilə əlavə cəhd göstərərək qeyri-müdafiə hisslərini həyata keçirməli olur.
* *Keçirilmə* - müdafiə mexanizmi olub emosional əhəmiyyətli bir ideyanın başqasının ideyasına keçirilməsidir.
* *Konversiya* - fiziki təzahürdə impulsların sıxışdırılaraq bir haldan başqasına keçirilməsidir [4].

Yuxarıda deyilənlərlə yanaşı, onu da qeyd etmək lazımdır ki, insan özünün əsas funksiyalarını yerinə yetirərkən bir çox reallıqları nəzərə çarpacaq dərəcədə dəyişdirir. Bu qəbildən olan mexanizmləri "yetkinləşməmiş müdafiə mexanizmləri" adlandırırlar. Psixoloji müdafiə psixi sağlamlığın qorunması məqsədilə travmatik həyəcanlara yönəlmiş şəxsiyyətin stabilliyinin xüsusi sistemidir. Psixoloji müdafiə xüsusi tənzimedici sistem kimi özünü göstərir.

**Şəkil 1-də** müdafiə mexanizmlərinin növləri öz əksini tapmışdır:




**Şəkil 1. Müdafiə mexanizmlərinin növləri**

Müdafiə mexanizmlərinin aşağıdakı növlərini nəzərdən keçirək:

* ***İnkaretmə*** – hər hansı bir situasiyanı və ya hər hansı bir hərəkəti qəbul etməkdən imtinadır. Müdafiə həyəcanlı informasiyaları nəzərə almadan onlardan uzaqlaşmaqda təzahür edir. Müdafiə həm də arzu olunmayan informasiyaları yaxına buraxmayan maneə kimi özünü göstərir. İnkaretmənin sadə forması isə görməmək, eşitməməkdir. Xoş olmayan hadisələrdən qaçmaq mümkün deyil. Lakin insan onu həyəcanlandıran fikirlərdən uzaqlaşmağa həmişə cəhd göstərmişdir. İnkaretmənin bu forması 2 yaşında aktiv nitqin formalaşması ilə bir vaxtda baş verir. Bu mənada kiçik yaşlı uşaqların yalançılığı təmiz halda müdafiə reaksiyalarına malik olur. İnkaretmə müdafiə mexanizmi olub xarici təhlükələrin və ya travmatik hadisələrin inkarını ifadə edir. İnkaretmə müdafiə mexanizmi olmaqla yanaşı, həm də psixi əməliyyat kimi insana xoş olmayanları və ya affektləri, mənasız fikirlərin məzmununu şüurdan uzaqlaşdırmağa yönəldir. Bu mexanizm bütün yaş mərhələlərində əhəmiyyətliliyin səviyyəsinə görə liderdir. Baxmayaraq ki, 6 yaşda onun səviyyəsi aşağı enir. 6 yaşda adları çəkilən müdafiə mexanizmlərinin yüksək səviyyəsi affektiv problemlərin, soyuqluğun, somatik şikayətlərin artması ilə diqqəti cəlb etmişdir. Onu da qeyd etmək lazımdır ki, həmin müdafiə mexanizmlərinin aşağı səviyyəsi özünümüdafiənin fiksasiyası ilə bağlı olmuşdur. Həmçinin susdurulma və inkaretmə müdafiə mexanizmlərinin zəif inkişafı 6 yaşda uşağın ətrafdakıların reaksiyalarına yönəlməsi ilə bağlı olmuşdur.

* ***Susdurulma*** – müdafiə mexanizmi olub unutmada arzu olunmayan informasiyaların bloklaşdırılmasında təzahür edir. Belə vəziyyətdə informasiya psixikanın məzmununu ifadə edir. Susdurulmanın xüsusiyyəti ondan ibarətdir ki, zəruri informasiyaların məzmunu yaddan çıxır, lakin onun emosional, hərəki (sifətin əzələ hərəkətləri, poza), vegetativ (mədənin qıcqırması, çox tərləmə, qızarma) və psixosomatik təzahürlər hərəkət və vəziyyətlərdə, atalar sözlərində qorunub saxlanıla bilər.

Susdurulma maneəsi müdafiəsində: "yaxşı olar ki, it barədə danışmayaq, axı anam məni danlayacaq" -deyə oğlan tez-tez arzu olunmayan həyəcanlarını aradan qaldırmalı olur. Bununla da, oğlan özünün inamsızlığını gələcəyə-"oğluna" ötürür. Özünün anası ilə şüursuz olaraq identifikasiyasında oğlan valideynlərinin davranışını kortəbii şəkildə təqlid edir ("it almayacağam", "pulum çatmır"). Mühüm problemlərin həllində rəngarəng stereotiplər tədqiq edilir ki, bu zaman uşağın qarşısında bir çıxış yolu – uğursuzluq dayanır. Yaşlılar uşaqları təhrik

edirlər ki, onlar üçün əhəmiyyətli olanları unutsunlar. Elə əşyalar və hadisələr var ki, onlar haqqında nəinki danışmaq lazımdır, həm də onlar haqqında düşünmək belə uşaqlara qadağan edilir. Əgər insan iradi cəhdlə həyəcanlarını unutmaq istəyirsə, o zaman onun yaddaşında həll olunan və həll olunmayanların bölgüsü həyata keçirilir. Hər şeydən əvvəl qorxu həyəcanları, şəxsi zəiflik, valideynlərin arzusunun əksinə olaraq aqressivlik halları yatırılır.

*** *Təcridetmə*** fundamental müdafiə mexanizmi olub qeyri-münasib hiss və impulsların aktiv şəkildə "şüursuzluq sahəsinə qovulması" deməkdir. Bu müdafiə mexanizmi də həyəcan formasıdır. Təcridetmə mexanizmi ilə yaddaş səhvləri bilavasitə əlaqədardır. Məsələn, çox vacib, lakin xoşagəlməz bir görüşün vaxtı unudulur. Təcridetməyə simvolik davranışı misal göstərmək olar. Onu da qeyd etmək vacibdir ki, təcridedilmiş material həqiqətən yaddaşdan silinir. Uşaqlar üçün təcridetmə ölüm qorxusudur. Belə halda uşaq şüurunda onu yadda saxlayır ki, o, həqiqətən qorxur, çünki qorxu var. Eləcə də qorxunun səbəbi maskalanmış olur. Məsələn, uşaqda ölüm qorxusu əvəzinə "ayıdan", "canavardan" qorxmaq hissi təzahür edir.

Z. Freydin fikrincə, təcridetmənin səbəbi xatirələrlə bağlı olan qeyri-məmnunluqdan qaçmağa cəhddir. Şüursuz təcridetmə ilə bağlı hadisələr emosional enerji ehtiyatını saxlayır və insanlar həmişə bu çətinlikdən çıxmaq imkanını axtarırlar. Onları şüursuz olaraq saxlamaq fasiləsiz enerji sərfi tələb edir. Təcridetmə şüura daxil olmağa cəhd etdikdə subyektiv olaraq o, nigarançılıq və təhlükə ilə, həmçinin səbəbsiz qorxu ilə hiss edilir. Həyəcanlılığın bu cür artması və ümumi emosionallıq insanın təfəkkürünü, məntiqini dəyişdirməyə təhrik edir. Təcridetmənin hərəkəti nəticəsində xüsusi məntiq - "qara-ağ" formalaşır.

Təcridetmə həm tamlıqda, həm də hissə-hissə həyata keçirilir. Tam olmayan təcridetmədə təəssüratların səbəbi kimi insanın həqiqi motiv və münasibətləri qorunub saxlanılır. Belə münasibət maskalanmış formada təhlükənin qeyri-motivli hissi kimi bəzən somatik hadisələrlə müşayiət olunaraq şüurda həyata keçirilir.

*** *Proyeksiya*-** psixoloji müdafiə mexanizmi olub özünün hiss, arzu və meyllərini qeyri-şüuru olaraq başqalarına ötürmədir. Onun əsasında qeyri-şüuru olaraq özünün təəssüratlarının, yönəlişliyinin, şübhələrinin qəbul edilməməsi dayanır. Z. Freydin fikrincə, proyeksiya başqa adamlara aid etmədir ki, bu zaman insan nisbətən az əziyyət çəkir. Erkən uşaqlıq yaş dövründə proyeksiyanın tez-tez şüursuz müdafiə mexanizmi kimi özünü göstərməsi halları aşkar olunmuşdur. Məsələn, tənbəl olan uşaq sistematik olaraq dərslərini oxumur, həmişə "2" qiymət alır. Təsdiq edir ki, müəllim həmişə ona yersiz irad tutur, valideynləri isə ona ev tapşırıqlarını yerinə yetirməkdə kömək etmirlər.

Buna oxşar başqa bir misal gətirə bilərik. Məsələn, 4 yaşlı qız atasını az-az gördüyü üçün ona qəzəblənir (qızın valideynləri ayrılıb). Atası onunla oynamağa gələndə o, qəfildən atasına deyir: "Sən çox pissən". Burada uşağın emosional vəziyyətinin reaksiyası baş verir, qız qeyri-şüuru olaraq öz qəzəbini atasına ötürür. Nəticədə qızın şəxsi reaksiyalarının reallaşmasında "mən"in sərhədləri dəyişdirilir, qızın daxilində yalnız müsbət şəxsi keyfiyyətlər qorunub saxlanılır.

***İdentifikasiya* -** psixoloji müdafiə mexanizmlərindən biridir. İdentifikasiya qeyri-şüuri olaraq başqalarına özünün hiss və istəklərini ötürməsidir. İdentifikasiya o proseslə bağlıdır ki, insan başqasına öz "Mən"ini daxil etməklə onun fikirlərini, hisslərini, hərəkətlərini, davranışını özü üçün götürür. Bu da ona təhlükə hissini aradan qaldırmağa, öz "Mən"ini dəyişdirməyə imkan verir. Məsələn, "səndə sehirli çubuq olsa idi, özün üçün hansı oyuncağı seçərdin?" sualına oğlan: "transformer oyuncağını seçərdim" cavabını verir.

Transformer oyuncağını seçməklə oğlan özünün zəifliyindən qeyri-şüuri təhlükəni sınaqdan keçirir, elə bu tərzdə öz gücünü müəyyən edir. Adətən identifikasiya uşaqların rollu oyunlarında tez-tez təzahür edir. Uşaqlar "Uşaq bağçası", "Məktəb", "Xəstəxana" kimi yaradıcı oyunlar oynayaraq müxtəlif rollarda hərəkətləri həyata keçirirlər. Özünüdərk mexanizmi kimi identifikasiya uşağın qabiliyyətlərini yüksəldir, onda məmnunluq hissini artırır. Uşaqlar kimi daha çox sevirlərsə, kimi daha çox dəyərləndirirlərsə onlarla özlərini identifikasiya edirlər.

***Reqressiya* -** psixoloji müdafiə mexanizmlərindən biridir. Bu müdafiə mexanizmi şəxsiyyətin psixi inkişafı mərhələsində hiss və hərəkətlərin hesabına davranışın şüurlu olmasına yönəldilməsidir. Burada hisslər məmnunluq kimi təəssüratlarla bağlıdır. Məsələn, ailədə

ikinci uşağın doğulması nəticəsində böyük uşaq kiçiklər kimi ərköyünlük və şıltaqlıq edir. Şüursuz olaraq o, belə zənn edir ki, böyüklər körpəni məhz bu hərəkətlərə görə sevirlər, o da bu üsulla həmin nəticəyə nail olmaq istəyir.

Psixoloji təhlil göstərir ki, uşaqlar eyni vaxtda psixoloji müdafiənin bir çox növlərindən istifadə edirlər. İnkaretmə, reqressiya, susdurulma və identifikasiya böyük məktəbəqədər yaşlılar üçün xarakterik haldır. Bəzi müdafiə mexanizmlərini uşaqlar özləri mənimsəyir, bəzilərinə isə böyüklərin davranışını müşahidə etməklə nail olurlar. Müdafiə mexanizmlərinin fərdi dəsti konkret həyati şəraitdən asılıdır ki, uşaq ailədə və bağçada böyüklərin davranışında müdafiə nümunələri ilə toqquşurlar. Uşaqlarda psixoloji müdafiə mexanizmlərindən müntəzəm olaraq istifadə nəticəsində insanda xarakterin müəyyən cəhətləri də formalaşır.

*** *Reaktiv təhsil*** müdafiə mexanizmi olub bir psixi impulsun başqasına dəyişməsilə əlaqədardır. Özünün inkişaf səviyyəsinə görə reaktiv təhsil müdafiə mexanizmi 4 yaşdan başlayaraq 6 yaş mərhələsinədək ən axırıncı yerlərdən birini tutur. Bu yaş dövrünün uşaqları ondan müntəzəm istifadə edirlər. 4 yaşlı uşaqlara inkişafın ən kiçik səviyyəsi uyğundur. Tədricən 5-6 yaşlarında reaktiv təhsil mexanizmi inkişaf edir və həmin mexanizmdən uşaqlar müntəzəm istifadə edirlər. Qeyd etmək lazımdır ki, oğlanlarla müqayisədə qızlarda həmin mexanizm yüksək dərəcəsi ilə fərqlənir, həmin mexanizmdən müntəzəm istifadə olunur. İnkişaf dinamikasına gəldikdə onu deyə bilərik ki, əgər yaş artdıqca oğlanlarda ondan istifadə halları artırsa, o zaman qızlarda ondan istifadə halları 5 yaşında daha da yüksəlir.

*** *Simvollaşma* -** müdafiə mexanizmi olub bu və ya digər prosesdə hərəkətlərin, ideyaların, hisslərin müəyyən simvol və məntiqi izahla qeydə alınmasıdır. Simvollaşma prosesində davranış, ideya və hisslərin məntiqi izahatda qeydə alınır. Bu müdafiə mexanizminin əhəmiyyətliliyi orta səviyyədə bütün yaş mərhələlərində özünü göstərir. 6 yaşda o bir qədər də artır. Bu müdafiə mexanizminin çox böyük dərəcəsi qızlara məxsusdur. Simvolilaşma müdafiə mexanizmləri ikincili perseptiv obrazlardan istifadə etməyi tələb edir. Qızlarda bu müdafiə mexanizmindən istifadədə inkişaf dinamikasının bir qədər yüksək olması qeydə alınmışdır. Simvolilaşma müdafiə mexanizmi sosial adaptasiya prosesinə təsir edir və yetişkənlik prosesində dəyişir. 5 yaşlı uşağın davranışı frustrasiya situasiyasında bu müdafiə mexanizmi ilə əlaqədardır [5].

Tədqiqatın gedişində biz belə bir nəticəyə gəldik ki, müntəzəm istifadə edilən müxtəlif müdafiə mexanizmləri eyni deyildir. Psixoloji müdafiə mexanizmlərinin istifadəsində mövcud olan yaş fərqləri bir daha onu təsdiq edir ki, inkişaf parametrləri istənilən psixi təhsilin formalaşmasında əks etdirilir. Həmçinin oğlan və qızlar müxtəlif müdafiə mexanizmlərindən müxtəlif tezlikdə istifadə edirlər.

**Problemin aktuallığı.** Bütün insanlar sağlam və ya xəstə olmalarından asılı olmayaraq onları narahat edən hisslərdən və xatirələrdən azad olmaq məqsədi ilə müdafiə mexanizmlərindən istifadə etmək məcburiyyətindədirlər. Müdafiə mexanizmləri bizim şüurumuzdan asılı olmadan həyata keçirilir, təşvişi aradan götürməyə xidmət edir, psixikanın normal fəaliyyətini təmin edir.

**Problemin elmi yeniliyi.** Psixoloji müdafiə xüsusi tənzimedici sistem kimi adekvat formalarda ifadə olunduğundan yenilik kimi dəyərləndirilməlidir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən ali və orta ixtisas məktəblərinin müəllimləri, tələbələr, magistrantlar və doktorantlar istifadə edə bilərlər.

**Ədəbiyyat:**

1. Арестова, О.Н. Индивидуальные особенности функционирования защит- ных механизмов // Вестник МГУ. Сер. 14. Психология. 2014. № 1. -С. 20-29.
2. Райгородский Д. (ред.-сост.) «Самосознание и защитные механизмы личности». - Самара: БАХРАХ-М, -2016.
3. Соловьева, А. В. Психологическая защита в подростковом возрасте / А. В. Соловьева. — М.: Флинта, 2013.
4. Фрейд, А. Эго и механизмы психологической защиты / А. Фрейд. - СПб.: АСТ, 2012. -160 с.
5. Фрейд, А. Защитные механизмы // Самосознание и защитные механизмы личности. Хрестоматия. - Самара: Издательский дом «БАХРАХ-М», -2013. -С. 339-347.

**E-mail:** lala.sadixova31@inbox.ru
**Redaksiyaya daxil olub:** 01.07.2024

*UOT 159.9*

***Günel İlqar qızı Məmmədova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Pedaqoji psixologiya kafedrasının müəllimi*
*https://orcid.org/0009-0006-5941-7611*
*https://doi.org/10.69682/azrt.2024.91(3).155-158*

# BÖYÜK MƏKTƏB YAŞLI UŞAQLARIN ÖZÜNƏMÜNASİBƏTİNİN PSİXOLOJİ XÜSUSİYYƏTLƏRİ

***Гюнель Ильгар гызы Мамедова***
*преподаватель кафедры Педагогической психологии*
*Азербайджанского Государственного*
*Педагогического Университета*

# ПСИХОЛОГИЧЕСКИЕ ОСОБЕННОСТИ САМООТНОШЕНИЯ ДЕТЕЙ СТАРШЕГО ШКОЛЬНОГО ВОЗРАСТА

***Gunel Ilgar Mammadova***
*lecturer at the department of Educational psychology of*
*Azerbaijan State Pedagogical University*

# PSYCHOLOGICAL CHARACTERISTICS OF SELF-ATTITUDE IN HIGH SCHOOL AGE CHILDREN

**Xülasə.** Elmi məqalədə böyük məktəb yaşlı uşaqların özünəmünasibətinin psixoloji xüsusiyyətləri ardıcıllıqla araşdırılmışdır. Məqalədə qeyd edilir ki, özünəmünasibət Mən konsepsiyasının əsas tərkib hissəsidir və müsbət mənada birləşən özünəhörmət, özünüqiymətləndirmə, özünüqəbuletmə, özünəinam, özünədəyər, refleksiya və autosimpatiyanın formalaşmasının əsasını təşkil edir. Məqalədə böyük məktəb yaşlı uşaqlarda özünəmünasibəti formalaşdıran tövsiyələr əksini tapmışdır.
***Açar sözlər:*** *özünəmünasibət, özünəhörmət, özünüqiymətləndirmə, refleksiya, özünüinkişaf*

**Резюме.** В научной статье последовательно рассмотрены психологические особенности самоотношения детей старшего школьного возраста. В статье отмечается, что самоотношение является основным компонентом Я-концепции и составляет основу формирования самоуважения, самооценивания, самопринятия, уверенности в себе, рефлексии. В статье отражены рекомендации, формирующие самоотношение у детей старшего школьного возраста.
***Ключевые слова:*** *самоотношение, самоуважение, самооценивание, рефлексия, саморазвитие*

**Summary.** The scientific article consistently examines the psychological characteristics of the self-attitude of children of senior school age. The article notes that self-attitude is the main component of the self-concept and forms the basis for the formation of self-respect, self-esteem, self-acceptance, self-confidence, self-esteem, reflection and self-esteem,sympathy, which are combined in a positive sense. The article reflects recommendations that shape self-attitude in children of senior school age.
***Keywords:*** *self-attitude, self-esteem, self-evaluation, reflection, self-development*

Özünəmünasibət problemi və onun şəxsiyyətin strukturunda rolu hazırda psixologiya elmi üçün son dərəcə aktualdır. Özünəmünasibət insan davranışının demək olar ki, bütün aspektlərinə tənzimləyici təsir göstərir, şəxsiyyətlərarası münasibətlərin qurulmasında, məqsədlərin müəyyən edilməsində və əldə olunmasında, həmçinin böhran vəziyyətlərinin formalaşdırılması və həlli yollarında həlledici rol oynayır ki, bu da bizə onu böyük yaşlı məktəblilərin əsas

amili hesab etməyə əsas verir. Psixoloqlar haqlı olaraq şəxsiyyətin inkişafını və özünüinkişafı özünüdərketmənin inkişafı ilə əlaqələndirirlər.

Mən konsepsiyasının tərkib hissəsi kimi özünəmünasibət şəxsiyyətin inkişafının əsasını təşkil edir və özünəhörmət, autosimpatiya və özünüalçaltma kimi anlayışlarla müəyyən edilir. Özünəmünasibətin struktur və məzmun xüsusiyyətlərinin öyrənilməsinə həsr olunmuş kifayət qədər sayda işlərə baxmayaraq özünəmünasibətin inkişaf mexanizmlərinə hələ də kifayət qədər diqqət yetirilmir. Hal-hazırda müxtəlif təhsil mühitlərində özünəmünasibətin inkişafı mexanizmlərinin işləməsi haqqında nəticə çıxarmağa imkan verən empirik məlumatların çatışmazlığı müşahidə olunur.

Hazırda təhsil və tərbiyə prosesinin humanistləşdirilməsi şəraitində özünəmünasibət, onun şəxsiyyətin inkişafında rolu psixologiya elminin və praktikasının aktual problemlərindən birinə çevrilir. Ancaq real həyatda gənclər nadir hallarda özünüinkişafetdirmə ehtiyacını dərk edirlər.

Özünəmünasibət fərdin emosional məhsuludur, tamamilə onun subyektinə aid olsa da onun erkən uşaqlıqda formalaşması valideynlərin, müəllimlərin və həmyaşıdların xarici qiymətləndirmələrindən ayrılmazdır. Özünüdərketmənin inkişafı psixoloji bir fenomen kimi özünəmünasibətdən, bu və ya digər dərəcədə əksəlaqədən asılıdır. Özünəmünasibətin emosional-dəyər sisteminin əsasını əhəmiyyətli insanlarla, ilk növbədə valideynlərlə emosional münasibətlərin həyat təcrübəsi təşkil edir. Bu qiymətləndirmə deyil, daha çox özünəmünasibət tərzi, şəxsiyyətin formalaşması prosesində formalaşan ümumi həyati münasibətidir. Bu sistem "Mən-Mən"in müqayisəsi çərçivəsində qiymətləndirmənin subyektdaxili səviyyəsində formalaşır və şəxsi keyfiyyətlərin qiymətləndirilməsində özünə qarşı qoyduğu tələblərə uyğunluq dərəcəsini əks etdirir. Belə olan halda özünüqiymətləndirmə "bəyəndim və ya bəyənmədim" prinsipinə uyğun olaraq həyata keçirilir və "mən yaxşıyam" "mən özümdən daha yaxşıyam" ilə eynilik təşkil edir. Emosional özünəmünasibətin mahiyyət etibarilə fərddən kənar qiymətləndirici əsasları yoxdur.

Şəxsiyyətin normal fəaliyyətində özünəmünasibətin aparıcı rolunu qeyd edən psixoloqlardan: L.S. Vıqotskiy, İ.S. Con, S.R. Pantileyev, A.M. Prixojan və başqalarının fikrincə, özünəmünasibət orta məktəb şagirdinin özünüdərketmə strukturunun aparıcı komponentidir. Bu onun şüurunda yeni psixoloji formalaşmaların - özünə, başqalarına və cəmiyyətə əks olunmasının inkişafını müəyyən edir.

Pedaqoji-psixoloji ədəbiyyatın nəzəri təhlili göstərdi ki, yerli və xarici psixologiyada özünəmünasibət daha çox özünüdərketmənin emosional komponenti kimi qəbul edilir ki, bu da bir tərəfdən özünüdərkə əsaslanır, digər tərəfdən isə özünütənzimləmə, özünüaktuallaşdırma və özünüinkişafetdirmənin formalaşması üçün əsas ilkin şərtlərdəndir.

Emosional-dəyərli özünəmünasibət insanın özünün başqaları ilə qarşılıqlı əlaqəsi nəticəsində yaranır. İddia olunur ki, özünüinkişafın şərtlərindən biri müxtəlif əksetdirmə növlərinin stimullaşdırılması, özünəhörmət, özünüqiymətləndirmə, özünüqəbuletmə, fəaliyyətinin subyekti kimi özünə inamın formalaşmasına kömək etməkdir.

Özünəmünasibət *"Mən"* konsepsiyasının əsas tərkib hissəsidir və müsbət mənada birləşən özünəhörmət, özünüqiymətləndirmə, özünüqəbuletmə, özünəinam, özünədəyər, refleksiya və autosimpatiyanın formalaşmasının əsasını təşkil edir. Adekvat formalaşmış özünəmünasibət böyük yaşlı məktəblilərin subyektivliyinin formalaşmasında mühüm məqamlardan biridir ki, bu da onların həyatda özlərini uğurlu özünüdərk etmələrinə səbəb olur. Özünəmünasibət dinamik formalaşmadır, özünüdərk anından davamlı olaraq formalaşır və inkişaf edir. Şəxsiyyətin mülkiyyəti kimi özünəmünasibət onun həyat və fəaliyyətinin məqsədləri, dəyəryönləri ilə sıx bağlıdır və onun birliyinin formalaşmasında və sabitləşməsində ən mühüm amildir. Sabit şəxsiyyət xüsusiyyəti olmaqla özünəmünasibət digər şəxsiyyət xüsusiyyətləri, xüsusən də iradə ilə sıx bağlıdır. O, fərdin psixoloji xüsusiyyətlərinin bütöv bir sisteminin məzmununun, strukturunun və təzahür formalarının inkişafına təsir göstərir.

Özünəmünasibət şəxsiyyətin vacib və ayrılmaz elementidir. Bu, onun özü haqqında bildiyi və ya kəşf etdiyi şeylərə münasibətinin əksini təmsil edir. Özünəmünasibət insan davranışına, uyğunlaşma metoduna, ünsiyyətə təsir göstərir ki, bu da bu fenomenin öyrənilməsini,

xüsusən də böyük məktəb yaşının öyrənilməsini xüsusilə aktual edir. Böyük məktəb yaş dövründə özünəmünasibət özünüdərketmənin fəal inkişafı onun əks olunması ilə xarakterizə olunur. Özünəmünasibət yetkin bir şəxsiyyətdə özünün dəyər ehtiyacı sahəsinin strukturunu bilməklə formalaşır və düzəldilir. Bundan əlavə, böyük məktəb yaşı dövründə "xarici" rəy özünəmünasibəti düzəltmək üçün ən əhəmiyyətlidir; Özünəmünasibəti düzəltmək üçün ən uğurlu olan gənclik yaş dövründə adekvat və vahid “Mən” konsepsiyanın formalaşması həm ətrafdakı insanların, həm də həmyaşıdların münasibətindən çox asılıdır. Məktəblinin həmyaşıdları qrupunda olması, orada tanınması və qəbul edilməsi çox vacibdir [7].

Böyük yaşlı məktəblilər öz şəxsiyyətinin istədiyi imicini yaratmağa meyllidir, müəyyən bir standarta yaxınlaşmaq üçün qarşısına müxtəlif məqsədlər qoyur və eyni zamanda özünü həmyaşıdları ilə fəal şəkildə müqayisə edir ki, bunlar özünəhörmətə, özünüqiymətləndirməyə, özünüqəbul etməyə, özünəinama təsir göstərir, eləcə də o, məktəbli şəxsiyyətində özünəmünasibət komponentlərinin bir qütbdən digərinə dəyişməsinə səbəb olur. Bu zaman onun haqqında ətrafdakıların rəyi mühüm əhəmiyyət kəsb edir. Bu yaş dövrü bədənin bütün psixofizioloji sistemlərinin yenidən qurulması, aparıcı fəaliyyətlərdəki dəyişikliklər və inkişafın sosial vəziyyəti baxımından keçid və kritikdir [3]. Bu yaş dövründə özünəmünasibət şagirdin özünüdərkinin mərkəzi formalaşmasıdır, onun yaşla bağlı xüsusiyyətlərini, ümumi sosial uyğunlaşmasını təyin edir, davranış və fəaliyyətinin tənzimləyicisidir. Bir sözlə, özünəmünasibət xarakterin strukturunu tamamlayır, onun bütövlüyünü təmin edir, özünü- tənzimləmə və özünüidarəetmə funksiyasını yerinə yetirir, fərdin daxili birliyinin formalaşmasına kömək edir.

Psixoloq İ.S. Kon özünəmünasibəti “Mən obrazı” sistemində xüsusi münasibətin emosional komponenti, insanın özünə qarşı münasibətində (təsdiq/təsdiqləmə) ifadə olunan şəxsi dəyər mühakiməsi kimi müəyyən edir. Yəni fərd özünü nə dərəcədə bacarıqlı, əhəmiyyətli, uğurlu və layiqli hesab edir [2]. Fərdin yüksək səviyyədə özünəmünasibəti onun fəaliyyətdə ən böyük fəallığı və məhsuldarlığı, yaradıcılıq imkanlarının reallaşması üçün şərt rolunu oynayır, hisslərinin ifadə azadlığına, ünsiyyətdə özünüifadə səviyyəsinə təsir göstərir. Hər bir subyektin özünəmünasibəti müəyyən keyfiyyət spesifikliyinə malikdir. Bu spesifiklik özünəmünasibətin emosional tonunda və semantik məzmununda ifadə olunur. Bəzi fərdlər üçün qlobal özünəmünasibət ilk növbədə, özünəhörmət şəklində yaşana bilər, bəziləri üçün isə simpatiya və ya özünüsevmə şəklində özünü göstərə bilər. Özünəmünasibət müəyyən emosional ölçülər siyahısına uyğun olaraq emosional təzahürlərin məcmusu kimi qurulmur, əksinə müəyyən semantik rəng və ya emosional tonla bu və ya digər xüsusi formada (modallıqda) təcəssüm olunur. Müasir psixologiyada özünəmünasibət anlayışı “Mən”in şəxsi mənasının şüurunda birbaşa təmsili kimi qəbul edilir. Burada insanın özünəmünasibəti onun öz keyfiyyətlərini özünüdərketmə motivləri ilə müqayisəsi prosesində yaranan kimi başa düşülür [9].

Böyük yaşlı məktəblinin özünəmünasibətinin psixoloji xüsusiyyətləri onun şəxsiyyətinin inkişafında xüsusilə əhəmiyyətlidir, çünki məhz bu zaman gənc özünü axtarmağa başlayır, çünki adekvat və müsbət özünəmünasibətin formalaşması təkcə şəxsiyyətin inkişafında deyil, həm də onun sosial toxunulmazlığının formalaşmasında mühüm mərhələdir. Böyük məktəb yaşlı uşaqlarda özünəmünasibəti formalaşdırmaq üçün aşağıdakı tövsiyələrə əməl edilməsini məqsədəuyğun hesab edirik:

***1. Valideyn-gənc münasibətlərinin optimallaşdırılması.*** Orta məktəb şagirdinin fərdi psixoloji xüsusiyyətlərinə hörmət, işlərinə və fəaliyyətinə maraq, nailiyyətlərinə inam mühitində olması, eləcə də valideynlər tərəfindən tərbiyəvi təsirlərdə tələbkarlıq və ardıcıllığın gözlənilməsi çox vacibdir.

***2. Orta məktəb şagirdinin fərdi təcrübəsinin genişləndirilməsi və zənginləşdirilməsi.*** Fəaliyyət nə qədər çoxşaxəli, aktiv müstəqil hərəkətlər üçün imkanlar nə qədər çox olarsa, onun qabiliyyətlərini yoxlamaq və özü haqqında təsəvvürlərini genişləndirmək imkanları bir o qədər çox olar.

***3. Təcrübələrinizin və hərəkətlərinizin nəticələrini təhlil etmək bacarığının inkişafı.*** Orta məktəb şagirdində çətinliklərin öhdəsindən gələcəyinə, yaxşı uğurlar qazanacağına və hər

şeyin onun üçün yaxşı nəticə verəcəyinə onlarda inam yaratmaq lazımdır.

***4. Böyük yaşlı məktəblilərdə özünütəsdiqin, özünəinamın yüksəldilməsi və onların inkişafı*** (məsələn, "Mənim özüm haqqında fikirlərimi təkmilləşdirmək hüququm var).

***5.*** Əldə edilmiş nəticələrə əsasən orta məktəb şagirdlərində özünəmünasibətin müsbət təzahürləri ehtimalını artıran məqsədyönlü ***təlimlər sisteminin hazırlanması*** çox vacibdir.

**Problemin aktuallığı.** Elmi məqalədə böyük məktəb yaşlı uşaqların özünəmünasibətinin psixoloji xüsusiyyətlərinin araşdırılmasına zəruri tələbatın olması aşkarlanır.

**Problemin elmi yeniliyi.** Məqalədə özünəmünasibətin psixoloji mahiyyəti açıqlanır, böyük məktəb yaşlı uşaqların özünəmünasibətinin psixoloji xüsusiyyətləri, mərhələləri tədqiq edilir.

**Problemin praktiki əhəmiyyəti və tətbiqi.** Tədqiqatın nəticələrindən praktik psixoloqların, sosial pedaqoqların və məktəb müəllimlərinin fəaliyyətində orta məktəb şagirdləri arasında özünütəhsil işinin təşkilində və özünəmünasibətin formalaşdırılmasında istifadə edilə bilər.

**Ədəbiyyat:**

1. Лидерс, А.Г. Психологический тренинг с подростками: Учебное пособие для студ. высш. учеб. Заведений. / А.Г. Лидерс. -М.: Издательский центр «Академия», -2013. -130 с.
2. Мантикова А.В. Формирование личности в старшем пубертатном возрасте // Наука. Мысль. - 2016. - № 9. - с. 38-42.
3. Мантикова А.В. Динамика самооценки эффективности тренинга коммуникативных навыков старшими подростками как индикатор процесса социально-психологической адаптации. Психология XXI столетия // Сб. по материалам ежегодного Международного Конгресса «Психология XXI столетия» (Ярославль, 13–15 мая 2016) / Под ред. Козлова В.В. – Ярославль, ЯрГУ, МАПН, -2016 – с. 273-277.
4. Чевачина А.В. Самоотношение как значимый компонент развития личности // Менеджмент качества образования в условиях обновляющейся России: сб. науч. ст. - Екатеринбург: Изд-во Урал. гос. экон. ун-та, -2011. – Вып. 5. – С. 320-325.

**E-mail:** gunel1505 @gmail.com
**Redaksiyaya daxil olub:** 24.06.2024

*UOT 159.9*

***Zeynəb Əhməd qızı Həcəmova***
*AMEA-nın Fəlsəfə və Sosiologiya İnstitutunun fəlsəfə doktoru proqramı üzrə dissertantı,*
*AMEA-nın Humanitar elmlər bölməsinin baş mütəxəssisi,*
*https://orcid.org/0000-0001-5886-0984*
*https://doi.org/10.69682/azrt.2024.91(3).159-167*

# KÜTLƏ FENOMENİNİN İDARƏETMƏ QƏRARLARININ QƏBULUNA GÖSTƏRDİYİ TƏSİRİN SOSİAL-PSİXOLOJİ TƏHLİLİ

***Зейнаб Ахмед гызы Хаджамова***
*диссертант по программе доктора философии Института философии и социологии НАНА,*
*старший специалист отделения Гуманитарных наук НАНА*

# СОЦИАЛЬНО-ПСИХОЛОГИЧЕСКИЙ АНАЛИЗ ВЛИЯНИЯ ФЕНОМЕНА ТОЛПЫ НА ПРИНЯТИЕ УПРАВЛЕНЧЕСКИХ РЕШЕНИЙ

***Zeynab Ahmed Hajamova***
*doctoral student of the doctor of philosophy program of the Institute of Philosophy and Sociology of ANSA,*
*senior specialist of the department of Humanities Sciences of ANSA*

# SOCIO-PSYCHOLOGICAL ANALYSIS OF THE INFLUENCE OF THE MASS PHENOMENON ON ADMINISTRATIVE DECISION-MAKING

**Xülasə.** Elmi məqalədə kütlə fenomeninin idarəetmə qərarlarının qəbuluna göstərdiyi təsirin sosial-psixoloji xüsusiyyətləri araşdırılmışdır. İdarəetmə qərarlarının qəbul edilməsi prosesi sistematik olaraq onu əhatə edən bütün fəaliyyət növlərinin müəyyən ardıcıllıqla yerinə yetirilməsini nəzərdə tutur. İdarəetmə obyektiv olaraq informasiyanın toplanmasını, işlənməsini və təhlilini; müvafiq olaraq məqsədin müəyyən edilməsini və qərarın hazırlanmasını; idarəedici əmrin verilməsini və onun icraçılara çatdırılmasını; qərarın həyata keçirilməsini və obyektin dəyişilməsini nəzərdə tutur. Məntiq elmi məntiqi təfəkkürün nizamlı müəyyənləşdirilməsindən ibarət olan düzgün və ardıcıl düşüncə tərzi, o cümlədən təfəkkür olduğundan insanın düşüncə tərzi davamlı zəkanın prinsipləri ilə şərtlənir. İdarəetmədə psixoloji sirayət qərar qəbuluna kütlə psixologiyasının fonunda təsir göstərir. Əsasən şəxsiyyətlərarası münasibətləri əhatə psixoloji sirayət (yoluxma) emosional xarakter daşıdığından qavranılan insanların qabiliyyətindən, emosional vəziyyətindən, diqqət meyillərindən və dəyərlər sistemindən, o cümlədən hadisələrin əhəmiyyətindən asılı olur. Psixoloji yoluxmanın idarəetmədə qərar qəbuluna göstərdiyi kütləvi təsir növbəti struktur üzrə inkişaf edir: *müvafiq informasiyanın kütləyə ötürülməsi → informasiyanın qəbul edilməsi → şüurlu və şüursuz təqlid → fizioloji əks əlaqə → emosional təcrübə* (Zhang, 2014).

***Açar sözlər:*** *idarəetmə; idarəetmə qərarları; məntiqi dərketmə; intuisiya; kütlə fenomeni; psixoloji sirayət; informasiya*

**Резюме.** В научной статье исследованы социально-психологические особенности влияния феномена толпы на принятие управленческих решений. Процесс принятия управленческих решений систематически предполагает выполнение всех видов деятельности, которые его предусматривают, в определенной последовательности. Управление объективно предполагает сбор, обработку и анализ информации, определение цели и подготовку решения, издание управленческого приказа и доставку его исполнителям, реализацию решения и изменение объекта. Наука логика – это правильный и последовательный образ мышления, заключающийся в упорядоченном определении логического мышления, в том числе и мышления, поэтому образ мышления человека определяется принципами непрерывного интеллекта. Психологическое заражение в управлении влияет на принятие решений на фоне психологии толпы. Поскольку психологическое заражение, охватывающее преимущественно

межличностные отношения, носит эмоциональный характер, оно зависит от способностей, эмоционального состояния, склонностей внимания и системы ценностей воспринимаемых людей, в том числе от значимости событий. Массовое воздействие психологического заражения на принятие решений в управлении развивается по следующей структуре: *передача актуальной информации в массы → получение информации → сознательное и бессознательное подражание → физиологическая обратная связь → эмоциональное переживание* (Чжан, 2014).

***Ключевые слова:*** *управление; управленческие решения; логическое понимание; интуиция; массовое явление; психологическое заражение; информация*

**Summary.** In the scientific article were investigated the socio-psychological characteristics of the impact of the crowd phenomenon on management decision-making. The process of making management decisions systematically involves the implementation of all types of activities that involve it in a certain sequence. Management objectively involves the collection, processing and analysis of information, the determination of the goal and the preparation of the decision, the issuing of a management order and its delivery to the executives, the implementation of the decision and the change of the object. The science of logic is the correct and consistent way of thinking, which consists of the orderly determination of logical thinking, including thinking, so the way of thinking of a person is determined by the principles of continuous intelligence. Psychological contagion in management affects decision-making against the background of crowd psychology. Since psychological contagion involving mainly interpersonal relationships is emotional, it depends on the ability, emotional state, attention tendencies and value system of perceived people, including the importance of events. The mass effect of psychological contagion on decision-making in management develops according to the following structure: transmission of relevant information to the mass → reception of information → conscious and unconscious imitation → physiological feedback → emotional experience (Zhang, 2014).

***Keywords:*** *management; management decisions; logical understanding; intuition; mass phenomenon; psychological contagion; information*

İdarəetmədə qərar qəbul edilməsi prosesi asan üsullarla həyata keçirilmir. Müasir dövrdə idarəetməyə təsir göstərən bir sıra xarici amillər vardır ki, rəhbər şəxs bu mürəkkəb mühitdə qərar qəbul edərkən situasiyanı diqqətlə nəzərdən keçirməli və bütün detalları nəzərə almalıdır. Əks halda, idarəetmədə yanlış qərarlar verilə və müəyyən boşluqlar yarana bilər. Bu baxımdan qeyd etmək lazımdır ki, idarəetmədə təzyiq elementləri düzgün rasional qərarların qəbul edilməsinə mane ola bilər. Buna görə də tələsik və düşünülməmiş qərarlar vermək işin gedişatına ziyan vura bilər. Belə bir qənaətə gəlmək mümkündür ki, səhv qərarın verilməməsi və ya təxirə salınması daha düzgündür. Qərarın verilməməsi də bir növ qərardır. Sadəcə olaraq qərarın verilib verilməməsi şüurlu şəkildə yerinə yetirilməlidir. İdarəetmədə təsirli və səmərəli qərarlar qəbul etmək üçün hər bir rəhbərin diqqət və tətbiq etməli olduğu bəzi mühüm taktika və üsullara ehtiyac duyulur:

- Qərarın qəbul edilməsində çətinlik törədən ən böyük səbəblərdən biri aidiyyatı üzrə kifayət qədər informasiyanın olmaması və ya dezinformasiyadır. Belə olan halda intuisiya və təxminlərə deyil, məntiqi araşdırma, mövcud bilik və təcrübəyə əsaslanaraq qərar qəbul etmək idarəetmədə daha effektiv təsir gücünə malik ola bilər.
- Qərar qəbul edərkən hadisələri məntiqi düşüncə ilə ardıcıl şəkildə analiz etmək gərəkdir. Məntiqli qərar vermək üçün ilk növbədə məntiqi düşünmək və hadisənin mahiyyətini dərk etmək lazımdır. Rəhbər şəxsin doğru və yerində qərar verə bilməsi əlaqələndirilmiş fəaliyyət və dərketmə detalları ilə əhatə olunduqda onun məqsədinin nəticəsi kütlə tərəfindən daha aydın şəkildə qəbul edilir.
- Düzgün qərar qəbulunda zaman və məkan qavrayışı mühüm rol oynayır. Qərarın vaxtından əvvəl və ya sonra verilməsi yaxud kütlənin fərdi-psixoloji xüsusiyyətləri və iş fəaliyyəti ilə uzlaşmaması onun icra imkanlarını zəiflədə bilər.
- Qərar qəbulu hər zaman problemin həllinə yönəldilməlidir. Ehtiyac olduqda yeni qaydalar və metodlar tətbiq oluna bilər, lakin bu zaman kütlənin xüsusiyyətləri nəzərə alınmalıdır. Tətbiq edilən qaydalar və metodlar müxtəlif sahələrdə fəaliyyəti reallaşan şəxsiyyətlərarası

münasibətlərdə eyni cür nəticə verə bilməz. Kütləni təşkil edən şəxslərə təqdim edilən seçim imkanları əlavə problemlərin meydana gəlməsinə şərait yaratmamalıdır.

- Qərarlar müvafiq fürsətlərdən istifadə edilərək verilərsə, daha effektiv olar. Belə ki, əldə edilməsi ən çətin olan məqamlardan biri də fürsətdir.
- Düzgün qərar qəbulu rəhbər şəxsin qətiyyətli, ədalətli və səriştəli xarakterə malik olmasından da asılıdır. Səbəb-nəticə əlaqələri düzgün hesablanmalıdır. Verilən hər yanlış qərar rəhbər şəxsin nüfuzuna mənfi təsir göstərə bilər.
- Bəzi qərarlar təxirə salına və ya hissə-hissə həyata keçirilə bilər.
- İdarəetmə qərarlarında kütlə fenomeni mühüm təsir gücünə malikdir. Bu baxımdan rəhbər şəxsin intuisiyadan çox məntiqi dərketməyə əsaslanması, informasiyanı məntiqi qaydada emal etməsi onun adekvat fəaliyyətinin təminatçısı hesab oluna bilər. Təcrübə də göstərir ki, tarixdəki bütün rəhbərləri birləşdirən ortaq cəhət uduzsalar belə verdikləri qərarlardan geri çəkilməmələridir.
- Qərar qəbulunda empatiya və identifikasiya amillərinin də nəzərə alınması tövsiyə olunandır. Müasir idarəetmə sistematik olaraq demokratik prinsiplərə əsaslanır. İdarəetmənin bütün ierarxik səviyyələrində qərar qəbulu məsuliyyətin bərabər bölünməsi istiqamətində aparılsa daha çox səmərə əldə etmək olar.

İdarəetmə qərarlarının həyata keçirilməsi insanların mənafeyini əhatə etdiyindən onun qəbul edilməsi ən məsuliyyətli prosesdir. Mürəkkəb zehni fəaliyyətin nəticəsi olaraq idarəetmə qərarları iqtisadi səmərə verməli, qüvvədə olan qanunvericiliyə uyğun gəlməli, psixoloji xüsusiyyətləri özündə ehtiva etməli və tabe olanlara tərbiyəvi təsir etməlidir. Qərar qəbul edilməsi prosesi gündəlik həyat və məişət də daxil olmaqla bütün fəaliyyət növünə xasdır. Qərar qəbul edilməsi rəhbərin ən mürəkkəb və məsuliyyətli funksiyalarından biri hesab olunur [12]. İlk öncə qeyd edək ki, idarəetmə qərarları səlahiyyətli yerli icra hakimiyyətləri tərəfindən həyata keçirilir [13]. Məhz idarəetmə qərarlarının qəbul edilməsinin müvafiq təsnifatı məlumdur. Onlardan bəzilərinə nəzər salaq:

- məqsədə görə qərar qəbulu;
- idarəetmənin səmərəliliyinə görə qərar qəbulu;
- alınan son nəticəyə görə qərar qəbulu;
- idarəetmə metodlarına görə qərar qəbulu;
- təsir vasitələrinə görə qərar qəbulu;

*Məqsədə görə qərar qəbulu.* Həll edilməsi gözlənilən problemi düzgün koordinasiya etmək və qərar vermə prosesini istiqamətləndirmək üçün məqsəd və ya vəzifələri düzgün müəyyən etmək vacibdir. Veriləcək qərarın probleminin modelləşdirilməsinin kritik elementi düzgün məqsəd və ya vəzifələrin müəyyənləşdirilməsindən asılıdır. Qərar problemin həllinə yönəldilmiş, məqsədə uyğun formalaşdırılmış və müvafiq məqsədə xidmət edən meyarlar və alternativləri əhatə etməlidir. Verilən qərar səmərəli icra üçün aydın şəkildə müəyyən edilmiş, əlçatan, real və ölçülə bilən elementlərdən ibarət olmalıdır. İdarəetmədə qərarların qəbulu ilə məşğul olan şəxslər məqsədin cəmiyyət ilə razılaşdırılmasına diqqət yetirilməlidir [4].

*İdarəetmənin səmərəliliyinə görə qərar qəbulu.* İdarəetmənin icra səviyyəsinə görə qərarın müvafiq növləri vardır*: strateji qərar, taktiki qərar* və *operativ qərar*. Həmin qərar növləri strukturuna görə də bir neçə hissəyə bölünür: *strukturlaşdırılmış qərar*, *strukturlaşdırılmamış qərar* və *yarı strukturlaşdırılmış qərar*.

Müasir idarəetmədə qərar qəbulu zamanı müəyyən üsul və texnikalar tətbiq olunur. Onlardan bəzilərinə nəzər salaq:

1. Delfi üsulu (*delphi üsulu*) – delfi texnikası hər hansı bir məsələ ilə əlaqədar ekspert rəyinin verilməsini ehtiva edir. Daha çox iqtisadi məsələlərlə əlaqədar istifadə olunan bu texnika uzun müddət və maddi resurs tələb edir.
2. Beyin fırtınası (*brainstorm*) – qrupda iştirak edən bütün fərdlərin müvafiq məsələ ilə əlaqədar müstəqil fikir bildirmə imkanı əldə etməsi ilə izah olunur. Beyin fırtınası yaradıcı qərarların verilməsi, qeyri-adi ideyaların irəli sürülməsi və problemin həlli istiqamətində yeni yanaşmaların təzahürü ilə şərtlənir.
3. Parateo analizi (*parateo analysis*) – hər hansı problemin bir neçə spesifik faktor əsasında analiz və təhlilini şərtləndirir. Mövcud resursların istifadəsinin ən səmərəli şəkildə təşkilini nəzərdə tutur. Prioritet istiqamətlərin müəyyənləşdirilməsi və həlli yolunda mühüm vasitə hesab olunur.

4. Nominal qrup texnikası – qrup üzvlərinin öz fikir və ideyalarını sərbəst ifadə etməsi və idarəetmədə istənilən sahədə tətbiqi imkanların geniş olması ilə şərtlənir. Qrup daxilində təzyiq və ziddiyyətlərin olmaması əməkdaşlıq və komanda işinin təşkilini asanlaşdırır.

5. PTYT (PUKÖ) planlaşdır, tətbiq et, yoxla, tədbirli ol – idarəetmədə iqtisadi və sosial planların həyata keçirilməsinə xidmət edir. Qeyd edilən texnika qarşıya çıxa biləcək problemlərin həllində mühüm rol oynayır və əsasən strategiya xarakteri daşıyır [10].

*Alınan nəticəyə istinadən qərar qəbulu.* Müasir dövrdə idarəetmədə qərar qəbulu *intuitiv, təcrübi və elmi mühakimələrə* əsasən həyata keçirilir. Aparılan araşdırmalar nəticəsində məlum olmuşdur ki, insan qərar qəbul edərkən və ya hökm irəli sürərkən hadisələri qavradığı prinsiplərə istinadən hərəkət edir. Yəni, qavrayış insanın atdığı bütün addımların və düşüncələrinin mənbəyini təşkil edir. Bir sıra psixoloji yanaşmalar da vardır ki, insanın düşüncələrini, davranış tərzini və qərarlarını tədqiq edir. Beləliklə məlum olur ki, qavrayış bir növ insanın həyata baxış tərzi və seçimlərini ifadə edir. Bütün həyati perspektivlər də qavranılan cisim və hadisələrin üzərində hərəkət etdiyi üçün qavrayışı proses etibarilə məntiqi dərketmənin sinonimi kimi qəbul etmək mümkündür. Məhz bu zaman idarəetmədə vəzifə səlahiyyətləri həqiqi mənada mühüm hədəflər üzərində fokuslanır və rəhbərin mövqeyi möhkəmlənir.

*İdarəetmə metodlarına istinadən qərar qəbulu.* İdarəetmə sistem olaraq bütün məsuliyyəti ilə "qərar qəbul edən şəxs"in çiyinlərində daşınan "yük"dür. Belə ki, idarəetmə insan həyatının bütün sahələrini əhatə edir. Bütün dünyada ilahi qüvvə və şəriət qanunları daxil olmaqla bərabər insan varlığının gedişatı onun yaşadığı ölkənin başçısının qəbul etdiyi siyasi, strateji və prinsipial qərarlardan asılı olaraq tənzimlənir. Qəbul edilən qərarların bütövlüyü və siyasi əhəmiyyəti bütün ölkənin müqəddəratını mənfi və müsbət istiqamətdə dəyişə bilir [11]. İnsanın azadlığına və xoşbəxtliyinə, "xilasa", milli həmrəyliyə, tərəqqiyə, kamilliyə, sülhə, rifaha yol açan effektiv idarəetmə – yüksək ruhi mədəniyyət olmadan mümkün deyil. Cahillik – şər və miskinlik, mədəniyyət isə - bilik, inkişaf və rifahdır. İlk növbədə, sosial təzahür olan, insanların cahilliyi ilə şərtlənən şəri azaltmaq və dəf etmək – yüksək ruhi mədəniyyətin inkişaf etdirilməsi və yayılması yolu ilə mümkündür. Burada çox şey uşaq və gənclərin düzgün tərbiyə edilməsindən, elmi nailiyyətlərə əsaslanan, elmin və təhsilin insana verdiyi yüksək mədəni dəyərlər imkanı üzərində qurulan məntiqi dəlillər əsasında yaşlı insanları inandırmaq bacarığından asılıdır. Yüksək ruhi mədəniyyət – praqmatik dəyərlərə əsaslanan, təfəkkür stereotipləri ilə şərtlənən, müasir dünya sivilizasiyasının iqtisadi, sosial-siyasi və ekoloji qeyri-sabitliyi ilə bağlı böhranların aradan qaldırılması üçün geniş imkanlar açan mənbədir. Böhran şəraitində yaşamaq və həyat şəraitini permanent olaraq yaxşılaşdırmaq, sülh və həyat qabiliyyətli sivilizasiya formalaşdırmaq üçün insana – özünün, dövlətin, cəmiyyətin, bəşəriyyətin, indiki və gələcək zamanın qarşısında yüksək məsuliyyət mədəniyyəti gərəkdir (14, s. 35-36).

İdarəetməni planlaşdırma və funksional yaşam tərzi də adlandırmaq olar. Rəhbər şəxs yerində və düzgün qərar qəbul etmək bacarığına malik olmalıdır. Heç kəsə sirr deyildir ki, Azərbaycan Respublikasının Prezidenti vəzifəsinə seçildiyi gündən etibarən İlham Əliyev cənabları sürətlə dəyişən çağdaş dünyada, qloballaşma və inteqrasiya proseslərində, bütün beynəlxalq görüşlərdə və apardığı yüksək səviyyəli danışıqlarda Azərbaycanın mənafeyini bütün sahələrdə uğurla müdafiə etməyi bacarmışdır. İlham Əliyevin uğurlu xarici siyasəti sayəsində Azərbaycanın beynəlxalq və regional problemlərin həllində rolu və nüfuzu getdikcə artmışdır [8]. Elə bunun məntiqi nəticəsi olaraq 44 günlük Vətən müharibəsi dövründə ölkə başçımız bütün siyasi təzyiqlərə və təhdidlərə də sinə gərməyi bacarmışdır. Prezident İlham Əliyev prinsipiallıq və yenilməz iradə nümayiş etdirərək Azərbaycan xalqının milli maraqlarını qətiyyətlə müdafiə etmiş, məqsədyönlü, ardıcıl siyasət aparmış və bütün bunların nəticəsi olaraq tarixi qələbə qazanmışdır [15].

*Təsir vasitələrinə görə qərar qəbulu.* Qərar qəbul edən şəxsin xarakterik xüsusiyyətlərində qeyri-müəyyənlik olduqda idarəetmədə müəyyən risklər yaranır. Bu baxımdan qərar qəbul edən şəxsin fikirləri aydın olmalıdır.

Qərarın qəbul edilməsi özü bir mürəkkəb prosesdir və ardıcıl prinsiplərə əsaslanmalıdır.

Qeyd edilən *prinsiplərə problemin diapazonunun pozulması, alternativlərin tapılması, alternativlərin qiymətləndirilməsi, qərar qəbul edilməsi və qəbul edilmiş qərarın icrası.* Qərar qəbulunda iştirak edən əsas üsullar əsasən üç qrupa bölünür:

1. intuitiv qərar;
2. müşahidə və ya səriştə əsasında qərar;
3. rasional qərar.

*İntuitiv qərar* — hər bir rəhbər şəxsin intuisiya əsasında qəbul etdiyi qərardır. Bu halda daxili hissin hökmü əsas götürülür və heç bir təcrübəyə və ya elmi biliyə istinad edilmir.

*Mülahizə və ya səriştə əsasında qərar* — aparılmış müşahidələrin yekunlaşdırılması və yaxud da əvvəllər baş vermiş pozuntuların (xətaların) həlli zamanı müsbət nəticə vermiş təcrübənin (səriştənin) tətbiqi yolu ilə yerinə yetir. Bu halda həm ayrı-ayrı fərdlərin, həm də ümumi kollektivin təcrübəsinə və səriştəsinə əsaslanmaq olar.

*Rasional qərar* — elmi və təcrübi biliklərin tətbiqi, rəhbər işçinin intellektual səviyyəsi və qabiliyyəti əsasında qəbul olunur. Bu halda əsas meyar, elmi-nəzəri biliklərə və həm də qabaqcıl təcrübəyə və müasir elmi metodlara əsaslanmaqdan ibarətdir [12].

Qərar qəbul edilməsi prosesi *əks əlaqənin yaradılması* ilə yekunlaşır. Bu isə o deməkdir ki, qəbul edilən qərar həll ediləcək problemlə bilavasitə bağlı olmalı və qərarın qəbul edildiyi məqamda real vəziyyətlə müqayisə olunmalıdır. Bu baxımdan, qəbul olunmuş hər bir qərar aşağıdakı tələblərə cavab verməlidir:

- məqsədəuyğun olmalı;
- kəmiyyət və keyfiyyət göstəricilərinə malik olmalı;
- optimal olmalı;
- kompleks xarakter daşımalı;
- stimullaşdırıcı olmalı;
- çevik olmalı;
- səmərəli olmalı;
- vaxtında olmalıdır [12].

İdarəetmədə mövcud kadr potensialı, maliyyə resursları və zaman faktoru əsas götürülür. Bununla yanaşı digər subyektiv amillər (həmin problemin həlli üçün kollektivin psixoloji və peşə hazırlığı, bu problemin həllinin zəruriliyi haqqında işçilərin inamı) də böyük rol oynayır. Qeyd edə ki, problemi aşkar etdikdən sonra onu dəqiq təsvir etmək gərəkdir. Məqsədin aşkara çıxarılması idarəetmə və istehsal vəzifələrini konkretləşdirməyə imkan verir. Qərarın qəbul edilməsi üçün informasiyanın yığılması və təhlili mərhələsində cari informasiyanın yığılması və təhlili ilə yanaşı xüsusi seçilmiş informasiyanı da təhlil etmək lazımdır. Konkret idarəetmə qərarı həm cari, həm də həmin problem üzrə xüsusi əlavə informasiyanın təhlili əsasında dərk edilir. Dərketmə dedikdə, şüurun obyektlə birbaşa əlaqəsi kimi həyata keçirilən idrak fəaliyyəti metodu nəzərdə tutulur. Terminoloji prototipi alman dilindən tərcümədə "*anschauung*", yəni "vizual təmsil" ( alm. *schau* : shau) mənasını verir. Kantianizmdə dərketmə termini kateqoriyalı status alaraq *təfəkkürlə vasitəçiliyi olunmayan idrak aktı* mənasında işlənir. Fəlsəfə tarixində dərketmə termininin analoqu *intuisiya* anlayışıdır. Dərketmə sözü tez-tez yunan dilində *fərziyyə* və ya *"ruhun uzaq sirrlərə cəmləşməsi"* mənasını verir və həmçinin ingilis dilində *contemplation* məlumat aldıqdan sonra düşüncənin dayanması, *"ani tutma"* və qavrayış təsiri meydana gəldiyi zaman yaranan vəziyyət kimi başa düşülür [5].

Kant təfəkkür (nəzəri) və praktiki düşüncə (empirik) arasındakı ziddiyyəti qoruyur və bu barədə yenidən düşünür. Dərketmə artıq mənəvi-intellektual təcrübənin nəticəsi deyil, onun apriori şərtidir.

Beləliklə, məkan və zaman *təfəkkürün apriori formalarına* çevrilir, çünki onlar hər hansı mümkün qavrayış üçün ilkin şərtlərdir, çünki hər bir obyekt artıq məkan və zamanda qavranılır. Bundan əlavə, təfəkkür məntiqi təfəkkürün əleyhinədir, çünki ağıl obyekti müqayisə etməyə, təsnif etməyə və təhlil etməyə başlamazdan əvvəl, bu obyekt şüura hansısa " refleksiyaqabağı (prerefelektiv) bütövlük kimi təqdim edilməlidir. Hər hansı anlayışın təzahüründən əvvəl bir obyektin şüura ötürülməsi təfəkkür adlanır. Kant "Xalis zəkanın tənqidi" əsərində intuisiyaya sahib olmaq qabiliyyətini həssaslıq ("*sinnlichkeit"*) adlandırır. Xalis təfəkkürlə ("*reine anschauung"*) yanaşı, əsasında hisslər dayanan "hissi (və ya *empirik)* təfəkkür" (*sinnenanschauung* və ya *empirischen anschauung*) də vardır [5].

Kantdan sonra dərketmə anlayışı *Höte* tərəfindən fəal şəkildə istifadə edilmişdir. Onun zənnincə, dərketmə şüurun və fenomenin bir-bi-

rinə nüfuz etməsi baş verən zaman təbiətin "ehtiramla müşahidəsini" nəzərdə tutur. Dərketmənin birinci mərhələsində şüurda *obrazların* konturları olan geştaltlar formalaşır, ikinci mərhələdə faktiki obrazlar yaranır, üçüncü mərhələdə isə insanlar obrazların mənasını dərk edir. Hegel isə dərketməni "birbaşa təsəvvür" kimi müəyyən etmişdir [5].

Məntiqi dərketmə irəli sürülən müddəalar arasında əlaqənin yaranmasını təmin edən əqli qabiliyyəti və təkliflərin həqiqət dəyərlərini təyin etmək üçün istifadə edilən hesablama üsuludur. Təyinetmə məntiqin xarakterik xüsusiyyətlərindən birini əks etdirir. Təcrübə göstərir ki, şəxs hər hansı bir obyektin və ya hadisənin mahiyyətini tanışlıq zamanı dərhal dərk edib qavrayırsa və cari vəziyyətlə əlaqədar müvafiq suallar təzahür edirsə, bu xüsusiyyət onun məntiqi dərketmə qabiliyyətinin yüksək səviyyədə olmasının göstəricisi hesab oluna bilər. Müasir dövrdə inkişaf edən idarəetmə prosesində məntiqi qərar qəbulu müəssisənin səmərəli fəaliyyətinin əsas göstəricisi kimi çıxış edir və müəssisənin mövcud kadr potensialının uğurla idarə edilməsinin tənzimlənməsində mühüm rol oynayır.

Qərar qəbulu zamanı müvafiq şablon xarakterli stereotiplər formalaşdırıla və zehni çərçivə daxilində fəaliyyət göstərmək olar. Nəzərə almaq lazımdır ki, idarəetmədə qəbul edilən qərarlar kütlənin tələblərinə cavab vermədikdə narazılıqlar baş qaldırır. Bu zaman rəhbər-icraçı münasibətlərində uçurumun yaranması qaçılmaz hal alır. Qəbul edilən qərarlar ümumilikdə cəmiyyətin də həyat tərzinə təsir göstərirsə, vəziyyət daha da kəskinləşir və kütləvi uyğunsuzluq meydana gəlir. (18, s.30-45). İdarəetmədə kütləni *afaziya* (afaziya – yunan sözü olub inkar, iltihab mənasında işlənir [13]) həddinə çatdırmaq məqsədəuyğun hesab edilmir;

Şəxsiyyətlərarası sosial qarşılıqlı əlaqə və davranış sinxronlaşdırma fərdlər arasında emosional cəhətdən psixoloji yoluxmaya səbəb ola bilər. Psixoloji yoluxma əsasən ünsiyyət zamanı çox təsirli və cəlbedici mexanizmlərin strateji və ya qeyri-strateji olaraq əks tərəfə ötürülməsidir. Psixoloji yoluxmanın mexanizmləri insanın inkişafına səbəb olduğu kimi onu tənəzzülünə də səbəb ola bilər. Psixoloji yoluxma və ya psixoloji sirayət üz ifadələri, jestlər və s. dolayı vasitələr (insanlarla qarşılıqlı əlaqə və s.) və ya birbaşa qarşılıqlı əlaqə zamanı digər insanların davranışlarına təsir göstərə bilər. Psixoloji yoluxma qarşılıqlı əlaqə zamanı insanın davranışının başqalarının emosional vəziyyəti ilə sinxronlaşdırılaraq fizioloji və ya nevroloji olaraq tənzimlənməsidir [9].

İdarəetmədə kütləvi hadisələr fonunda nəzərə çarpan psixoloji sirayət fərdlərin qrupdaxili münasibətlərinin bərpaedici xüsusiyyətləri və qrup emosiyalarının yayılma müddəti ilə əlverişli vəziyyət ala bilər. İnsanlar informasiya aləmində yaşadıqları üçün mütəmadi olaraq maariflənir və yeni məlumatlar əldə edirlər. Yaş fərqi tanımayan informasiya axını faydalı xarakter daşıdığı haıda insanların idrak fəaliyyətinin inkişafına səbəb olur. Hisslərin intellektuallaşması dedikdə, adətən bu cəhəti nəzərə alırlar. Elmi-texniki tərəqqi dövründə insanların məlumatlılıq səviyyəsinin artması, şüurluluq səviyyəsinin yüksəlməsi və s. hislərin intellektuallaşması prosesini daha da intensivləşdirmişdir. Bütün bunlar isə psixoloji sirayətin məzumun və formasına köklü təsir göstərmişdir (2, s.310). Psixoloji sirayət "beyindəki simpatik sinirlərin yaratdığı birbaşa primitiv reaksiya" sayəsində rellaşır və situativ xarakter daşıyır. İdarəetmədə psixoloji yoluxma kütlə psixologiyası hadisəsi olaraq şüurlu şəkildə təqlid davranışı hesab edilir. İdarəetmə elə bir prosesdir ki, burada çoxsaylı müzakirələr aparılır, həmçinin mövcud əlaqə, assosiativ və sosial müqayisə mexanizmləri emosional yoluxma aspektləri ilə paralel inkişaf edir (Zhang və Lu, 2013). İdarəetmədə assosiativ mexanizm təşkilatda hökm sürən qarşılıqlı münasibətlər sisteminin iş fəaliyyətinə proqnozlaşdırıcı təsiri ilə seçilir (Gustave Le Bonn, 1895).

**Problemin elmi yeniliyi.** Elmi məqalədə motivasiya-tələbat aspektinə və sistematik müşahidə metoduna əsaslanmaqla qərarın hazırlanma müddəti, rəhbərin savadı, səriştəsi və təcrübəsi, qərarların qəbul olunma tezliyi, kollektivin qərar qəbul edilməsində rolu, işçilərin işgüzarlığı, mövcud olan idarəetmə quruluşu, rəhbərin təşkilatçılıq qabiliyyəti, şəxsi keyfiyyəti və idarəetmə üslubu, qərarların icrasına nəzarətin metodları, kollektivin qərarların icrasında marağı, qərarın icra müddəti və təşkilatda istehsalat və əmək intizamı [12] məsələlərinin kütlə fenomeninin idarəetmədə qərar qəbulunu tənzimlənməsi xüsusiyyətləri araşdırılmışdır.

**Problemin aktuallığı.** Kütlə fenomeni müasir idarəetmədə demokratik və innovativ təcrübənin əsası olaraq məntiqi dərketmənin rolunu zəruriləşdirir. Məntiqi düşüncə tərzi rəhbər və tabe şəxslər üçün mürəkkəb vəziyyətlərin təhlilində, problemlərin müəyyənləşdirilməsində, effektiv strategiyaların hazırlanmasında və daha yaxşı məlumatlı seçimlərin edilməsində real imkanlar yaradır [12].

Aparılan tədqiqat zamanı belə bir qənaətə gəlinmişdir ki, məntiqi dərketmə idarəetmədə qərar qəbul edilməsi prosesinə sistemli yanaşmanı, seçim edilərkən konkret sübut və rasional düşüncəyə istinadı təmin edir. İdarəetmədə kütlə fenomeninin sosial-psixoloji strukturu əsasən sosial stereotiplər üzərində qurulur. Stereotip anlayışı bütün sahələrdə olduğu kimi qeyd edilən vəziyyətdə də qərar qəbulu+kütlə+razılıq sisteminin vəhdətini təmin etmək üçün istifadə edilə bilər.

**Problemin praktik əhəmiyyəti.** Məqalə ali və orta ixtisas məktəblərində fəaliyyət göstərən müəllim və tələbə kontingenti, həmçinin müvafiq sahənin mütəxəssisləri tərəfindən istifadə üçün nəzərdə tutulub.

**“**Kütlə fenomeninin idarəetmə qərarlarının qəbuluna göstərdiyi təsirin sosial-psixoloji təhlili” adlı elmi məqalədə zəruri nəticənin əldə edilməsi məqsədilə O.F.Potyomkina tərəfindən təkmilləşdirilmiş motivasiya-tələbat sahəsində şəxsiyyətin sosial-psixoloji yönlənmələrinin diaqnostik metodikasından və sistematik müşahidə metodundan istifadə olunmuşdur.

1. O.F.Potyomkina tərəfindən təkmilləşdirilmiş motivasiya-tələbat sahəsində şəxsiyyətin sosial-psixoloji yönlənmələrinin diaqnostik metodikası.

Qeyd edilən metoddan istifadə zamanı əsas təhlillər kütlə fenomeninin idarəetmədə qəbul edilən qərarlara göstərdiyi təsir üzərində aparılmışdır. Bu məqsədlə respondentlərə müvafiq suallar təqdim olunmuşdur. Elmi məqalədə əldə edilən nəticələr müəllif tərəfindən yazılan dissertasiyanın əsas nəticələrinə istinadən hesablanmışdır. Tədqiqatın təşkili və aparılmasında iştirak edən respondentlərin cavablandırdığı suallar əsasında bir sıra nəticələr əldə olunmuşdur. Aparılan sorğu zamanı respondent qismində 12-si kişi, 38-i qadın olmaqla 50 nəfərdən ibarət 35-55 yaşlı şəxslər iştirak etmişdir. Metodikanın əsas məqsədi kütlənin xarakterik xüsusiyyətlərinin, kütlədə psixoloji yoluxmanın xarakterik cəhətlərinin, kütlə psixologiyasının idarəetməyə və idarəetmə qərarlarının qəbuluna göstərdiyi təsirin, o cümlədən idarəetmə qə-rarlarının əsas aspektləri və kütlə psixologiyasının əsas elementləri kimi çıxış edən psixoloji yoluxma (və ya sirayət) və informasiya anlayışının qərar qəbuluna göstərdiyi təsirin spesifikasının təhlilinin aparılmasından ibarət olmuşdur. Metodikanın keçirilmə qaydasına əsasən respondentlərə müvafiq bir protokol üzrə (1 nömrəli Protokol nümunəsinə bax) suallar təqdim olunmuş və blankda “hə” və ya “yox” cavabları qeyd edilmişdir.

**Nümunə 1. (Protokol nümunəsi)**

| I sıra | 1 | 5 | 90 | 0013 | 17 | 21 | 25 | 29 | 33 | 37 |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| II sıra | 2 | 6 | 10 | 14 | 18 | 22 | 26 | 30 | 34 | 38 |
| III sıra | 3 | 7 | 11 | 15 | 19 | 23 | 27 | 31 | 35 | 39 |
| IV sıra | 4 | 8 | 12 | 16 | 20 | 24 | 28 | 32 | 36 | 40 |

Göstəricilərin işlənilməsi və interpretasiyası protokolda göstərildiyi kimi üfüqi sıra ilə aparılmışdır (Nümunə 1).

I sırada göstərilən sualların müsbət cavablarının cəmi – “prosesə meyllilik”;

II sırada göstərilən sualların müsbət cavablarının cəmi – “nəticəyə meyllilik”;

III sırada göstərilən sualların müsbət cavablarının cəmi – “alturizmə meyllilik”;

IV sırada göstərilən sualların müsbət cavablarının cəmi isə – “xudbinliyə meyllilik” kimi interpretasiya olunur [16, səh.272].

2. Sistematik müşahidə metodu.

1. O.F.Potyomkina tərəfindən təkmilləşdirilmiş motivasiya-tələbat sahəsində şəxsiyyətin sosial-psixoloji yönlənmələrinin diaqnostik metodikasının nəticələri:

1.1. Kütlənin özünün motivləri və tələbatlar sistemi vardır. Motivlərin tələbatlarla uzlaşmaması isə onun fəaliyyətində dəyişikliyə səbəb olur. Belə ki, kütlə fenomeni təbiətin sosiomədəni xüsusiyyətlərini ehtiva etdiyi üçün insan davranışının bütün makro və mikro komponentlərinin bir-birinə keçid aldığı sistem hesab olunur. Kütlə fenomeni fərdiləşdirmə və fərdiləşdirmədən kütləviliyə keçidi və “əksəriyyət” obrazının xüsusiyyətlərini də əks etdirir. Məhz yuxarıdakı II və III sıralarda göstərilən sualların müsbət cavablarının cəminin – “nəticəyə meyllilik” və “alturizmə meyillilik”, I və IV sırada göstərilən cavabların cəminin isə “prosesə meyllilik” və “xudbinliyə meyllilik” xüsusiyyətləri ilə sistematik uzlaşması buna misal ola bilər. Nəticələr onu deməyə əsas verir ki, hər bir kütlənin özünəməxsus dəyərlər sistemi olur. Kütlə (kütlənin tərkib hissəsi olan fərdlər) varlığını qoruyub saxlamaq üçün özünü həmin dəyərlər sisteminin stereotiplərinə əməl etməyə təhkim olunmuş hesab edir. Qeyd edilən dəyərlər sisteminə sosial, iqtisadi, psixo-sosial, maddi və mənəvi tələblər aiddir. Belə ki, qəbul edilən qərarlar kütlənin dəyərlər sisteminə daxil olan tələbləri ödəmədikdə onun hədəfləri məqsədləri ilə uzlaşmır. Belə ki, idarəetmədə qərar qəbulu kütlənin stereotipləri ilə uzlaşdırılmalıdır. Kütləni təhdid və təzyiq altında saxlamaq tövsiyə olunmur; kütləni təşkil edən insanların şəxsiyyətinin sosial-psixoloji tərəfləri ciddi sürətdə nəzərdən keçirilməlidir; şəxsiyyətin əsas hərəkətverici qüvvələri verilən qərarlarla müqayisə olunarsa, daha müsbət nəticə əldə etmək mümkün olar; unutmaq olmaz ki, hər bir insanın riayət etdiyi mənəvi meyarlar, malik olduğu özünəməxsus təcrübi imkanlar, maraq və meyilləri, hədəf və məqsədlər vardır.

2. Sistematik müşahidə metodundan istifadə olunmaqla əldə edilən nəticələr:

2.1. Kütlə fenomeninin idarəetmə qərarlarının qəbuluna göstərdiyi təsir məntiqi xarakter daşıdıqda idarəçilikdə səmərəlilik artır. Aparılan müşahidələr əsasında məlum olmuşdur ki, məntiqi dərketmənin idarəetmədə rolu və əsas aspektləri aşağıdakı qaydada strukturlaşdırıla bilər:

- situativ problemin həllində səriştəlik;
- effektiv qərar qəbuletmə qabiliyyətinin olması;
- effektiv resursların zəruri istifadəsinin təmin olunması;
- strateji planlaşdırma;
- tənqidi düşüncə tərzinin və innovasiya yönümlü fəaliyyətin mövcudluğu;
- səmərəli ünsiyyət keyfiyyət göstəricilərinin olması;
- qərar qəbulunda konkret və dəqiq informasiyaya istinadın təmin olunması:

Qeyd edilən strategiyaları izləyərək və məntiqin gücündən yararlanaraq idarəetmədə təşviqetmə və sağlam rəqabət üstünlüyünə nail olmaq, mövcud qeyri-müəyyənlikləri inamla aradan qaldırmaq, idarəetməni davamlı inkişafa və səmərəli fəaliyyətə uyğunlaşdırmaq mümkün ola bilər.

2.2. Həmçinin məlum olmuşdur ki, qərar qəbulunda kütlə fenomeninin fonunda psixoloji sirayət aşağıdakı təcrübi tərəfləri ilə nəzərə çarpır:

- (i) interaktivlik – şəxsiyyətlərarası ünsiyyət prosesində təzahür edir;
- (ii) istiqamətlilik – psixoloji sirayət istiqamətyönlüdür və idarəetmədə ötürücü və qəbuledici əhəmiyyət kəsb edir;
- (iii) oxşarlıq – psixoloji sirayətin vacib xüsusiyyətidir, reaksiyanı qəbul edən reaksiyanı ötürənin oxşar emosional təcrübələrini və ifadələrini mənimsəyir və nəticədə hər ikisinin emosiyaları oxşarlıq təşkil edir (Herrando və Constantinides, 2021).

2.3. İnformasiyanın düzgün təhlili prosesin ümumi vəziyyətini tənzimləyir. Belə ki, kütlə tərəfindən qəbul edilən informasiya onun müqəddəratını həll edir. İnformasiyanın mənbəyi sağlam olmadıqda kütlənin inkişaf səviyyəsi intellektual imkanlar hesabına reallaşır.

**Ədəbiyyat:**


1. Axundov, M.Ə. Strateji idarəetmə / M.Ə. Axundov. – Bakı: Dərslik, – 2001. – 300 s.
2. Bayramov, Ə.S. Sosial psixologiya / Ə.S. Bayramov, Ə.Ə. Əlizadə – Bakı: Qapp-Poliqraf, – 2003. – 356 s.
3. Çox kriteriyalı qərar qəbulu: [Elektron resurs] / Bahadır, F.Y. İstanbul Universiteti. – İstanbul, 2019.
4. https://www.bahadirfyildirim.com/blog/serie/cok-kriterli-karar-verme/#:~:text=Ama%C3%A7%20yada%20ama%C3%A7lar%C4%B1n%20belirlenmesi&text=Belirlenen%20amaca%20g%C3%B6re%20karar%20problemi,ger%C3%A7ek%C3%A7i%20ve%20%C3%B6l%C3%A7%C3%BClebilir%20olmas%C4%B1%20gerekmektedir
5. Dərketmə haqqında: [Elektron resurs] / Vikipediya məlumatları. – Bakı, 2023. – https://az.wikipedia.org/wiki/D%C9%99rketm%C9%99
6. Dövlət idarəçilik nəzəriyyəsi: (Dərslik) / -Bakı: Elm və təhsil, – 2010. – 552 s.
7. Haqverdiyev, B.Y. İdarəetmə psixologiyası / B.Y. Haqverdiyev. – Bakı: Elm, – 2008. – 304 s.
8. Heydər Əliyev yolunun davamçısı: [Elektron resurs] / Azərbaycan.az. –https://azerbaijan.az/related-information/152
9. Herrando, C. Psixoloji yoluxma: qısa baxış və gələcək istiqamətlər: [Elektron resurs] / Psixologiyada sərhədlər. – Psixologiya. – İyul 16, 2021. https://www.ncbi.nlm.nih.gov/pmc/articles/PMC8322226/
10. İdarəetmə yönümlü qərar vermə üsulları: [Elektron resurs] / İENSTİTUTU. – İstanbul, 2020. https://www.iienstitu.com/blog/yonetsel-karar-verme-teknikleri
11. İdarəetmə qərar qəbulu və problem həlli: [Elektron resurs] / GGURSES / MEB Xidməti tədris mərkəzinin qeydləri. – İstanbul, 2009. https://ggurses2.tripod.com/ogretmenler1/ogr32.htm
12. İdarəetmə qərarları: [Elektron resurs] / Vikipediya məlumatları. – Bakı, 2013. – https://az.wikipedia.org/wiki/%C4%B0dar%C9%99etm%C9%99_q%C9%99rarlar%C4%B1#Q%C9%99rar_q%C9%99bul_edilm%C9%99sin%C9%99_t%C9%99sir_g%C3%B6st%C9%99r%C9%99n_amill%C9%99r
13. Qərar haqqında: [Elektron resurs] / Vikipediya məlumatları. – Bakı, 2024. – https://az.wikipedia.org/wiki/Q%C9%99rar
14. Məmmədov, F.T. İdarəetmə mədəniyyəti / Məmmədov F.T. – Bakı: Apostrof çap evi, – 2013. – 673 s.
15. Prezident İlham Əliyev Azərbaycan xalqının milli maraqlarını qətiyyətlə müdafiə edərək tarixi qələbəyə imza atdı: [Elektron resurs] / Yeni Azərbaycan qəzeti. – Bakı, 2020. – https://yeniazerbaycan.com/SonXeber_e74703_az.html
16. Psixodiaqnostika: metodikalar və testlər: (Dərslik) / Bakı: 2018. – 280 s.
17. Ertürk, D.Y. Davranışlarımız ve biz Sosyal psikoloji bakışıyla / D.Y. Ertürk. – İstanbul: Pozitif yayınları, – 2017. – 455 s.
18. Nevzat, T. Toplum psikolojisi və empati / T.Nevzat. – Sosyal şizofreniden toplumsal empatiye / İstanbul: –2009. – 333 s.
19. Said, F. Entellektüel. Sürgün, marjinal, yabançı / F.Said. – İstanbul: – 2023. – 127 s.
20. Sigmund, F. Kitle psikolojisi / F. Sigmund. – İstanbul: Cem Yayın evi, – 2020. – 105 s.
21. Baron, R.A. Social psychology / Branscombe Nyla R. – Pearson education limited: 2013. – 528 p.


**E-mail:**hecemova7@gmail.com

**Redaksiyaya daxil olub:** 19.04.2024

*UOT 371*

***Ruqiyyə Məmməd qızı Babaşova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şamaxı filialının müəllimi*
*https://orcid.org/* 0009-0005-8910-9639
*https://doi.org/10.69682/azrt.2024.91(3).168-171*

***Sevinc Soltanmecid qızı Baxşıyeva***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şamaxı filialının müəllimi*

# İBTİDAİ SİNİFLƏRDƏ NİTQ İNKİŞAFI METODİKASI VƏ FƏNDAXİLİ İNTEQRASİYADAN İSTİFADƏ ÜSULLARI

***Ругия Мамед гызы Бабашова***
*преподаватель Шемахинского филиала Азербайджанского Государственного Педагогического Университета*

***Севиндж Солтанмеджид гызы Бахшиева***
*преподаватель Шемахинского филиала Азербайджанского Государственного Педагогического Университета*

# МЕТОДИКА РАЗВИТИЯ РЕЧИ В НАЧАЛЬНЫХ КЛАССАХ И МЕТОДЫ ИСПОЛЬЗОВАНИЯ ВНУТРИПРЕДМЕТНОЙ ИНТЕГРАЦИИ

***Rugiya Mammad Babashova***
*lecturer at Shamakhi branch of Azerbaijan State Pedaqogical University*

***Sevinj Soltanmajid Bakhshiyeva***
*lecturer at Shamakhi branch of Azerbaijan State Pedaqogical University*

# SPEECH DEVELOPMENT METHODOLOGY AND TECHNIQUES OF USING INTERDISCIPLINARY INTEGRATION IN ELEMENTARY GRADES

**Xülasə.** Bugünkü qloballaşma, mədəniyyətlərarası proseslər dövründə, Azərbaycanın beynəlxalq aləmə sıx inteqrasiyası şəraitində yüksək səviyyəli, savadlı şəxsiyyətlərin yetişdirilməsi diqqət mərkəzində olmalıdır. Şəxsiyyətin formalaşmasında təhsilin rolu danılmazdır. Odur ki, təhsilalanın qazandığı bilik və bacarıqların keyfiyyəti yüksək səviyyədə tənzimlənməli, müasir dövrün tələblərinə cavab verməlidir. Yaddan çıxarmaq olmaz ki, "təhsil prosesində əldə olunan bilik və bacarıqlar, həmçinin etik-əxlaqi norma və dəyərlər hər bir təhsil alanın cəmiyyətin layiqli üzvü olması üçün lazımi şərait yaradır, onun biliyi və etik davranışı sayəsində örnək ola biləcək həmkara, nümunəvi ailə üzvünə və vətəndaşa çevirir".
***Açar sözlər:*** *təhsil, fənlərarası inteqrasiya, fəndaxili inteqrasiya, nitq, bacarıq və vərdişlər*

**Резюме:** В сегодняшнюю эпоху глобализации, межкультурных процессов, в условиях тесной интеграции Азербайджана в международный мир в центре внимания должно быть воспитание высокообразованных, грамотных личностей. Роль образования в формировании личности неоспорима. Поэтому качество знаний и умений, полученных педагогом, должно быть на высоком уровне регламентировано, отвечать требованиям современности. Нельзя забывать, что «знания и умения, приобретенные в процессе образования, а также этико-нравственные нормы и ценности создают необходимые условия для того, чтобы каждый обучающийся стал достойным членом общества, превратив его в коллегу, примерного члена семьи и гражданина, которые могут служить примером благодаря его знаниям и этическому поведению».
***Ключевые слова:*** *образование, междисциплинарная интеграция, внутрипредметная интеграция, речь, умения и навыки*

**Summary:** In today's period of giobalization and intercultural processes, in the conditions of close integration of Azerbaijan into the international community, the focus should be on the cultivation of high-level, educated personalities. The role of education in the formation of personality is undeniable. Therefore, the quality of knowledge and skills acquired by the student must be regulated at a high level and meet the requirements of modern times. It should not be forgotten that "the knowledge and skills acquired in the educational process, as well as ethical and moral norms and values create the necessary conditions for each recipient of education to become a worthy member of society, turn him into a colleague, exemplary family member and citizen who can become an example thanks to his knowledge and ethical behavior".

***Keywords:*** *education, interdisciplinary integration, intra-disciplinary integration, speech, skills and habits*

2008-ci ildə Azərbaycan Respublikasının Təhsil Nazirliyi tərəfindən "Azərbaycan Respublikasında ali təhsilin bakalavr pilləsində ibtidai sinif müəllimlərinin hazırlığı üzrə Çərçivə Kurikulumu" adlı hərəkət proqramı hazırlanmışdır. Burada haqlı olaraq göstərilir ki, iş ali məktəbdən, yəni ibtidai siniflər üçün bakalavr hazırlığından başlanmalıdır. Belə olarsa, yetişən gənc qüvvələr bütövlükdə ibtidai təhsilin, o cümlədən, şagirdlərin nitq inkişafının yüksəldilməsinə nail ola bilərlər.

Azərbaycan dili təliminin başlıca prinsipi şagirdlərin nitq bacarıqlarının, nitq mədəniyyətinin inkişaf etdirilməsidir. Bəs bu məqsədə çatmaq üçün təlimin hansı üsul və vasitələrindən istifadə edilməlidir? Qeyd etmək lazımdır ki, Azərbaycan dili tədrisində istifadə olunan bütün üsul və vasitələr, iş formaları bu və ya digər dərəcədə şagirdlərin nitq bacarıqlarını inkişaf etdirir. (4.64)

"Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün Azərbaycan dili fənni üzrə təhsil proqramı (kurikulumu)"nda (I – IV siniflər) ümumi təlim nəticələri aşağıdakı kimi müəyyən olunmuşdur. Şagird:

*danışanın fikrinə münasibət bildirir, öz fikirlərini sərbəst və ardıcıl ifadə edir;

*düzgün, sürətli, ifadəli oxuyur, oxuduğu mətnlərə münasibət bildirir;

*kiçikhəcmli rabitəli mətnlər qurur;

*lüğətlərdən, məlumat kitablarından istifadə edir;

*Azərbaycan xalqının dili, tarixi, əxlaqi-mənəvi dəyərləri, incəsənəti, adət-ənənələri haqqında öyrəndiyi məlumatları sadə formada təqdim edir;

*yazılı və şifahi nitqində fonetik, leksik, qrammatik qaydalara yiyələndiyini nümayiş etdirir.(4, s. 64)

Bütün bu qeyd olunanlar ibtidai təhsil səviyyəsində şagirdlərin nitq vərdişlərinin inkişafına müəllimin diqqətini, məsuliyyətini daha da artırır.

Professor Yəhya Kərimov yazır: "Nitq insanın əqli fəaliyyətinin yaranmasında, bilavasitə iştirak edir və onun əsası olur. Şagirdlər mükəmməl nitqə yiyələnməklə xarici aləmdəki hadisə və əşyalar haqqında biliklərə yiyələnirlər.

Aparılan müşahidələr göstərir ki, onlar məktəbə gələnədək dilimizin qrammatik quruluşuna yiyələnir, ... müəyyən söz ehtiyatına malik olur, başqalarının nitqini başa düşür, öz fikrini ifadə etməyi bacarır."(2, s. 356)

İstər ənənəvi, istərsə də müasir interaktiv metodlar ibtidai sinif müəllimlərindən tələb edir ki, onlar şagirdlərin hələ məktəbəqədər əldə etdiyi söz ehtiyatını daha da zənginləşdirsinlər, onların leksikasına daxil olan sözlərin dəqiqləşməsinə fikir versinlər.

"İnteraktiv kurikulum: mahiyyəti və nümunələr" adlı metodik vəsaitdə nəticəyə əsaslanan təlim, həmçinin fənlərarası və fənndaxili inteqrasiyanın aydınlaşdırılması, onun prespektivlərinə xüsusi diqqət yetirilir. Burada amerikalı alim Hamfreyzin aşağıdakı fikri verilir:" interaktiv öyrənmə - şagirdlərin ətraf mühitin müəyyən aspektlərini müxtəlif fənlərə aid olan biliklər vasitəsilə geniş araşdırmasıdır."(3, s. 20)

Bu fikirlər bizim görkəmli metodist alimlərimiz A. Abdullayev, Y. Kərimov, H. Balıyevin fikirləri ilə uzlaşır, lakin bizim metodistlərimiz bu fikirləri hələ XX əsrin 40 – 50-ci illərində söyləmişlər.

Həmin vəsaitdə çoxfənli, fənlərarası, fəndən fənnə keçən inteqrasiya ilə yanaşı, fəndaxili, yəni mövzudan mövzuya keçən inteqrasiyadan - əlaqədən də bəhs olunur.

Bütün bunlar bizim mövzumuzla bağlıdır və "Azərbaycan Respublikasında ümumtəhsilin

dövlət standartları və proqramları (kurikukumları)" sənədində öz əksini tapmışdır.

Şagird I sinfə müəyyən nitq bacarıqları ilə gəlir. O, ana dilinin köməyilə ətraf aləm haqqında müəyyən təsəvvürlər əldə edir. Bu onun lüğət ehtiyatını zənginləşdirir, dəqiqləşdirir, əşya və hadisələr haqqında fikirlərini formalaşdırır, o, başqalarının dediklərini başa düşməyə çalışır və öz fikrini, arzu və istəyini nitq vasitəsilə qarşı tərəfə çatdırır. Məktəbdə nitq inkişafı üzrə iş sistemli, ardıcıl, mütəşəkkil davam etdirilir. Dilin mövcudluq forması olan nitq fəaliyyəti danışma, dinləmə, yazı və oxu proseslərini birləşdirir. Buna görə də nitq daha çox şifahi və yazılı, monoloji və dialoji, zahiri və daxili növlərə bölünür ki, məktəbdə bu nitq növlərinin hər birinin inkişaf etdirilməsi qayğısına qalınır. Nəticədə Azərbaycan dili düşünmə, dinləmə, danışma vasitəsinə çevrilir.

Şagirdlər Azərbaycan dili fənni vasitəsilə milli mədəniyyət nümunəsi kimi ana dilini öyrənir, onun səs sisteminə, lüğət ehtiyatına, üslubi – qrammatik xüsusiyyətlərinə yaxından bələd olur, elmi, bədii, publisistik və digər üslublarda yaradılmış bədii ədəbiyyat nümunələri ilə tanış olmaq imkanı qazanırlar. Bədii, elmi, kütləvi, publisistik əsərlərin müntəzəm mütaliəsi şagirdlərin söz ehtiyatını artırır, qeyri-fəal lüğəti fəal lüğətə çevirir, zənginləşdirir.

İbtidai siniflərdə şagirdlərin nitqində fəal və qeyri-fəal lüğətin öyrənilməsi müəllimin diqqət mərkəzində olmalı və hər bir mövzunun tədrisində bu istiqamətdə işlərin təşkilinə vaxt ayırmalı, aşağıdakı məsələlər öz əksini tapmalıdır:

*şagirdlərin tədris olunan mövzunu mənimsəmə imkanları;

*dərsliyin həmin mövzu üzrə leksik bazası;

*sözlərin mənasını başa düşməyin düzgünlüyü dərəcəsi;

*dərslikdə həmin mövzu üzrə çalışmaların xarakteri və sistemi;

*həmin mövzunun tamamlanmasını tələb edən məsələlər;

*həmin mövzu ilə əlaqədar şagirdlərin öyrənməli olduqları yeni sözlər;

*mövzu üzrə lüğət işinin səmərəli keçməsini təmin edən sistem.

Öyrənilən səsin sözün əvvəlində, ortasında və axırında tapılması ilə əlaqədar axtarıcılıq nəticəsində şagirdlərin lüğətinə yeni-yeni sözlər daxil olur. Savad təliminə hazırlıq dövrünə aid şəkilli səhifələrdə dərs ləvazimatı, heyvanlar aləmi, tarlada, bağda görülən işlər, musiqi alətləri, ailə, məktəb, sinif, müəllim və digər mövzular üzrə şagirdlərin lüğətinə xeyli söz daxil olur. Savad təlimi dövründə bu söz və ifadələrin dəfələrlə işlədilməsi və müəllimin yaradıcı işi bu sözlərin fəal nitqə daxil olmasına şərait yaradır.

İbtidai siniflərdə şagirdlərin nitqinin inkişafında lüğət üzrə iş xüsusi yer tutur və bura:

1. Şagirdlərin lüğət ehtiyatına yiyələnmələri;

2.Yeni sözün mənası üzrə iş;

3. Sözün mənasının dəqiqləşdirilməsi üzrə iş;

4. Lüğətin fəallaşdırılması üzrə iş;

5.Lüğətin təmizliyi üzrə iş;

6.Lüğəvi səhvlər üzrə iş və s. daxildir.

Lüğət üzrə aparılan işlər müəyyən tələblərə cavab verməlidir:

1. Lüğət üzrə iş nitq inkişafının digər sahələri ilə əlaqəli aparılmalıdır.

2. Lüğət işini yalnız Azərbaycan dili dərsləri ilə məhdudlaşdırmaq olmaz.

3. Lüğət üzrə iş zamanı fəal/interaktiv təlim metod və texnikalarından istifadə olunmalıdır.

4. Lüğət üzrə iş ətraf aləm, təbiət və cəmiyyətdə baş verən hadisələri dərk etməyə kömək etməlidir.

5. Lüğət üzrə işin aparılmasına valideynlər də kömək etməlidir.

Lüğət üzrə iş apararkən müəllim şagirdlərin inkişafına uyğun didaktik material seçməli, təlim texnikalarını mürəkkəbləşdirməli, fəal təlim üsullarından istifadə etməklə onların nitqini inkişaf etdirməli və müstəqil fəaliyyətə hazırlamalıdır.

İbtidai siniflərdə müəllimin fəaliyyəti onun yetişdirdiyi şagirdlərin nitq bacarıq və vərdişlərinin, nitq mədəniyyətinin səviyyəsi ilə ölçülür. Dil qaydaları isə nitq inkişafı üzrə işin təşkilinə, nitq mədəniyyətinin formalaşmasına xidmət edir. Dil qaydaları şagirdlərin şifahi və yazılı nitq bacarıqlarının formalaşmasında mühüm rol oynayan ən zəruri linqvistik biliklərin

öyrənilməsini, mədəni nitq üçün vacib sayılan mühüm tələblərin qavranılmasını, ədəbi dilin funksional və fərdi üslublarının səciyyəvi xüsusiyyətlərinin dərk olunaraq fərqləndirilməsini və təcrübədə tətbiqini təmin edir.

İbtidai siniflərdə elə ilk gündən şagirdlərin nitqi izlənilir, müşahidə edilir, nöqsanlar müəyyənləşdirilir və qüsurların aradan qaldırılması yolları araşdırılır. Bu, şagirdin dil qaydalarını – fonetika, orfoepiya, orfoqrafiya, leksika, morfologiya və sintaksisə dair müəyyən həcmdə bilikləri mənimsəməsindən sonra asanlaşır. İbtidai siniflərdə dil qaydaları ilə əlaqəli nitq inkişafı üzrə aparılacaq işlər təxminən belə müəyyənləşdirilməlidir:

*nitq hissələri vasitəsilə şagirdlərin lüğət ehtiyatının zənginləşdirilməsi;

*nitq hissələri vasitəsilə şagirdlərin oxu vərdişlərinin təkmilləşdirilməsi;

*intonasiya və vurğu bacarıqlarına diqqət yetirilməsi;

*orfoepik vərdişlərin təkmilləşdirilməsi;

*rabitəli nitq bacarıqlarının inkişaf etdirilməsi;

*ifadə mətnləri üzrə nitq bacarıqlarının inkişaf etdirilməsi;

*inşa mətnləri üzrə nitq bacarıqlarının inkişaf etdirilməsi. (4, s. 120)

Dil qaydalarının tədrisi prosesində fonetik-orfoepik, fonetik-orfoqrafik, fonetik-leksik, lüğət-məntiqi, leksik-qrammatik, leksik-morfoloji, leksik-sintaktik çalışmalardan istifadə olunması nitq inkişafı üzrə işin təşkilində mühüm yer tutur. Bu prosesdə müvafiq çalışmalar üzrə iş şagirdlərin fəallığını artırır.

Beləliklə, qarşımızda əsas məqsəd şagirdlərdə fikirlərini şifahi və yazılı formada düzgün, aydın, səlis, canlı və anlaşıqlı, məntiqli şəkildə ifadə edə bilmək bacarıq və vərdişlərinin formalaşdırılmasıdır. Bu baxımdan, Azərbaycan dilinin ən zəruri məsələləri nitq bacarıqları ilə əlaqələndirilir, gündəlik həyati əhəmiyyət daşıyan cəhətlər şagirdlərin nitq vərdişlərinin yüksəldilməsində fəal iştirak edir.

**Problemin elmi yeniliyi.** Məqalədə ibtidai siniflərdə nitq bacarıqlarının formalaşdırılmasında fəndaxili inteqrasiyanın rolunun və tədris prosesində yaranan problemlər, onların aradan qaldırılması yolları göstərilmişdir.

**Problemin aktuallığı.** İbtidai məktəbin qarşısında duran ən mühüm vəzifələrdən biri uşaqlarda şifahi və yazılı formada ədəbi dil normalarına uyğun, məntiqli, rabitəli, ifadəli nitq bacarıq və vərdişlərinin formalaşdırılmasıdır. Bu məsələ cəmiyyət üçün hər zaman aktualdır.

**Problemin praktik əhəmiyyəti.** Uşaqlarda düzgün nitq bacarıq və vərdişlərinə yiyələnməsində ibtidai sinif müəllimlərinə kömək edəcək tövsiyələr verilmisdir.

**Ədəbiyyat:**

1. Ümumtəhsil məktəblərinin I–IV siniflər üçün fənn kurikulumları. -Bakı, 2008.
2. Kərimov Y.Ş. Ana dilinin tədrisi metodikası. / Y.Ş. Kərimov. – Bakı, 2000 . -356 s.
3. Kərimova, F. Əhmədova, M. Reyli Ə. İnteraktiv kurikulum: mahiyyəti və nümunələr. -Bakı, 2006. – 20 s.
4. Cəfərova N. Nitq inkişafı üzrə işin metodikası. -Bakı, 2018. -64 s. -120 s.
5. Kərimov Y.Ş. İbtidai təlim., problemlər, vəzifələr. -Bakı, 2000.
6. Ağayev Ə.Ə. Təlim prosesi, ənənə və müasirlik. -Bakı: Adiloğlu, - 2006.

**E-mail:** ruqiyye.babashova@bk.ru

**Redaksiyaya daxil olub:**27.05.2024

*UOT 37.0*

***Cənanə Şahverdi qızı Eminova***
*Gəncə Dövlət Universitetinin fəlsəfə doktoru proqramı üzrə dissertantı*
https://orcid.org/0009-0006-7289-4148
https://doi.org/10.69682/azrt.2024.91(3).172-176

# AUDİTORİYADANKƏNAR TƏDBİRLƏRDƏ TƏLƏBƏLƏRİN İDEYA-SİYASİ TƏRBİYƏSİNİ FORMALAŞDIRMAĞIN PSİXOLOJİ ƏSASLARI

***Джанана Шахверди гызы Эминова***
*диссертант по программе доктора философии*
*Гянджинского Государственного Университета*

# ПСИХОЛОГИЧЕСКИЕ ОСНОВЫ ФОРМИРОВАНИЯ ИДЕЙНО-ПОЛИТИЧЕСКОГО ВОСПИТАНИЯ СТУДЕНТОВ НА ВНЕАУДИТОРНЫХ МЕРОПРИЯТИЯХ

***Janana Shahverdi Eminova***
*doctoral student in the program of doctor of philosophy*
*of Ganja State University*

# PSYCHOLOGICAL FOUNDATIONS OF FORMATION OF IDEAL AND POLITICAL EDUCATION OF STUDENTS DURING EXTRA-CURRICULUM ACTIVITIES

**Xülasə.** Məqalədə ali məktəblərin auditoriyadankənar tədbirlərində tələbələrin ideya-siyasi tərbiyəsini formalaşdırmağın psixoloji əsaslarının düzgün müəyyənləşdirilməsi məsələləri öz əksini tapır. Məqalədə tələbələrin ideya-siyasi tərbiyəsini formalaşdırmağa xidmət edən psixoloji əsasların ümumi sistemi haqqında məlumat verilir. Məqalədə ideya-siyasi tərbiyə ilə bağlı əsil həqiqətlərin duyulması, qavranılması, hafizədə saxlanılması, təxəyyül və təfəkkür süzgəcindən keçirilərək nitq vasitəsilə ideya-siyasi məzmunda əsaslandırılması ilə bağlı elmi ideyalar irəli sürülür. Məqalədə qavrayışın sabitlik, tamlıq, seçicilik, predmetlilik (əşyavilik), appersevsiya (insanın əvvəlki təcrübəsinə əsaslanması) və mənalılıq kimi psixoloji xassələri haqqında da məlumat verilir.
***Açar sözlər:*** *auditoriyadankənar tədbirlər, tələbə təşkilatları, ideya-siyasi tərbiyə, psixoloji əsaslar, psixoloji xassələr, siyasi qabiliyyətlər, siyasi motivlər, maraq kursları, dövlət maraqları, dövlət rəhbərlərinə ehtiram*

**Резюме.** В статье отражены вопросы правильного определения психологической основы формирования идейно-политического воспитания студентов во время проведения внеаудиторных мероприятий. В статье отражена общая система психологических основ, служащих формированию идейно-политического воспитания студенческой молодежи. В статье выдвигаются научные идеи, связанные со слухом, восприятием, запоминанием реальных истин об идейно-политическом воспитании, фильтрацией их посредством воображения и мышления и обосновыванием в идейно-политическом содержании посредством речи. В статье также приводятся сведения о психологических свойствах восприятия, таких как устойчивость, полнота, избирательность, объективность, апперцепция (на основе предыдущего опыта человека), смысл.
***Ключевые слова:*** *внеаудиторные мероприятия, студенческие организации, идейно-политическое воспитание, психологические основы, устойчивость, избирательность, политические способности, политические мотивы, курсы по интересам, государственные интересы, уважение к государственным деятелям*

**Summary.** The article reflects the issues of correctly determining the psychological basis for the formation of ideological and political education of students in extracurricular activities of universities. The

article reflects the general system of psychological bases that serve to form the ideological and political education of students. The article puts forward scientific ideas related to hearing, perceiving, remembering the real truths about ideological and political education, filtering them through imagination and thinking and substantiating them in ideological and political content through speech. The article also provides information about the psychological properties of perception, such as stability, completeness, selectivity, objectivity, apperception (based on previous human experience), meaning.

***Keywords:*** *extracurricular activities, student organizations, ideological and political education, psychological foundations, stability, selectivity, political abilities, political motives, interest courses, state interests, respect for state leaders*

Ölkəmizdə həyata keçirilən direktiv sənədlərdə tələbələrin ideya-siyasi tərbiyəsinin günün tələbləri səviyyəsində inkişaf etdirilməsi bu sahədə çalışan mütəxəssislər qarşısında təxirəsalınmaz vəzifələr qoyulur. Bu vəzifələrin müvəffəqiyyətlə həyata keçirilməsindən ötrü ali məktəblərin auditoriyadankənar tədbirlərində tələbələrin ideya-siyasi tərbiyəsini günün tələbləri səviyyəsində inkişaf etdirmək, formalaşdırmaq, onları siyasi fəaliyyətə istiqamətləndirmək mühüm aktuallıq kəsb edir. Çünki tələbələrin Azərbaycan dövlətçiliyinə, sərhədlərinin bütövlüyünə, ərazi bütövlüyünün toxunulmazlığına, habelə dövlət rəhbərlərinə, dövlət rəmzlərinə və azərbaycançılıq məfkurəsinə hörmət hisslərinin aşılanması mühüm aktuallıq kəsb edir. Bunun üçün tələbələrin ideya-siyasi tərbiyəsinin formalaşdırılması işinin psixoloji əsaslarının düzgün müəyyənləşdirilməsi vacib hesab olunur.

Auditoriyadankənar tədbirlərdə tələbələrin ideya-siyasi tərbiyəsinin formalaşdırılması prosesində onların psixoloji inkişafının təmin edilməsi üçün müəyyən psixoloji əsasların da müəyyənləşdirilməsinə zəruri ehtiyac duyulur. Məhz ona görə də tələbələrin ideya-siyasi tərbiyəsinin formalaşdırılması zamanı bu işin psixoloji əsaslarının müəyyənləşdirilməsi üçün məqsədyönlü, planlı fəaliyyət istiqamətlərinin hazırlanaraq həyata keçirilməsi vacib hesab olunur. Məlum olduğu üzrə tələbələrin auditoriyadankənar tədbirlərə cəlb olunması və bu prosesdə onların ideya-siyasi tərbiyəsinin formalaşdırılması işinə psixoloji cəhətdən düzgün yanaşılması əsas amillərdən hesab olunur. Çünki tələbələr öz ideya fəallıqlarını, milli mənliyini, mənlik şüurunu, ideya-siyasi istiqamətdə mövcud görəcəkləri işlərin motivlərini duyub qavramaları, hafizələrində saxlamaları. təxəyyül və təfəkkür süzgəclərindən keçirərək normal ifadə etmələri, yəni ifadəli nitqləri ilə ifadə etmələri bu sahədə görülən işlərin əsas məzmununu təşkil edir.

Elmi ədəbiyyatda göstərilir ki, insanı əhatə edən maddi qıcıqlandırıcıların müvafiq reseptorlara təsiri nəticəsində maddi aləmin cisim və ayrı-ayrı xassələrinin, eləcə də insanın daxili aləminin əks olunması kimi psixi prosesdə insan bütün hadisələrə, o cümlədən siyasi hadisələrə, siyasi motivlərə, tərbiyəvi təsirlərə reaksiya verir, onları duyur və qavrayır. (8, s. 367).

Psixoloji ədəbiyyatda göstərilir ki, insan duyğularına əsaslanan qavrayışın bir sıra xüsusi xassələri vardır. Onların içərisində sabitlik, tamlıq, seçicilik, predmetlilik, əşyavilik, appersepsiya və mənalılıq kimi psixi xassələr mövcuddur.

Sabitlik - fiziki xassələrinin insanın mövcud bilikləri əsasında ona məlum olan digər mövzularla əlaqədar olan bir xüsusiyyətdir. Sabitlik qavranılan obyektin forma rənginin, mənasının dəyişilməsi zamanı belə obyektin özünün dəyişilməməsini təmin edir. Məsələn, uzaqda olan maşının daha kiçik, yaxında olanın isə daha böyük ölçüdə görünməsinə baxmayaraq, insan onların hər ikisini demək olar ki, eyni cür qavrayır (10, s. 104). Auditoriyadankənar tədbirlərdə ideya-siyasi tərbiyə ilə bağlı verilən biliklərin əsasında mövzuların konkretliyi, yığcamlığı və sabitliyi psixoloji cəhətdən mühüm əhəmiyyət kəsb edir. Ona görə ki, ideya-siyasi tərbiyə ilə bağlı tələbələrə milli ideologiya ilə bağlı verilən məlumatların sabitliyi və tamlığı vacib hesab olunur. Ona görə ki, ideya-siyasi tərbiyə ilə bağlı olan belə biliklər sistemdəki çatışmazlıqlar tələbələri psixoloji cəhətdən narahat edir. Bu zaman onların daxili aləmi belə çatışmazlıqları aradan qaldırmağa və fikri tamamlamağa təhrik edir. İdeya-siyasi tərbiyə ilə bağlı əsas məqsədlərin müəyyənləşdirilməsi tələbələrin marağına səbəb olur. Bu zaman onların seçicilik xüsusiyyəti mühüm rol oynayır.

Seçicilik - bu insanın yalnız onun üçün maraq kəsb edən obyektləri qavrama xüsusiyyətidir. Bu xüsusiyyət maraqdan, obyektin quru-

luşundan və şəxsiyyətin tələbatlarından asılıdır (10, s. 104). Deməli, ideya-siyasi tərbiyə işlərinə maraq göstərən tələbələrin hansı obyektə hansı məqsədlə istiqamət almaları onların diqqət mərkəzində olur. Bu zaman onların tələbatları özünü göstərməyə başlayır. Siyasi fəallıqlara olan tələbatlar tələbələrin ideya-siyasi tərbiyəsinin formalaşdırılmasına təsir edən başlıca amillər kimi özünü göstərir.

Şəxsiyyətin fəaliyyətinin mənbəyini onun tələbatı təşkil edir. Məhz tələbat insanı müəyyən surətdə və müəyyən istiqamətdə iş görməyə təhrik edir. Tələbat şəxsiyyətin halıti olub, onun konkret varlıq şəraitindən asılılığını ifadə edir. Tələbat şəxsiyyətin fəallığının mənbəyi kimi meydana çıxır (13, s. 109). Deməli, tələbatlar auditoriyadankənar tədbirlərdə tələbələri müəyyən istiqamətlərdə iş görməyə təhrik edir. Tələbatlar tələbə şəxsiyyətinin fəallığının mənbəyi kimi qabağa çıxır. Bu zaman auditoriyadankənar tədbirlərdə tələbələrin ideya-siyasi fəaliyyətə istiqamət almaları onların siyasi fəallıqlarının əsas mənbəyi kimi təzahür edir.

İdeya-siyasi tərbiyə fonunda tələbələrin öz məqsədləri ilə bağlı düzgün seçim etmələri, həmin məqsədlərə uyğun vəzifələrin düzgün müəyyənləşdirilməsinə riayət etmələri, bu zaman appersepsiya gözləmələri, yəni əvvəlki mövqelərinə əsaslanmaları, bu mövqelərini müdafiə etmələri mühüm əhəmiyyət kəsb edir. Çünki qeyd olunanlar tələbələrin ideya-siyasi tərbiyəsinin formalaşması üçün mühüm psixoloji amillər hesab olunur. Ona görə ki, bunlar tələbələrin psixoloji inkişafını təmin etmiş olur.

Auditoriyadankənar tədbirlərdə tələbələrin ideya-siyasi tərbiyəsinin formalaşdırılması işinə təsir edən psixoloji xüsusiyyətlərdən biri də təxəyyül hesab olunur. İdeya-siyasi tərbiyə ilə bağlı tədbirlərdə ədəbiyyat nümunələri, incəsənət əsərləri, musiqi nümunələri, teatr tamaşaları və s. bu kimi bədii yaradıcılıq istiqamətində həyata keçirilən işlər prosesində tələbələrin təxəyyül səviyyəsinin inkişaf etdirilməsinə diqqət yetirilməsi faydalı hesab olunur. Çünki belə tədbirlərdə tələbələr özləri də ədəbi-bədii nümunələrdən, o cümlədən şeirlərdən, hekayələrdən, mənzumələrdən, nəsir nümunələrindən, mahnılardan, xor və dram əsərlərindən, portretlərdən və s bu kimi bədii yaradıcılıq nümunələrindən həm istifadə edirlər, həm də bu nümunələrin müəllifləri kimi çıxış edirlər. Məhz belə bir təqdirdə tələbələrin təxəyyül səviyyələrinin inkişafı ilə bağlı məqsədyönlü işlərin aparılması vacib sayılır.

Tələbələrin ideya-siyasi tərbiyəsinin formalaşdırılmasında onların siyasi qab-iliyyətlərinin olması əsas amillərdən sayılır.

Ümumiyyətlə desək qabiliyyətlər fəaliyyətin müvəffəqiyyətli icrasının əsas şərtini təşkil edir və onun üçün zəruri sayılan bilik, bacarıq və vərdişlərə yiyələnmə dinamikasında təzahür edir.

Qabiliyyətlərin insanda necə yaranması mübahisəli bir məsələ kimi daima diqqəti cəlb etmişdir. Artıq psixologiyada belə bir fikir əsaslandırılmışdır ki, şəxsiyyətin bütün başqa fərdi-psixi xassələri kimi qabiliyyətlər də insan tərəfindən hazır şəkildə, təbiətin ona verdiyi fitri, anadangəlmə bir şey kimi əldə edilmir, həyat və fəaliyyətdə formalaşır. Bununla belə qabiliyyətlərin fitriliyini inkar etmək heç də mütləq səciyyə daşımır. Psixologiyada belə bir müddəa əsas götürülür ki, insan hər hansı bir fəaliyyət sahəsində müvafiq qabiliyyətlərə yiyələnmək üçün zəruri olan təbii imkanlarla doğulur. Bu imkanlar qabiliyyətlərin inkişafının təbii ilkin şərtləri kimi özünü göstərir (11, s. 430). Siyasi qabi-liyyətlər də bir imkan olaraq özünü göstərir. Tələbələrdə bu imkanlar qabiliyyətlərin inkişafına öz dinamik təsirini göstərmiş olur. Tələbə gənclərin bütün qabiliyyətləri onların tərbiyəlilik səviyyəsini yüksəltmiş olur. Belə qabiliyyətlər içərisində ümumi qabiliyyətlərlə yanaşı, xüsusi qabiliyyətlərin olmasını da qeyd etmək lazımdır.

Ümumi qabiliyyətlər bədii yaradıcılıq prosesində, fiziki tərbiyə və idman sahəsində özlərini mütəmadi olaraq göstərdiyi hallarda xüsusi qabiliyyətlər özlərini çox vaxt nadir hallarda göstərmiş olur.

Həyati faktlardan məlum olduğu kimi, hər hansı bir fəaliyyətin müvəffəqiyyətlə yerinə yetirilməsi üçün insanda qabiliyyətlərin həm ümumi, həm də xüsusi növlərinin formalaşması zəruridir. Əksər tədqiqatçıların fikrincə ümumi və xüsusi qabiliyyətlər bir-biri ilə ziddiyyət təşkil etmirlər. Onlar birgə mövcud olmaqla bir-birini tamamlayır, fəaliyyətin müvəffəqiyyətini təmin edirlər. Bəzi mütəxəssislərin fikrincə ümumi qabiliyyətlər xüsusi qabiliyyətlərin inkişafı üçün baza rolunu oynayırlar. Xüsusi qabiliyyətlər, alimlərin fikrincə, «ancaq və ancaq bir yolla

- ümumi qabiliyyətlərin fəaliyyət prosesində xüsusi qabiliyyətlərə modifikasiya yolu ilə» əmələ gəlir (11, s. 427).

Tələbələrin siyasi fəaliyyətə meyil etmələri, maraq göstərmələri onlarda siyasi qabiliyyətlərin inkişafına və formalaşmasına səbəb olur. Tələbələrin dövlətin ərazi bütövlüyünə, sərhədlərinin toxunulmazlığını qorumağa, dövlət rəmzlərinə, dövlət rəhbərlərinə və azərbaycançılıq məfkurəsinə olan hörmət və ehtiram hisslərinin coşması və fəaliyyətin müvəffəqiyyətli icrası üçün zəruri sayılan xüsusi qabiliyyətlərin aşkara çıxmasına zəmin yaradır.

Xüsusi qabiliyyətlər insanın hər hansı bir spesifik fəaliyyət növünü müvəffəqiyyətlə yerinə yetirməsi üçün zəruri olan qabiliyyətlərdir. Bu cür qabiliyyətlərə musiqi, riyazi, linqvistik, texniki, ədəbi, idman və s. qabiliyyətləri aid etmək olar. Adətən, xüsusi qabiliyyətlər insanda müvafiq təbii imkanların olması zəruridir. Adətən ədəbi yaradıcılıq fəaliyyəti üçün poetik görmə, söz ehtiyatı və ifadəli nitq, söz assosiasiyalarının zənginliyi, obrazlı təfəkkür, surət hafizəsi, yaradıcı təxəyyül və s. xüsusi qabiliyyətlər kimi qeyd etmək olar (11, s. 427). Unutmaq olmaz ki, ideya-siyasi tərbiyə ilə bağlı olan qabiliyyətlər içərisində söz ehtiyatlarının, ifadəli nitqin, söz assosiasiyalarının zənginliyinin, spontan nitqin, möhkəm iradənin olması zəruri sayılır. Belə zəruri imkanların reallaşması nümunəvi siyasi ünsiyyətin inkişafına yol açır. Məhz belə olan təqdirdə tələbələrin ideya-siyasi tərbiyəsinin formalaşması imkanlarının dinamik inkişafına şərait yaranır.

Qabiliyyət və irsiyyət problemi mütəxəssislərin diqqətini cəlb edən problemlərdən biri olmuşdur. Qabiliyyətlərin təbii ilkin şərtləri olan təbii imkanların bütün digər morfoloji və fizioloji keyfiyyətlər kimi, ümumi genetik qanunlara tabe olduğu qeyd olunur. Lakin təbii imkanların irsən keçməsinin mümkün olması fikrini qabiliyyətlərin irsiliyi ideyası ilə eyniləşdirmək olmaz. Bu problemin öyrənilməsi ilə mütəxəssislər məşğul olmuşlar. 1875-ci ildə ingilis antropoloqu və psixoloqu F. Haltonun «Talantın irsiliyi onun qanunları və nəticələri» adlı kitabı nəşr olunmuşdur. Müəllif bir neçə görkəmli şəxsiyyətin qohumluq əlaqələrini öyrənərək belə bir nəticəyə gəlmişdir ki, talant ya ata, ya da ana xətti ilə nəsildən nəslə keçir. Lakin Haltonun gəldiyi nəticələr elmi mötəbərliyə malik deyildir. O, öz fikrini əsaslandırmaq üçün heç bir elmi dəlil gətirə bilməmişdir. Bununla belə mütəxəssislər belə bir fikrə gəlmişlər ki, əksər hallarda görkəmli şəxsiyyətlərin nəsil ağacının öyrənilməsi bioloji irsiyyət deyil, həyat şəraitinin, qabiliyyətlərin inkişafı üçün zəruri olan əlverişli ictimai şəraitin irsi xarakter daşımasını sübut edir (11, s. 432). Deməli ünsiyyət qabiliyyətlərinin ideya-siyasi tərbiyəsinin formalaşmasının əsas amillərindən biri kimi özünü göstərməsini təbii hal kimi dəyərləndirmək olar. Bu zaman ideya-siyasi tərbiyə qabiliyyətlərinin təzahür etməsində özünü göstərən amillərin olmasını da qeyd etmək lazım gəlir. Bu amillər içərisində ideya-siyasi qabiliyyətlərin formalaşmasına öz dinamik təsirini göstərən təlim amilidir. Deməli qabiliyyətlərin formalaşmasında ən önəmli rolu təlim oynayır.

Təbii imkanlardan danışarkən qeyd olunduğu kimi, qabiliyyətlərin inkişafı müxtəlif adamlarda heç də eyni cür olmayan təbii ilkin şərtlərdən asılı olsa da, qabiliyyətlər daha çox bəşər tarixinin məhsuludur. İnsan bəşəriyyətin əldə etdiyi təcrübəni, bilik sərvətlərini mənimsəmədən müvafiq qabiliyyətlərə yiyələnməsi mümkün deyildir. Bunun üçünsə təlim xüsusi yer tutur. İnsanlar təlim prosesində tarixən əldə edilmiş nailiyyətlərə yiyələnməklə, öz qabiliyyətlərini formalaşdırırlar. A.V. Petrovski və M.Q. Yaraşevskinin qeyd etdikləri kimi «qabiliyyətlərin təzahürü insanların tarixən ictimai tələbatlara cavab vermək məqsədilə əldə etdikləri müvafiq bilik, bacarıq və vərdişlərin formalaşmasının konkret iş pryomlarından (metodikadan) bilavasitə asılıdır» (11, s. 433). Məhz ona görə də auditoriyadankənar tədbirlərdə tələbələrin ideya-siyasi tərbiyəsinin formalaşması işinin məqsədyönlü təşkili üçün təlim xarakterli işlərin aparılması ən mühüm şərtlərdən hesab olunur. Tutaq ki, auditoriyadankənar tədbirlərin ən populyar növlərindən biri olan "Maraq kursları"nda tələbələrə maraq göstərdikləri hər hansı tələbələrin ideya-siyasi tərbiyəsinin formalaşmasına təsir göstərən tədbirlərin hazırlanması işində tələbələrə bu sahədə biliklərin verilməsi məqsədəmüvafiq hesab edilir. Deməli auditoriyadankənar tədbirlərdə tələbələrin ideya-siyasi tərbiyəsinin formalaşdırılmasında təlim işlərinin məqsədyönlü şəkildə təşkil edilməsi vacib şərt-

lərdən hesab olunur. Əslində ideya-siyasi tərbiyə işlərinin təşkilində təbii imkanların olması tələbələrin siyasi qabiliyyətlərinin, milli mənlik şüurunun inkişaf etməsi, dövlətin ərazi bütövlüyünün, sərhədlərinin toxunulmazlığının göz bəbəyi kimi qorunması, ölkə prezidentinə hədsiz hörmət və ehtiramın göstərilməsi fonunda özünü daha bariz şəkildə göstərir. Onu da qeyd etmək lazımdır ki, qabiliyyətlərin digər psixi hadisələrdən fərqləndirici xüsusiyyəti onun təbii imkanlarla sıx bağlı olmasından ibarətdir. Lakin nəzərə almaq lazımdır ki, hər bir təbii imkanın qabiliyyətə çevrilməsi böyük inkişaf yolu keçməli olur. Həyati faktlar göstərir ki, insan qabiliyyətlərinin bir çoxunda bu inkişaf həyatın ilk günlərindən başlayır, müvafiq qabiliyyətlər dayanmadan inkişaf edir. Qabiliyyətlərin inkişaf prosesini bir neçə mərhələyə ayırmaq mümkündür. Bu mərhələlərin bəzilərində gələcək qabiliyyətin anatomik-fizioloji əsasına hazırlıq baş verir, digər mərhələdə isə təbii imkanların qeyri bioloji planda formalaşması, üçüncü mərhələdə isə zəruri qabiliyyət müvafiq səviyyəyə çatması baş verir. Bütün bu proseslər paralel şəkildə cərəyan edə, bu və digər şəkildə bir birinin üzərinə düşə, bir-birini tamamlaya bilər (11, səh. 435). Məhz ona görə də tələbələrin siyasi qabiliyyətlərini onların digər növ qabiliyyətlərindən fərqli olaraq inkişaf etdirmək çox faydalıdır. Ona görə ki, tələbələrin siyasi qabiliyyətlərinin inkişafı onların ideya-siyasi tərbiyəsinin formalaşdırılmasına öz dinamik təsirini göstərir.

Bütün bunlar deməyə əsas verir ki, auditoriyadankənar tədbirlərdə tələbələrin ideya-siyasi tərbiyəsinin formalaşdırılması işində müəyyən psixoloji əsasların müəyyənləşdirilərək tətbiq edilməsi tələbələrin ideya-siyasi tərbiyəsi ilə yanaşı onların asudə vaxtlarının düzgün təşkili, ümumi dünyagörüşlərinin yüksəldilməsi və estetik-bədii zövqlərinin formalaşdırılması baxımından mühüm əhəmiyyət kəsb edir.

**Problemin elmi yeniliyi.** Məqalədə ali məktəblərin auditoriyadankənar tədbirlərində tələbələrin ideya-siyasi tərbiyəsinin psixoloji əsaslarının düzgün müəyyənləşdirilməsi ilə, eləcə də onların milli mənlik şüuruna, dövlət müstəqilliyinə, ərazi bütövlüyünə, sərhədlərinin toxunulmazlığına, dövlət atributlarına və rəhbərlərinə olan hisslərinin oyadılması, artırılması və yüksəldilməsi ilə bağlı yeni elmi ideyalar irəli sürülür. Bunlar məqalənin elmi yenilikləridir.

**Problemin praktik əhəmiyyəti və tətbiqi**. Məqalədən ali məktəblərin tərbiyə işlərinə rəhbərlik edən prorektorlar, həmkarlar təşkilatlarının nümayəndələri, tələbə təşkilatlarının üzvləri, habelə bu sahədə tədqiqat aparanlar istifadə edərək faydalana bilərlər.

**Nəticə** etibarilə qeyd etməliyik ki, auditoriyadankənar tədbirlərdə tələbələrin ideya-siyasi tərbiyəsinin formalaşdırılması işinin gücləndirilməsindən ötrü bu işin pedaqoji-psixoloji əsaslarının müəyyənləşdirilməsi haqqında danışılan problemin günün tələbləri səviyyəsində həll edilməsini stimullaşdırmış olur.

**Ədəbiyyat:**

1. Azərbaycan milli izahlı ensiklopedik pedaqoji lüğət. −Bakı: “OKA Ofset” nəşriyyatı, −2005.
2. Bayramov, Ə.S. Sosial psixologiya (Dərslik). / Ə.S. Bayramov, Ə.Ə. Əlizadə– Bakı: “Qapp-Poliqraf” korporasiyası, - 2003.
3. Xəlilov, S. Heydər Əliyev və azərbaycançılıq məfkürəsi (müəllif-tərtibatçı), / S. Xəlilov −Bakı:- Azərbaycan Universitetinin nəşriyyatı, - 2002.
4. Kazımov, N.M. Ali məktəb pedaqogikası / N.M. Kazımov −Bakı: Çaşıoğlu, - −2011.
5. İmanov, C.C. Dəmir yumruq. / C.C. İmanov - Bakı: Zəka Print Yayımları, - 2022.
6. Rüstəmov, F.A. Ali məktəb pedaqogikası. Magistratura pilləsi üçün dərslik. / F.A. Rüstəmov, T.Y. Dadaşova - Bakı: Nurlan, - 2007.
7. Sadıqov, F.B. Pedaqogika. Dərs vəsaiti / F.B. Sadıqov.- Bakı: Adiloğlu,-2012.
8. Sadıqov, F.B. Ümumi pedaqogika. Dərs vəsaiti, / F.B. Sadıqov.- Bakı: Maarif, -2018.
9. Sadıqov, F.B. Ali məktəb pedaqogikası. Dərs vəsaiti. / F.B. Sadıqov, A.M. Mövsümlü– Bakı: Gənclik, - 2021.
10. Salamova K. Ümumi psixologiya. −Sumqayıt, 2016.
11. Seyidov, S.İ. Psixologiya (Ali pedaqoji məktəblərin bakalavr pilləsi tələbələri üçün dərslik), / S.İ. Seyidov, M.Ə. Həmzəyev - Bakı: Nurlan, - 2007.
12. Şirəliyev, H. Politologiya. (Dördüncü nəşr), / H. Şirəliyev, Ə. Əhmədov. - Bakı: Gənclik, - 2021
13. Ümumi psixologiya. (Petrovskinin redaktorluğu ilə). −Moskva, 1977.

**E-mail:** canana.eminova@mail.ru
**Redaksiyaya daxil olub:**13.05.2024

# *KORREKSİYA PEDAQOGİKASI*
# *КОРРЕКЦИОННАЯ ПЕДАГОГИКА*
# *CORRECTIONAL PEDAGOGY*

*UOT 376.44*

***Roza Darvin qızı İsmayılova***
*Azərbaycan Dillər Universitetinin*
*Pedaqogika kafedrasının müəllimi*
*https://orcid.org/0009-0004-9429-574X*
https://doi.org/10.69682/azrt.2024.91(3).177-180

## İNKLÜZİV TƏHSİL SİSTEMİNİN NƏZƏRİ ASPEKTLƏRİ

***Роза Дарвин гызы Исмаилова***
*преподаватель кафедры педагогики*
*Азербайджанского Университета Языков*

## ТЕОРЕТИЧЕСКИЕ АСПЕКТЫ СИСТЕМЫ ИНКЛЮЗИВНОГО ОБРАЗОВАНИЯ

***Rosa Darwin Ismayilova***
*teacher of the Department of Pedagogy at*
*Azerbaijan University of Languages*

## THEORETICAL ASPECTS OF THE INCLUSIVE EDUCATION SYSTEM

**Xülasə**. İnklüziv təhsil müasir dövrdə öz aktuallığı ilə fərqlənən məsələlərdən biridir. Nəinki cəmiyyətin, dünyanın hər yerində sağlamlıq imkanları məhdud şəxslərin qarşılaşdığı maneələrin, çətinliklərin müəyyən edilməsi və onların həlli yollarının tapılması məhz inklüziv təhsilin yaradılmağı ilə nəticələnmişdir. İnklüziv təhsil ümumi təhsilin hamı üçün əlçatan olmasını nəzərdə tutan və bütün gənclərin müxtəlif ehtiyaclarına uyğunlaşdırılmasına əsaslanan inkişaf prosesi hesab olunur. Bu təhsil forması, həmçinin, sağlamlıq imkanları məhdud gənclərin təhsilə cəlb olunmasını da özündə cəmləşdirir. Nəzərə almaq lazımdır ki, gənclərin müstəqil bir fərd kimi təhsili zamanı onların hər birinin müəyyən ehtiyacları yarana bilər. Bunlar həm tibbi, həm psixoloji, həm də sosioloji ehtiyaclar ola bilər. Fiziki baxımdan sağlam olan insanlarla yanaşı, sağlamlıq imkanları məhdud olan insanların da belə tələbatları mümkündür. Təbii ki söhbət təhsildən gedirsə, ən birinci qeyd edəcəyimiz məsələlərdən biri də həmin uşaq və gənclərin təlim prosesinə cəlb və adaptasiya olunması, təlimdə həmyaşıdlarından geri qalmamalarıdır. Əgər bir insanda hər hansı bir problem varsa, o təhsildən geri qalmamalı, əksinə cəmiyyətə inteqrasiya olunaraq, özünü müstəqil fərd kimi yetişdirməyi də bacarmalıdır. Bu yolda isə inklüziv təhsilin rolu kifayət qədər böyükdür.
***Açar sözlər:*** *inklüziv təhsil, sağlamlıq imkanları, psixi xəstəlikləri, inteqrasiya, inkişaf*

**Резюме**. Инклюзивное образование является одной из наиболее актуальных проблем современности. Появление инклюзивного образования привело к выявлению препятствий и трудностей, с которыми сталкивается не только общество, но и люди с ограниченными возможностями во всех частях мира, и поиску путей их решения. Инклюзивное образование считается процессом развития, основанным на обеспечении доступности общего образования для всех и его адаптации к различным потребностям всех молодых людей. Эта форма образования также предполагает привлечение к образованию молодых людей с ограниченными возможностями здоровья. Следует учитывать, что при воспитании молодежи как самостоятельной личности у каждого из них могут возникнуть определенные потребности. Это могут быть как медицинские, психологические, так и социологические потребности. Помимо физически здоровых людей, такие потребности могут возникнуть у людей с ограниченными возможностями здоровья. Конечно, если мы говорим об образовании, то один из первых вопросов, который мы затронем, – это вовлечение и адаптация этих детей и молодежи в учебный процесс,

чтобы они не отставали в обучении от своих сверстников. Если у человека есть какие-либо проблемы, он не должен отставать в образовании, наоборот, он должен иметь возможность стать самостоятельной личностью, интегрируясь в общество. Таким образом, роль инклюзивного образования весьма велика.

***Ключевые слова****: инклюзивное образование, возможности здоровья, психические заболевания, интеграция, развитие*

**Summary**. Inclusive education is one of the most relevant issues in modern times. The establishment of inclusive education resulted in the identification of obstacles and difficulties faced not only by society, but also by people with disabilities in all parts of the world, and finding ways to solve them. Inclusive education is considered to be a development process based on making general education accessible to all and adapting it to the different needs of all young people. This form of education also includes the involvement of young people with limited health opportunities in education. It should be taken into account that during the education of young people as an independent individual, each of them may have certain needs. These can be both medical, psychological and sociological needs. In addition to physically healthy people, people with limited health capabilities may have such needs. Of course, if we are talking about education, one of the first issues that we will mention is the involvement and adaptation of those children and young people in the training process, so that they do not lag behind their peers in training. If a person has any problems, he should not be left behind in education, on the contrary, he should be able to become an independent individual by being integrated into the society. In this way, the role of inclusive education is quite large.

***Keywords:*** *inclusive education, health opportunities, mental illness, integration, development*

3 iyun 2001-ci ildə qəbul edilmiş "Sağlamlıq imkanları məhdud şəxslərin təhsili" (xüsusi təhsil) haqqında Azərbaycan Respublikasının Qanununda qeyd edilir ki, bu tipdən olan şəxslərin ümumtəhsil müəssisələrinə qəbulu qanunvericiliklə müəyyən olunmuş qaydada psixoloji-tibbi-pedaqoji komissiyanın və ya tibbi-sosial ekspert komissiyasının qərarına, əsasən, həyata keçirilir.

Xüsusi təhsil haqqında Azərbaycan Respublikasının qanunvericiliyi Azərbaycan Respublikasının Konstitusiyasından, bu Qanundan, digər müvafiq qanunvericilik aktlarından və Azərbaycan Respublikasının tərəfdar çıxdığı dövlətlərarası müqavilələrdən ibarətdir.

İnklüziv təhsilin inkişafı dünyanın bir çox ölkələrinin təhsil siyasətinin əsas prio-ritetlərindəndir. Bu sistem, eyni zamanda, özündə hər hansı bir ölkənin təhsil sisteminin beynəlxalq prinsip və standartlara uyğunlaşdırılması məqsədini də daşıyır. Müasir dövrdə inklüziv təhsil dedikdə nə nəzərdə tutulur? Psixoloji-pedaqoji ədəbiyyatlara və qanunvericilik aktlarına, əsasən, qeyd edə bilərik ki, sağlamlıq imkanları məhdud olan uşaqların məktəbəqədər müəssisələrdə, orta təhsil məktəblərində xüsusi tələblər çərçivəsində dərs alması prosesi inklüziv təhsilin əsasını təşkil edir [2]. Bu təhsil formasında istifadə olunan təlim metodikasına müvafiq olaraq inklüziv təhsil uşaqlara qarşı hər hansı formada ayrı-seçkilik edilməsinin qarşısını alır, müxtəlif nevroloji və ya psixi xəstəlikləri olanlara belə mükəmməl şəkildə təhsil almaq, uğur qazanmaq, cəmiyyətin normalarına uyğun şəxsiyyət kimi formalaşmasına şərait yaradır. İnklüziv təhsil sisteminin əsas vəzifəsi məhdud imkanlara malik insanların peşə hazırlığı üçün əlverişli və sağlam sosial-psixoloji mühit yaratmaqdır. Sağlamlıq imkanları məhdud və xüsusi qayğıya ehtiyacı olan uşaqların daha keyfiyyətli təhsilə yiyələnməsi, cəmiyyətə daha tez adaptasiyası üçün digər yaşıdları ilə bir yerdə olması daha məqsədəuyğundur. Bu baxımdan *inklüziv təhsil istər* sağlam, istərsə də müəyyən məhdudiyyətləri olan gənclərin bərabər təhsil alma hüquqlarını təmin edir. Bu isə cəmiyyətdə insanlar arasında sosial bərabərliyin qorunmasına, sağlamlığında müəyyən məhdudiyyətləri olan gənclərin təhsil və başqa xüsusi ehtiyaclarının ödənilməsinə şərait yaratmış olur [5].

Cəmiyyəti düşündürən əsas məsələlərdən biri də hər bir fərdin təhsilə cəlb olunması, onun cəmiyyətdə öz yerini tutması və şəxsiyyət kimi formalaşmasıdır. Ancaq təəssüf hissi ilə söyləyə bilərik ki, bəzən həyat şəraiti, düşdüyümüz situasiyalar və ya qarşılaşdığımız problemlər, çətinliklər bizə səmərəli təhsil almağa imkan vermir, hətta bəzən bizi təhsildən uzaqlaşdırır. Burda isə bir sıra amillərin rolunu qeyd etmək olar. Misal olaraq, coğrafi şərait, təhsilin əlçatan

olmaması, sağlamlıq imkanlarının kifayət etməməsi və digər səbəbləri göstərmək olar. Saydığımız səbəblər müəyyən zaman çərçivəsində bizi təlim prosesindən uzaqlaşdıra, həmçinin, bizim ətraf aləmə və bilavasitə cəmiyyətə adaptasiya olmağımızda da maneə ola bilər.

Qeyd etdiyimiz bu səbəblər içərisində fərdlərin təhsilə cəlb olunmasında ən böyük sərhəd kimi sağlamlıq imkanlarının məhdudluğunu göstərmək olar. Ancaq sağlamlıq imkanları məhdud olan uşaqların hər hansı bir probleminin olmasına baxmayaraq onların qayğısına qalmaq lazımdır [3].

Dünyanın inkişaf etmiş və inkişafda olan bir çox ölkələrində (məsələn, Böyük Britaniya, ABŞ, İsveçrə və s.) sağlamlıq imkanları məhdud uşaqlar adi uşaqlarla birlikdə ümumtəhsil məktəblərində təhsil alır və uşaq bağçalarına gedirlər. Bu, başqa bir yanaşmadır və bu cür inteqrasiyaya inklüziv təhsil deyilir. İnklüziv sözü fransızca "*inclusive*" - "özünə daxil edən", latınca- *"includo*"- "nəticəyə gəlmək" mənasını verir. Bu termini xüsusi qayğıya ehtiyacı olan uşaqların təhsili prosesinin təşkili ilə bağlı məsələlərin həllinə istiqamətləndirilmişdir. İnklüziv təhsilin əsas məqsədini xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün maneəsiz təlim mühitinin yaradılması və onların psixoloji hazırlığının təmin olunması təşkil edir. Digər sözlə desək, inklüziv təhsilin əsas məqsədi xüsusi qayğıya ehtiyacı olan uşaqların bacarıqlarının inkişaf etdirilməsi, onların sosial mühitə inteqrasiyasına şərait yaratmaq, valideynlərin maarifləndirilməsi və onlarla inklüziv təhsil sistemik sahəsində övladları üçün aparılan işin həyata keçirilməsində köməklik göstərmək və bu sahədə çalışan müəllimlərin metodik hazırlığını inkişaf etdirməkdir. Kimlər xüsusi qayğıya ehtiyacı uşaq hesab oluna bilər? Ümumiyyətlə, o uşaqlar problemli sayıla bilər ki, onlarda problem nəticəsində psixi pozulmalar olur və onların xüsusi təlim-tərbiyəyə ehtiyacı var [1].

Xüsusi qayğıya ehtiyacı olan uşaqların isə 2 meyarını qeyd edə bilərik:

1) Fiziki inkişafın geriliyi
2) Psixi inkişafın geriliyi

Xüsusi qayğıya ehtiyacı olan uşaqların əsas kateqoriyaları dedikdə isə bunlar nəzərdə tutulur:

-eşitməsi pozulmuş uşaqlar (kar və zəif eşidən, sonradan karlaşan uşaqlar)

-görmə problemi olan uşaqlar (kor və zəif görənlər)

-ağır nitq pozulmaları olan uşaqlar (loqopatlar)

-intellektual inkişafın pozulmaları olan uşaqlar (əqli geriliyi olan, psixi inkişafda ləngiməsi olan uşaqlar)

-ilkin autizmli uşaqlar

-dayaq-hərəkət aparatı pozulmuş uşaqlar (USİ)

-davranışın psixopatik forması olan uşaqlar

-reaktiv vəziyyət

-depressiyalar

-psixomotor həyəcanlanma

-şüur pozulmaları

-psixofizioloji inkişafın kompleks pozulmaları olan uşaqlar (kor, kar, lal uşaqlar) [6]

Xüsusi qayğıya ehtiyacı olan uşaqların təlim-tərbiyəsi onların ictimai həyata və əmək fəaliyyətinə, cəmiyyətə qoşulması olduqca mürəkkəb sosial və pedaqoji-psixoloji problemdir. Adətən, xüsusi qayğıya ehtiyacı olan uşaqların təhsil səviyyəsi müxtəlif olur. Belə ki, bu uşaqlardan bəziləri yalnız elementar ümumtəhsil biliklərinə yiyələnə bilər, digər qismi isə bu sahədə sərhədsiz imkanlara malik ola bilər. Praktik fəaliyyətdə də xüsusi məktəb şagirdlərinin bəzilərinin yüksək ixtisaslara yiyələnməsi, digərlərinin isə yalnız aşağı səviyyəli ixtisas işləri görə bildikləri, öz həyatlarının və əməklərinin təşkilini tələb etmə qabiliyyətinə malik olduğu müşahidə olunmuşdur.

Müasir dövrdə, qloballaşan dünyada tibbi və psixoloji elmlərin sürətlə inkişafı xüsusi ehtiyaclı uşaqların inkişaf xüsusiyyətlərinin açılmasına böyük kömək edir. Problemlərin ayrı-ayrılıqda diferensiallaşdırılmasına (məsələn, ağıreşitmə və karlıq), xüsusi ehtiyaclı uşaqların və onların etiologiyasını təsnifatlaşmasına (məs, əqli geriliyin və ruhi xəstəliyin ayrılması) isə müəyyən cəhdlər göstərilmişdir [4].

Ümumiyyətlə, bütün insanlar öz həmyaşıdlarının köməyinə və dostluğuna ehtiyac duyurlar, dünyada xüsusi qayğıya ehtiyacı olan uşaqların təhsilinin tarixini nəzərdən keçirsək görərik ki, qeyd etdiyimiz məsələlərə daim ehtiyac duyulur. Xüsusilə, sağlamlıq imkanları məhdud olan uşaqların cəmiyyətə adaptasiyası

zamanı qeyd etdiyimiz bu kimi keyfiyyətlərə xüsusi diqqət yetirilməsi vacibdir.

Bildiyimiz kimi, sağlamlıq imkanları məhdud olan uşaqların təlim-tərbiyəsi yaxın inkişaf zonasını nəzərə alaraq inkişafetdirici xarakter daşımalıdır. Xatırladaq ki, yaxın inkişaf zonası müəllimin köməyi ilə reallaşdırılan xüsusi ehtiyaclı uşaqların funksiyalarını formalaşdıran potensial imkanlar ehtiyatı hesab olunur. Yaxın inkişaf zonası yalnız imkanları deyil, həm də xüsusi qayğıya ehtiyacı olan uşağın psixi inkişafının perspektivini də müəyyən edir. Sağlamlıq imkanlar məhdud olan uşaqlarla təlim prosesi olduqca diqqət və qayğı tələb edən bir prosesdir. Belə ki, təlim prosesi uşaqların psixikasında yaxın inkişaf zonasının aktual inkişafa keçməsini stimullaşdırmaqda böyük əhəmiyyət kəsb edir. Yəni zaman keçdikcə müəllimin rəhbərliyi ilə olan proses artıq uşaq tərəfindən rahat şəkildə yerinə yetirilərək həll yolunu tapmış olur. Həmin uşaqların məsələləri həll etmə qabiliyyəti müstəqil formaya keçirilmiş olur. Bu isə bilavasitə olaraq, təlimin və inkişafın daxili əlaqəsini təşkil edir, eyni zamanda, sağlamlıq imkanları məhdud uşaqlarla düzgün təşkil olunmuş təlimin onların fərdi inkişafı ilə də nəticələnir. Adətən, xüsusi qayğıya ehtiyacı olan uşaqlarda inkişaf problemləri, dedikdə biz, onların sosial mühitdə qarşılaşdığı ünsiyyət çətinlikləri, təlimə motivasiyanın aşağı düşməsi və cəmiyyətə adaptasiya probleminin yaranması kimi məsələləri vurğulaya bilərik [7]. Çünki bu zaman onların ətrafında baş verən hadisələrə adekvat reaksiya imkanlarının aşağı düşməsi kimi halları da müşahidə olunur. Elə buna görə də xüsusi qayğıya ehtiyacı olan uşaqların təlim-tərbiyəsinin yerinə yetirdiyi vəzifələrindən biri də məhz cəmiyyət, kollektivlə adekvat ünsiyyətin təmin edilməsi, sosial qayda və normativlərin dərk edilərək yerinə yetirilməsidir. Çünki sosial adaptasiya xüsusi qayğıya ehtiyacı olan uşaqların ictimai-faydalı həyat aktiv iştirak etməyə imkan verir, onların cəmiyyətdə birbaşa sosial rollarını müəyyənləşdirir, aktiv həyat fəaliyyətinə keçid almasına gətirib çıxardır.

**Problemin aktuallığı.** Bu məqalənin aktuallığı ondan ibarətdir ki, dediyimiz bu xüsusiyyətlər nəzərə alınarsa, sağlamlıq imkanları məhdud uşaqların pedaqoji-psixoloji problemlərinin həlli yolunda vacib addımlar atılmış olar. Bu zaman onların ən böyük problemlərindən olan sosial adaptasiya məsələsi də öz həll yolunu tapar.

**Problemin elmi yeniliyi.** Bu mövzuda geniş araşdırmalar aparılmış və bu tədqiqatlar məqalədə öz əksini tapmışdır.

**Problemin tətbiqi əhəmiyyəti.** Bir çox pedaqoqlar elm sahəsində çalışan elm xadimləri bu mövzu ilə bağlı tədqiqatlarında bu materialdan istifadə edə bilərlər.

**Ədəbiyyat:**

1. Abbasova, Q.M. Təhsilin sosial-pedaqoji məsələləri. Ali məktəb üçün dərs vəsaiti / R. Mahmudova, H. Əlizadə – Bakı: Turan evi, - 2008. - 478 s.
2. Dostuzadə, D.Ə. Zəifeşidən və sonradan karlaşmış uşaqların oxu texnikası və vərdişlərinin inkişafı üzrə işin sistemi //– Bakı: Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutunun Elmi əsərləri, – 2005. – № 4, – s. 3-10.
3. BMT Dakar fəaliyyət çərçivəsi. / Hamı üçün təhsil: ümumi öhdəliklərin yerinə yetirilməsi, - Paris: UNESCO, – 2000, – s. 2-5
4. Kərimova, E.M. İnklüziv təlim: inkişaf tarixi və tətbiqi problemləri // – Bakı: Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutunun Elmi əsərləri, – 2011, – № 4, – s. 9-15
5. Əliyev, R.İ. Məktəbdə psixoloji xidmətin aktual məsələləri. / – Bakı: Nurlan, – 2004, – 80 s.
6. Əlizadə, Ə.Ə. İstedadlı uşaqlar. Psixopedaqoji məsələlər / – Bakı: ADPU, – 2005, – 351 s
7. Zeynalova, N.A. İnklüziv təhsili pedaqogikası /– Bakı: Elm və Təhsil, 2021, 321 s

**E-mail:** rozaqalandar@mail.ru

**Redaksiyaya daxil olub:**30.05.2024

*UOT 376.44*

***Lalə Xanoğlan qızı Məmmədova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Xüsusi təhsil kafedrasının müəllimi*
*https://orcid.org/0009-0004-0683-7191*
*https://doi.org/10.69682/azrt.2024.91(3).181-185*

# EŞİTMƏ POZULMALARI OLAN UŞAQLARIN TƏHSİL FORMALARI ÜZRƏ İŞİN TƏŞKİLİ

***Лала Ханоглан гызы Мамедова***
*преподаватель кафедры Специального образования*
*Азербайджанского Государственного Педагогического Университета*

# ОРГАНИЗАЦИЯ РАБОТЫ ПО ФОРМАМ ОБРАЗОВАНИЯ ДЕТЕЙ С НАРУШЕНИЯМИ СЛУХА

***Lale Khanoglan Mammadova***
*teacher at the special education departament of*
*Azerbaijan State Pedagogical University*

# ORGANIZATION OF WORK ON EDUCATION FORMS OF CHILDREN WITH HEARING IMPAIRMENTS

**Xülasə.** Sağlamlıq imkanları məhdud uşaqların korreksiya işlərinin həyata keçirilməsində nitq mühüm əhəmiyyətə malikdir. Nitq və onun inkişafı təfəkkürün inkişafı ilə sıx əlaqədardır. Kar və zəif eşidən uşaqlar ucun xüsusi məktəbəqədər müəssisələrdə tədris -tərbiyə işlərinin gedişində nitqin, eşitmə qalığının inkişafına, nitqin tələffüz tərəfinin formalaşdırılmasına xüsusi diqqət yetirilir. Eşitmə pozulması olan uşaqlar ucun inteqrasiyanın ən məqbul formalarına: müvəqqəti, kombinə edilmiş və tam inteqrasiya daxildir. Müvəqqəti inteqrasiya kütləvi məktəblərdə kar uşaqlar ucun xüsusi siniflərin təşkilidir. Bu siniflərin şagirdləri müəyyən nitq yükü az olan fənlərin tədrisində, məsələn, təsviri incəsənət, əmək, bədən tərbiyəsi dərslərində, məktəbin sinifdənkənar tərbiyə işlərində eşidənlərlə birgə iştirak edə bilirlər.
***Açar sözlər:*** *Sağlamlıq imkanları, eşitmə pozulması, zəif eşidən, təhsil, təlim*

**Резюме.** Речь играет важную роль в осуществлении коррекционной работы с детьми с ограниченными возможностями здоровья. Речь и ее развитие тесно связаны с развитием мышления. Особое внимание уделяется развитию речи и слуха, формированию произношенной стороны речи в ходе воспитательной работы в специальных дошкольных учреждениях для глухих и слабослышащих детей. К наиболее приемлемым формам интеграции детей с нарушением слуха относятся: временная, комбинированная и полная интеграция. Временная интеграция – это организация специальных классов для глухих детей в государственных школах. Учащиеся этих классов могут совместно участвовать в изучении отдельных предметов с низкой речевой нагрузкой, например, уроков изобразительного искусства, труда, физкультуры, а также на внеклассных занятиях вместе с другими учениками.
***Ключевые слова:*** *возможности здоровья, нарушение слуха, слабослышащие, образование, обучение*

**Summary.** Speech plays an important role in the implementation of correctional work for children with disabilities. Speech and its development are closely related to the development of thinking. Special attention is paid to the development of speech and hearing, and the formation of the pronunciation side of speech in the course of educational work in special preschool institutions for deaf and hard-of-hearing children. The most acceptable forms of integration for children with hearing impairment include: temporary,

combined and full integration. Temporary integration is the organization of special classes for deaf children in public schools. Pupils of these classes can participate in the teaching of certain subjects with a low speech load, for example, fine arts, labor, physical education classes, and extracurricular activities of the school together with the hearing ones.

***Keywords:*** *Health facilities, hearing impairment, hard of hearing, education, training*

Sağlamlıq imkanları məhdud uşaqların korreksiya işlərinin həyata keçirilməsində nitq mühüm əhəmiyyətə malikdir. Nitq və onun inkişafı təfəkkürün inkişafı ilə sıx əlaqədardır. Kar uşaqlarda təlim olmadan nitq formalaşmır. Təlim almamış eşitmə pozulması olan uşaqların əksəriyyəti nitq və ünsiyyət çətinliyini dərk etməyə başlayır, böyüklər və eşidən uşaqlarla ünsiyyət qurmaqdan çox çəkinirlər. Onlar böyüklərlə (əksər hallarda valideynlərlə) ünsiyyəti əşya fəaliyyəti, təbii jest, mimika və digər qeyri-verbal vasitələrin köməyi ilə həyata keçirirlər. Eşitmənin çox kiçik, erkən yaşda müəyyən qədər itirilməsi qulaq seyvanının danışıq ucalığında olan nitqi qavramaması ümumilikdə nitqin inkişafını ləngidir. Eşitmənin itirilməsi və ya zəifləməsi insanda nitq qabiliyyətinin də itirilməsinə, lüğət ehtiyatının azlığına mənfi təsir edir. Əmək və Əhalinin Sosial Müdafiə Nazirliyinin 2024-cü il rəsmi məlumatına əsasən Azərbaycan Respublikasında eşitmə məhdudiyyətli şəxslərin sayı 12360 nəfərdir. Onların eşitmə qabiliyyətinin olmaması və ya qismən itirilməsi heç də onların təhsildən kənar qalması demək deyildir. Hal-hazırda eşitmə məhdudiyyətli şəslərin keyfiyyətli təhsil alması məsələlərinə günü-gündən diqqət ayrılır və onlar təhsilin müxtəlif formalarından, yəni əyani, axşam, distant (onlayn), evdə təhsil formalarından, həmçinin inteqrativ və inklüziv təhsil sistemlərində və teledərslər vasitəsi ilə təhsil alırlar. Qeyd edilən təhsil formaları arasında eşitmə pozulmaları olan uşaqlar daha çox əyani təhsil formasına üstünlük verir. Əyani təhsil forması kar və zəif eşidən uşaqların təhsil ehtiyaclarının və fərdi imkanların müxtəlifliyinə görə aşağıda qeyd edilən müəssisələrdə təhsil ala bilərlər:

**1)** xüsusi təhsil müəssisələrində;

**2)** ümumi təhsil müəssisələri nəzdində xüsusi korreksiya sinif, qrup və ya resurs siniflərində;

**3)** inklüzivlik şəraitində (digər kateqoriyalı şagirdlərlə birgə).

Bu cür təhsil müəssisələrində onlarla məşğul olan müəllim, loqoped, surdopedaqoq və digər şəxslər həm şifahi ünsiyyətdən, həm işarə (jest) dilindən, həm daktil (əl ilə ünsiyyət) nitqdən, həm də görmə duyğusundan və yaxud onların kombinasiyasından istifadə edərək təlim prosesini təşkil edirlər. Daktillə düzgün yazı məktəbəhazırlıq dövründən öyrədilir. Həmçinin dərs zamanı vizual vasitələrdən, proyektorlardan, səs gücləndirici aparatlardan istifadə edilir. Eşitmə əngəli olan uşaqlarla tədris zamanı ilk olaraq daktildən (əlifbadan) başlayırıq. Hər sinifdə iki müəllim olur. İbtidai sinif müəlliməsi ilə yanaşı, həm də səs müəlliməsi- loqoped. Sinif müəllimәsi hərfləri keçdikcə, səs müəllimәsi səslərin düzgün artikulyasiya üzrə tələffüzünə köməklik edir. Dərslərimiz daktil, jest və dodaqdan oxumaqla şagirdlərimizə mənimsədilir. Məktəbəqədəryaşlı eşitmə pozulması olan uşaqlar üçün aşağıda qeyd edilən müxtəlif təhsil müəssisələri fəaliyyət göstərir

**1.** İxtisaslaşdırılmış kompensasiya tipli körpələr evi-uşaq bağçası. Kompensasiya tipli məktəbəqədər təhsil müəssisələri kar və zəif eşidən uşaqların sayından asılı olaraq təhsil orqanları tərəfindən təşkil edilir. Müəssisəyə uşaqların seçilib göndərilməsi və komplektləşdirilməsi Psixoloji-Tibbi-Pedaqoji Komissiyanın qərarına uyğun həyata keçirilir.

**2.** Kombinə olunmuş uşaq bağçaları. Bu tipli uşaq bağçalarında eşidən uşaq qrupları ilə yanaşı, eşitmə pozulması olan uşaqlar üçün kompensasiya qrupları da təşkil olunur və qrupa 1,5-2 yaşlı kar və zəif eşidən uşaqlar qəbul edilir. Təlim və tərbiyə prosesi uşaq bağçasına qəbul müddətindən asılı olaraq (2 və ya 3 yaşdan) 5 və ya 4 il üçün nəzərdə tutulur. Bu kompensasiya tipli məktəbəqədər təhsil müəssisələri gecəgündüz iş rejimində fəaliyyət göstərir (kompensasiya tipli ayrı-ayrı müəssisələr ilboyu fəaliyyət göstərir). Bununla belə, valideynlər uşaqlarını hər gün evə apara bilərlər.

**3.** Eşitmə pozulması olan uşaqlar üçün xüsusi ümumtəhsil məktəb və ya internat -məktəblərində kar və zəif eşidən uşaqların eşitmə və nitq vəziyyətindən asılı olaraq, xüsusi məktəbəqədər qruplar təşkil edilə bilər. Kar və zəif eşi-

dən uşaqların eyni qrupda birgə təlim-tərbiyə alması tövsiyə edilmir. Məktəbəqədər qruplara uşaqlar 2-3 yaşından, onların tərbiyəsi ucun şərait olduqda qəbul edilə bilər. Bəzi hallarda, müxtəlif səbəblərdən (eşitmə pozulmasının gec aşkarlanması, uşağın mövcud xəstəlikləri və s.) 5-6 yaşdan başlayan məktəbəqədər yaşlı uşaqlar ucun qruplar təşkil oluna bilər

Eşitmə pozulması olan məktəbəqədər yaşlı uşaqlar uçun sadalanan bütün xüsusi müəssisələrdə tədris-tərbiyə işləri ilə yanaşı, ümumi inkişaf geriliyinin aradan qaldırılması üzrə iş təşkil edilir, həmçinin bədən tərbiyəsi – sağlamlaşdırıcı tədbirlər də həyata kecirilir. Kar və zəif eşidən uşaqlar ucun xüsusi məktəbəqədər müəssisələrdə tədris -tərbiyə işlərinin gedişində nitqin, eşitmə qalığının inkişafına, nitqin tələffuz tərəfinin formalaşdırılmasına xüsusi diqqət yetirilir. Eşitmə qüsurlu uşaqların təhsili üçün Bakıda xüsusi təhsil müəssisələrinin iki tipi:

**1.** Kar uşaqlar üçün 3 nömrəli Respublika xüsusi internat məktəbi;

**2.** Zəif eşidən və sonradan karlaşan uşaqlar üçün 2 nömrəli xüsusi internat məktəbi mövcuddur.

Bu internat məktəblərində 1000-ə yaxın uşaq təhsil alır. Məktəbə qəbul tibbi-pedaqoji komissiyanın qərarı ilə yerinə yetirilir

**I.** Kar uşaqlar ucun xüsusi ümumtəhsil internat məktəbi - tərbiyə, ümumtəhsil və əmək hazırlığı məsələlərini, həmçinin onların inkişafı çatışmazlıqlarının korreksiya və kompensasiyasını həyata keçirən təlim -tərbiyə müəssisəsidir. Kar uşaqlar kütləvi məktəbin 9 illik umum təhsil proqramı əsasında hazırlığı ucun 11 il təlim tərbiyə alırlar. Təhsil ilinin sonunda onlar natamam orta təhsil haqqında sənəd – şəhadətnamə alır. Bu məktəb kar uşaqların inkişaf xüsusiyyətlərini nəzərə alaraq, ümumtəhsil məktəbi ilə ümumi olan təlim-tərbiyə məsələlərini həll edir və ümumtəhsil, politexnik və əmək hazırlığını həyata keçirir. Məktəbdə kar uşaqlarda sözlü nitqin, sözlü - məntiqi təfəkkürün formalaşdırılması və inkişafına, həmçinin eşitmə qalığının inkişafı, korreksiya və kompensasiya işinə xüsusi diqqət yetirilir. Kar şagirdlərdə aydın şifahi nitqin formalaşdırılması və inkişafı, fəal nitq təcrübəsinin artırılması üzərində iş bütün dərslərdə və sinifdən kənar saatlarda da aparılır.

I-VII-ci siniflərdə təhsil xüsusi tədris proqramı və dərsliklərlə, VIII -XI siniflərdə isə kütləvi məktəbin (V-IX üçün təyin olunmuş) proqram və dərslikləri ilə aparılır. Xüsusi məktəbəqədər və məktəb müəssisələrinin proqram və dərslikləri tərtib olunarkən psixoloq, defektoloq, loqoped, metodist, məktəb və uşaq bağçalarında işləyən müəllim və tərbiyəçilərin işə cəlb olunması son dərəcə vacibdir. Kar uşaqlar ucun internat məktəbdə siniflərdə uşaqların sayı 8-12 nəfər olur. Kar uşaqların əmək təlimi 12 yaşdan başlayır, əmək-istehsalat (texnologiya üzrə) hazırlığında sinifdə 5-7 nəfər olur.

**II.** Zəif eşidən və sonradan karlaşan uşaqlar üçün xüsusi ümumtəhsil internat məktəbi təlim-tərbiyə müəssisəsi olaraq, tərbiyə, ümumtəhsil və əmək hazırlığı, uşağın ümumi inkişafına eşitmənin azalmasının təsirini və nitqin inkişafsızlığının aradan qaldırılmasına xidmət edir. Bu məsələlərin xüsusi təhsil şəraitində aparılması eşitmənin azalması nəticəsində yaranmış çatışmazlıqların: nitqin inkişafdan qalmasının, psixi inkişafda özünü göstərən çatışmazlıqların aradan qaldırılmasını təmin edir və sözlü nitqi ünsiyyət vasitəsi və təfəkkür aləti kimi formalaşdırır, inkişaf etdirir. Zəif eşidən və sonradan karlaşmış uşaqlar üçün internat məktəbə uşaqlar 6-7 yaşlarından qəbul edilir və təlim-tərbiyə işi iki bölmədə: eşitmənin azalması ilə bağlı yüngül nitq inkişafsızlığı olan uşaqlarla (II dərəcə) və eşitmə funksiyasının itirilməsi nəticəsində ağır nitq inkişafsızlığı olan uşaqlarla (III dərəcə) aparılır. Məktəbin I bölməsində təhsil kütləvi məktəbin proqram və dərslikləri ilə; II bölmədə isə I-VI siniflərdə xüsusi, yuxarı siniflərdə isə kütləvi məktəbin proqram və dərslikləri ilə aparılır. Məktəbdə siniflər şagird sayı 12 nəfərdən təşkil olunur. Bu tip uşaqlar peşəyönlü ixtisaslara daha çox meyilli olurlar. Onlara bu internat məktəblərində uşaqlara tikiş, toxuculuq, kulinariya, xalçaçılıq, dülgərlik və s. kimi peşələr öyrədilir. Təhsilin məzmununun korreksiya yönünü əks etdirən hər iki məktəbdə tədris işi şərti olaraq iki hissədən ibarət olur. Birinci hissəyə ümumtəhsil sahələri (fənlər), ikinciyə – korreksiya -inkişafetdirici fənlər daxildir.

Ümumi təhsil sahələrinə (fənlərinə): ana dili - oxu, nitq inkişafı, ədəbiyyat, tələffüz, qrammatika; Riyaziyyat -hesab, cəbr, həndəsə; ictimai elmlər -həyat bilgisi, tarix, təbiət elmləri – coğ-

rafiya, biologiya, fizika, kimya; incəsənət- təsviri sənət; fiziki tərbiyə - bədən tərbiyəsi, idman; texnologiyaya - əmək təlimi, əşya-əməli məşğələ, kompüter texnologiyası daxildir. Təsviri incəsənət fənni I-VII siniflərdə tədris olunur.

Əmək təliminin ilk propedevtik mərhələsi I-IV -cü siniflərdə əşya - əməli məşğələ hesab edilir. İkinci mərhələ V-VII siniflərdə: oğlanlar üçün texniki və qızlar üçün xidmət işinin təlimi, üçüncü mərhələdə, VIII-XI siniflərdə istehsalat əməyi və peşəyönümü, seçilmiş peşə üzrə əmək təlimi aparılır. Əşya-əməli məşğələnin əsas məzmun xətləri nitq fəaliyyəti, ətraf aləm haqqında anlayışlar, intellektual bacarıqlar, əmək vərdiş və bacarıqları özündə ehtiva edir: Xüsusi məktəbdə tədris olunan korreksiya-inkişafetdirici fənlərə:

- eşitmə qavramasının inkişafı və nitqin tələffüz tərəfinin formalaşması( fərdi, frontal və qrup dərsləri );
- musiqili - ritmika dərsləri daxildir

Korreksiya-inkişafetdirici fənlərdrən biri olan eşitmə qavramasının inkişafı və nitqin tələffüz tərəfinin formalaşması fərdi, frontal və qrup məşğələləri təşkil etməklə kar və zəif eşidən uşaqlarda eşitmə qavraması, eşitmə yaddaşı, tələffüz və sözlü nitq vərdişlərinin formalaşdırılması, istifadə bacarıqları inkişaf etdirilir.

Eşitmə qavramasının inkişafı və nitqin tələffüz tərəfinin formalaşması üzrə məşğələlər eşitmə pozulması olan şagirdlərin hərtərəfli inkişafına, cəmiyyətə inteqrasiyasına yönəlmiş tədris - korreksiya iş sistemində ən vacib xüsusi (korreksiyaedici) fənlərdən biri olub, eşitmə qavrayışı, nitq və motorikanın, şəxsiyyətin hərtərəfli inkişafı üçün böyük əhəmiyyət daşıyır.

Musiqili - ritmika məşğələsində eşitmə pozulması olan şagirdlərin. musiqi qavrayışının sensor əsaslarının inkişafına xüsusi diqqət yetirilir. Sinifdə musiqi materialı əsasən elektroakustik avadanlıqların, eşitmə - görmə və taktilvibrasiyanın köməyi ilə qavranılır. Əsasən frontal dərslər şəklində aparılan musiqili-ritmik məşğələdə eşitmə və nitqin inkişafı, eşitmə qalığı funksiyasının fəallaşdırılması və nitqin tələffüz tərəfinin formalaşdırılması çalışmalar sistemində həyata keçirilir və çox vacib reabilitasiya vəzifəsini yerinə yetirir. Musiqili - ritmik məşğələlər zamanı uşaqların səsli dünya haqqında təsəvvürləri zənginləşir, müxtəlif akustik informasiyaların - nitq, nitqsiz səs və musiqini qavraması inkişaf edir. Məktəblilər məşğələ prosesində musiqi və nitqi fərdi eşitmə cihazlarının köməyi ilə qavrayırlar. Onlar musiqi və nitqi dinləməyi, eşitdiklərini təhlil və müqayisə etməyi öyrənirlər. Bu məşğələlərin ən vacib vəzifəsi şagirdlərin səs tələffüzünü təkmilləşdirmək, nitq tənəffüsü, nitqin səs və ritmik-intonasiya quruluşunu inkişaf etdirməkdir. Bu, kar uşaq nitqinin daha təbii səslənməsinə nail olmağa, eşitmə pozulması olan uşaqların nitqinin səslənməsini eşidən insanların nitqinə yaxınlaşdırmağa kömək edir. Bununla yanaşı, musiqili – ritmik məşğələlər də nitqin inkişafı üzrə iş fonetik ritmlərdən istifadə edərək tələffüz bacarıqlarının möhkəmləndirilməsini də əhatə edir. Kar uşaqların eşidənlər cəmiyyətinə inteqrasiyası həmişə surdopedaqogikanın əsas vəzifələrindən biri və onların təhsilinə yönəlmiş səylərin istiqamətləndiricisi olmuşdur. İnteqrasiyalı təlim sistemində iki əsas: ixtisaslaşdırılmış məktəb (seqreqasiya təhsil) və inteqrasiya olunmuş təhsil (sosial əməkdaşlıq təhsili) istiqamətləri fərqləndirilir.

Eşitmə pozulması olan uşaqlar ucun inteqrasiyanın ən məqbul formalarına: müvəqqəti, kombinə edilmiş və tam inteqrasiya daxildir. Müvəqqəti inteqrasiya kütləvi məktəblərdə kar uşaqlar ucun xüsusi siniflərin təşkilidir. Bu siniflərin şagirdləri müəyyən nitq yükü az olan fənlərin tədrisində, məsələn, təsviri incəsənət, əmək, bədən tərbiyəsi dərslərində, məktəbin sinifdəndənkənar tərbiyə işlərində eşidənlərlə birgə iştirak edə bilirlər. Kombinə edilmiş inteqrasiya zamanı 1-2 kar uşaq kütləvi sinifdə oxuyur, defektoloq onlarla fərdi və ya kiçik qruplarla korreksiya edici məşğələlər keçirir. Tam inteqrasiya psixofiziki inkişafı yüksək səviyyədə olan zəif eşidən və sonradan karlaşan uşaqlar ucun kütləvi sinifdə 1-2 kar şagirdin defektoloqun daimi nəzarəti və korreksiya dəstəyi ilə təlimini əhatə edir. İnteqrasiyalı təhsil sistemindən müsbət nəticələri əldə etmək uçun ən azı iki şərtin gözlənilməsi lazımdır: birinci şərt onun məcburi olmamasıdır, yəni, valideyn, defektoloq və şagirdlərə seçim imkanının verilməsi; ikinci şərt, müəllimlərin eşitmə pozulması olan uşaqları eşidənlər cəmiyyətinə daxil etməsi uçun fəal təşkilatı, texniki və metodik səylərinin olmasıdır.

**Problemin aktuallığı.** Xüsusi təhsilin hərəkətverici qüvvəsi müəllimin şagirdlərə verdiyi dəstəkdir. Bu prosesdə müəllimin təcrübəsi ilə yanaşı, düzgün strategiyasının olması və onu reallaşdıra bilməsi inklüziv təhsilin effektiv tətbiqinin dayağı hesab oluna bilər. Bütün bu prosesləri nəzərə alaraq eşitmə pozulmaları olan uşaqların təhsil formaları üzrə işin təşkili əsas vasitə kimi bu və ya digər şəkildə tədqiq edilsə də, bu sahədə onun məqsəd və vəzifələri öyrənilməmiş, ümumiyyətlə açıq qalmışdır. Apardığımız tədqiqat bu problemin öyrənilməsinə və həlli yollarının araşdırılmasına həsr edilmişdir.

**Problemin elmi yeniliyi.** Bu məqalədə, ilk dəfə olaraq, eşitmə pozulmaları olan uşaqların təhsil formaları üzrə işin təşkili araşdırılmış, məqsəd və vəzifələrinin əhəmiyyəti və həlli yolları göstərilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə irəli sürülən təkliflər və nəticələr, eşitmə pozulmaları olan uşaqların təhsil formaları üzrə işin təşkilini müvəffəqiyyətlə həyata keçirilməsini təşkil etmək və uşaqların inkişafında nəzərə alınmasına köməklik göstərməkdir. Bu məlumatlar vasitəsilə istər müəllimlər, istərsə də valideynlər uşaqların inkişafı, tərbiyəsi və təhsilini müvəffəqiyyətlə həyata keçirilməsini təşkil edə bilər.

**Ədəbiyyat:**

1. Ağayeva, T.H. Eşitmə pozğunluqlarının psixokorreksiyası. / - T.H. Ağayeva. - Bakı, 2015.
2. Ağayeva, T.H. Loqopediyanın nəzəri-praktik məsələləri. / T.H. Ağayeva, S.M. Əliyeva. -Bakı: Maarif, -1999.
3. Hüseynova, N.T. Loqopedik Atlas. / N.T. Hüseynova. -Bakı, 2014.
4. Hüseynova, N.T. Xüsusi pedaqogika. / N.T. Hüseynova, L. Rüstəmova. -Bakı, 2006.
5. Hüseynova, N.T. Xüsusi psixologiya. / N.T. Hüseynova, S.R. Aslanova. -Bakı, 2018.
6. Hüseynova N.T., İmanova L.M. Diaqnostika işlərinin həyata keçirilməsi. -Bakı, 2020.
7. Rəfiyeva L., Məmmədova M., Yusifova E., Abbasova S. Korreksiya işlərinin həyata keçirilməsi. -Bakı, 2020.
8. Qasımov, S.Ə. Əqli və fiziki inkişafı ləngiyən uşaqların diaqnostikası və korreksiyası. / S.Ə. Qasımov, E.M. Kərimova. -Bakı: Çaşıoğlu, -2004, -122 s.

**E-mail:** lale_memmedova95@bk.ru
**Redaksiyaya daxil olub:** 30.05.2024

## *İNKLÜZİV TƏHSİL MƏSƏLƏLƏRİ*
## *ВОПРОСЫ ИНКЛЮЗИВНОГО ОБРАЗОВАНИЯ*
## *ISSUES OF INCLUSIVE EDUCATION*

*UOT 378*

***Xalidə Aydın qızı Həmidova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi,*
*pedaqogika üzrə fəlsəfə doktoru*

***Səkinə Yaşar qızı Muradalı***
*Xəzər Universiteti*
*https://orcid.org/0009-0004-6496-552X*
*https://doi.org/10.69682/azrt.2024.91(3).186-194*

# NORVEÇ VƏ İSVEÇDƏ İNKLÜZİV TƏHSİLİN TƏTBİQİ VƏ MÜASİR TƏHSİLDƏKİ ROLLARI

***Халида Айдын гызы Гамидова***
*старший преподаватель Азербайджанского Государственного Педагогического Университета,*
*доктор философии по педагогике*

***Сакина Яшар гызы Мурадали***
*Университет Хазар*

# ВНЕДРЕНИЕ ИНКЛЮЗИВНОГО ОБРАЗОВАНИЯ И ЕГО РОЛЬ В СОВРЕМЕННОМ ОБРАЗОВАНИИ НОРВЕГИИ И ШВЕЦИИ

***Khalida Aydin Hamidova***
*senior lecturer at Azerbaijan State Pedagogical University,*
*doctor of philosophy in pedagogy*

***Sakina Yashar Muradali***
*Hazar University*

# THE IMPLEMENTATION OF INCLUSIVE EDUCATION AND THEIR ROLES IN MODERN EDUCATION IN NORWAY AND SWEDEN

**Xülasə.** Bu məqalə Norveç və İsveç daxil olmaqla, 2 inkişaf etmiş Avropa ölkəsində inklüziv təhsilə dair fikirləri təqdim edir. Sağlamlıq məhdudiyyəti olan və ya xüsusi ehtiyacı olanlar da daxil olmaqla, bütün tələbələrə bərabər imkanlar təqdim etməyə yönəlmiş inklüziv təhsil bütün Avropada populyarlıq qazanır. Hər bir ölkədə inklüziv təhsilə unikal qanunvericilik, təcrübə və maneələr nəzərə alınmaqla fərqli baxılır. Norveçdə inklüziv təhsil sağlamlıq məhdudiyyəti olan olan şagirdlərin mümkün olduqda adi məktəblərə inteqrasiya istəyi kimi müəyyən edilir. İsveç, əlilliyi olan uşaqları müvafiq dəstək verərkən adi siniflərə inteqrasiya etmək üçün oxşar öhdəliklər götürdü. Bu ölkələr inklüziv təhsilə sadiq olsalar da, onun həyata keçirilməsinin əhatə dairəsi və metodları mədəni, sosial-iqtisadi və siyasi amillərdən asılı olaraq dəyişir. Avropada inklüziv təhsilə dair müxtəlif perspektivləri anlamaq siyasət hazırlamaq, ən yaxşı təcrübələri bölüşmək və bütün uşaqlar üçün təhsilə bərabər çıxışı təmin etmək üçün əməkdaşlığı təşviq etmək üçün çox vacibdir.
***Açar sözlər:*** *İnklüziv təhsil, Xüsusi Təhsil Ehtiyacları, Norveç, İsveç*

**Резюме.** В данной статье представлены точки зрения на инклюзивное образование в двух развитых европейских странах, включая Норвегию и Швецию. Инклюзивное образование, целью кото-

рого является предоставление равных возможностей всем учащимся, в том числе с ограниченными возможностями здоровья или особыми потребностями, набирает популярность по всей Европе. В каждой стране инклюзивное образование рассматривается по-разному, с учетом уникального законодательства, практики и препятствий. В Норвегии инклюзивное образование определяется как стремление к интеграции учащихся с ограниченными возможностями в обычные школы, когда это возможно. Швеция взяла на себя аналогичные обязательства по интеграции детей с ограниченными возможностями в обычные классы, обеспечивая при этом соответствующую поддержку. Хотя эти страны привержены инклюзивному образованию, масштабы и методы его реализации различаются в зависимости от культурных, социально-экономических и политических факторов. Понимание различных точек зрения на инклюзивное образование в Европе имеет решающее значение для разработки политики, обмена передовым опытом и поощрения сотрудничества, направленного на обеспечение равного доступа к образованию для всех детей.

***Ключевые слова:*** *инклюзивное образование, особые образовательные потребности, Норвегия, Швеция.*

**Summary.** This article presents viewpoints on inclusive education in 2 developed European nations, including Norway and Sweden. Inclusive education, which seeks to give equal opportunity to all students, including those with impairments or special needs, is gaining popularity throughout Europe. Each country tackles inclusive education differently, with unique legislation, practices, and obstacles. In Norway, inclusive education is defined as a commitment to integrating students with disabilities into regular schools whenever possible. Sweden has made a similar commitment to integrating kids with impairments into regular classrooms while providing appropriate support. While these countries are committed to inclusive education, the extent and execution differ depending on cultural, socioeconomic, and political variables. Understanding the various viewpoints on inclusive education across Europe is critical for guiding policy creation, exchanging best practices, and encouraging collaboration to guarantee equitable access to education for all children.

***Keywords:*** *Inclusive education, Special Educational Needs, Norway, Sweden*

Qısaltmalar

CFR - Charter of Fundamental Rights of the European Union (Avropa Birliyinin Əsas Hüquqlar Xartiyası)

UNCRPD - The United Nations Convention on the Rights of Persons with Disabilities (Birləşmiş Millətlər Təşkilatının Sağlamlıq Məhdudiyyətli Şəxslərin Hüquqları Konvensiyası)

OECD - The Organization for Economic Cooperation and Development (İqtisadi əməkdaşlıq və İnkişaf Təşkilatı)

IEA - International Association for the Evaluation of Educational Achievement (Beynəlxalq Təhsil Nailiyyətlərinin Qiymətləndirilməsi Assosiasiyası)

SISS - Second International Science Study (İkinci Beynəlxalq Elmi Tədqiqat Hesabatı)

SEN - Special Educational Needs (Xüsusi Təhsil Ehtiyacları)

UNICEF - The United Nations Convention on the Rights of the Child (Birləşmiş Millətlər Təşkilatının Uşaq Hüquqları üzrə Konvensiyası)

UNESCO - *United Nations Educational, Scientific and Cultural Organization (Birləşmiş Millətlər Təşkilatının Təhsil, Elm və Mədəniyyət Təşkilatı)*

PISA - Program for International Student Assessment (Tələbə Performansının Beynəlxalq Qiymətləndirilməsi Proqramı)

TIMSS - Trends in İnternational Mathematics and Science Study (Beynəlxalq Riyaziyyat və Təbiət Elmlərinin Öyrənilməsindəki Meyilliliklər)

ADHD – Attention-deficit / Hyperactivity disorder (Diqqət çatışmazlığı / Hiperaktivlik pozğunluğu)

DAMP – Deficits in Attention, Motor and Perceptual Abilities (Diqqət, Motor və Qavrayış qabiliyyətlərinin çatışmazlığı)

Norveçdə inklüziv təhsil yaranması və müasir təhsildəki rolu.

Rolf Norveçdə inklüzivlik anlayışının son 150 ildə cəmiyyətdəki, siyasətdəki və təhsildəki dəyişikliklər nəticəsində inkişaf etdiyini vurğulayır. Nəticə etibarilə, 1997-ci ildə Norveç milli tədris proqramına "İnklüzivlik" ifadəsinin daxil edilməsi böyük müzakirələrə elə də səbəb olmadı. Bunun əvəzinə, təhsilin istiqaməti fərdi öyrənmənin daha çox vurğulanmasına və həyata

